# GƏNCLƏR ÜÇÜN ÜSULİDDİN HAQQINDA

# 50 DƏRS



AYƏTULLAHÜL-ÜZMA
NASİR MƏKARİM ŞIRAZİ

# GƏNCLƏR ÜÇÜN ÜSULİDDİN HAQQINDA ٥٠ DƏRS

:Müəllif

Ayətullah əl–üzma Nasir Məkarim Şirazi

:Çap nəşriyyat

Şəhriyar

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# GƏNCLƏR ÜÇÜN ÜSULİDDİN HAQQINDA ۵۰ DƏRS

## Kitab haqqında

Kitabın adı:Gənclər üçün üsuliddin haqqinda ۵۰ dərs

Müəllif:Ayətullahül-üzma Nasir Məkarim Şirazi

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۸

Səhifələrin sayı:۹۲

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

## I Fəsil: Allahı Tanımaq Haqqında on Dərs

### I DƏRS

#### .Allah axtarışı

?Nə üçün dünyanı yaradan haqqında fikirləşir və axtarış aparırıq

Biz insanların hamısının qəlbində (elmə məhəbbət) və varlıq aləmini tanımaq istəyi vardır

Bütün insanlar bilmək istəyirlər ki, öz kəhkaşanları ilə birgə ucsuz-bucaqsız asiman, öz gözəllikləri ilə geniş yer kürəsi, cürbəcür məxluqlar, gözəl quşlar, müxtəlif balıqlar, dənizlər, dağlar, güllər, çiçəklər, göyə ucalmış müxtəlif ağaclar və s. özü-özünə ?yaranmışdır, yoxsa bu rəsmlər mahir bir rəssamın əli ilə hazırlanmışdır

:Bundan əlavə, insanlar ücün hər şeydən əvvəl aşağıdakı üç sual irəli çıxır

?Haradan gəlmişik? Haradayıq? Hara gedəcəyik

Əgər biz bu üç suala cavab verə bilsək, görün, nə qədər xoşbəxt olarıq? Yəni, biz bu sualların cavabını tapmaqla həyatımızın haradan başlayıb, haraya gedəcəyini .biləcəyik

?Hal-hazırda bizim vəzifəmiz nədir

:Bizim axtarıcı ruhumuzbizə belə deyir

.(Bu sualların cavabını bilmək ücün gərək səbr edək.(Bir qədər gözləyək

Bəzən baş verən avtomabil qəzasında görürsən ki, bir nəfər yaralanaraq huşunu itirir. Onu müalicə etmək ücün xəstəxanaya aparırlar. Halı bir az özünə gəldikdə ətrafındakılardan soruşduğu ilk sual bu olur: «Bura haradır? Nə üçün məni bura gətirmisiniz? Nə vaxt buradan çıxacağam?» Bunlardan məlum olur ki, insan bu cür .sualların qarşısında sakit qala bilməz

.Deməli, bizi Allahı axtarıb, onu tanımağa vadar edən ilk şey öz axtarıcı ruhumuzdur

Şükr etmə duyğusu.٢

Təsəvvür edin ki, sizi gözəl bir qonaqlığa dəvət ediblər. Məclisdə qonaqlarüçün hər ey ,hazırlanmışdır. Siz bu qonaqlığa öz böyük qardaşınızın vasitəçiliyi iləgetdiyinizə görə

sözsüzki, ev sahibini yaxşı tanımırsınız və bu ürəkaçan qonaqlığa daxil olduqda sizin ilk .fikriniz ev sahibini tanıyıb, ona təşəkkür etməkdir

Biz (insanlar) də yaranışın geniş süfrəsinə baxıb müxtəlifnemətləri öz ixtiyarımızda gördükdə özümüzdən asılı olmayaraq bu qədər neməti bizə verənvarlığı tanımaq .istəyirik

Bilmək istəyirik ki, görən gözləri, eşidən qulaqları, lazımı qədərağlı və düşüncəni kim ?vermiş, paknemətləribu geniş süfrəyə kim düzmüşdür? Kim onları xəlq etmişdir

Düzdür, Onun bizimtəşəkkürümüzə heç bir ehtiyacı yoxdur. Lakin təşəkkür etməyincə özümüzdə narahatçılıq və çatışmamazlıq hiss edirik.Bunun özü insanların Allahı .axtarıb, onu tanımağı üçün bir səbəbdir

.İsanların Allahı tanıma ilə bağlı olan xeyirvə ziyanları .٣

Təsəvvür edin ki, bir səfərdərsiniz. Səfər zamanı dörd yol ayrıcına çatırsınız. Hamı deyir ki, bu dörd yol ayrıcındadayanmayın orada böyük təhlükələr vardır. Lakin birdəstə deyir: Ən yaxşı yol günçıxana tərəfgedən yoldur. Başqa bir dəstə deyir: Ən yaxşı yol günbatana tərəf gedən yoldur. Üçüncü dəstə bu iki dəstədən fərqli olaraq sizi ücüncü yolla getməyədəvət edir.Hamısı da öz göstərdiyiyolunyaxşı və salamatyol .olduğunu, səadət və xoşbəxtliyin məhz bu yolda olduğunu bildirir

Belə bir halda insan bu yollar barədə mütaliə edib axtarış aparmadanonlardan birini seçə bilərmi? Yaxud dörd yol ayrıcındadurub,yolların heç biri ilə getməmək qərarına .gələrmi? Yəqin ki, xeyr

Əksinə, ağıl və şüurbelə hökmedir ki, insan tezbu yollar barədə axtarış aparıb,deyilən sözlərin hamısına diqqət etsin. Hansı yolun düzgünolduğunubildikdə onuqəbul etsin. .Xatircəmliklə o yolu seçərək irəli getsin

Bu dünyadakı vəziyyət də eyni ilə bu cürdür. Müxtəlifəqidə, məzhəb və dinlər hər biri insanı özünədəvət edir. Bizim taleyimizin, xoşbəxtlik və bədbəxtliyimizin, irəliləyib yaxud geriləməyimizin bu yola (seçdiyimiz yola) bağlılığı olduğundan məcbur oluruq ki, bu yollar barədə diqqətlə mütaliə edək. Bizi təkamül və səadətə çatdıra bilən yolu

.seçək, bizi bədbəxtlik və fəsada tərəf yönəldən yoldan uzaq olaq

Bu məsələ də insanları dünyanın yaradanı barədə mütaliə və axtarışlar aparmağa .vadar edən səbəblərdən biridir

Qur`ani- Məcid bu barədə buyurur: «(Ya Peyğəmbər!) Mənim sözümü (öyüd- nəsihəti) .(dinləyib, onun ən gözəlinə uyan bəndələrimə (Cənnəti) müjdə ver...» (Zumər, ١٨

**.Fikirləşin və cavab verin**

Allahı tanıma barədə indiyədək ata-ananızdan (və ya başqalarından) eşitdiyinizdən.١ ?əlavə özünüz heç bu barədə ciddi fikirləşmisinizmi

?Allahı axtarmaq ilə Allahı tanımağın fərqi nədir.٢

?Allahla ünsiyyətdə olan zaman heç ruhani bir ləzzət hissi keçirmisinizmi.٣

***

## II dərs

### Allahı tanımanın insan həyatında rolu

:Allahı tanımaq insan həyatına aşağıdakı təsirləri göstərir

.I. Allahı tanıma və elmin inkişafı

Təsəvvür edin sizin, bir dostunuz səfərdən gəlib. Sizin üçün bir kitab hədiyyə gətirmişdir. Deyir ki, bu, çox gözəl bir kitabdır. Kitabın gözəlliyinin səbəbini soruşduqda deyir ki, bunun müəllifi çox diqqətli, mahir, təcrübəli, bilikli və öz ixtisasında usta bir .şəxsiyyətdir

Şübhəsiz ki, belə bir kitabı siz üzündən oxuyub keçməyəcəksiniz. Əksinə, onun bütün ifadə, cümlə, hətta kəlmələrinə diqqət edəcəksiniz. Bir cümləsini başa düşmədikdə neçə saat, bəlkə də neçə gün ona vaxt sərf edəcəksiniz. O vaxta qədər ki, o cümlənin məna və

məfhumunu başa düşəsiniz.(Bunun səbəbi nədir?). Səbəbi də budur ki, o kitabın müəllifi adi şəxs deyil. Əksinə, o müəllif böyük bir alimdir. Hər kəlməsində belə .hikmətlər vardır

Ancaq sizə desələr ki, bu kitabın üzü, cildi qəşəng olsa da, müəllifi savadsız bir bir insandır, yəqin ki, o kitabı təkcə üzündən oxuyub keçəcəksiniz. Başa düşmədiyiniz yerdə də «Bu da müəllifin savadsızlığı üzündəndir» deyəcəksiniz. İnsanın bu cür kitabın .üzərində vaxt sərf etməsi heyfdir

Bu dünya da böyük bir kitaba bənzəyir. Onda olan hər bir məxluqat bir kəlmə, yaxud bir cümlə təşkil edir.Mömin bir şəxsin nəzərində bu dünyada olan bütün məxluqatın hamısı hikmət üzündəndir. Mömin olan şəxs Allahı tanımağın sayəsində xüsusi və fövqəladə bir diqqətlə dünya məxluqatının hikmət və sirrini öyrənməyə çalışır. (Məhz bu məsələ elmin inkişafında böyük rol oynayır.) Səbəbi də budur ki, mömin şəxs bilir ki, bu məxluqatı yaradanın tükənməz elm və qüdrəti vardır. Buna görə də bu hikmət, sirr .və fəlsəfəni tapmaq üçün daha dəqiq və daha güclü mütaliələr edir, axtarışlar aparır

Materialist bir şəxs isə bu barədə heç bir mütaliə etmir. Çünki o, bunları yaradanı şüursuz təbiət bilir. Bəzi materialist alimlərin elm kəşf edənlər sırasına qoşulmasının səbəbi budur ki, onlar Allahı qəbul edir lakin bu Allahı təbiət adlandırırlar (və təbiətin Allah olduğunu iddia edirlər). Bunun səbəbi isə, materialistlərin təbiət üçün nizam-.intizam, hesab və proqram iddia etməsidir

.Qısa sözlə desək, Allahı tanımaq (və Ona pərəstiş etmək) elmin inkişafına səbəb olur

.Allahı tanıma, çalışmaq və ümid.٢

İnsan öz həyatında çətinliklərlə üzləşdikdə, qapılar hər tərəfdən onun üzünə bağlandığı zaman çətinliklərin müqabilində tənhalıq və zəiflik hiss etdikdə Allaha olan .iman onun köməyinə tələsərək ona arxa və kömək olur

Allaha imanı olan şəxslər hec vaxt özlərini tənha və zəif hiss etmir, məyus olmurlar. Çünki onlar Allahın qüdrətinin hər şeydən üstün və çətinliklərin onun əlində asan olduğunu bilirlər. Onlar Allaha, Onun lütf- mərhəmətinə, köməyinə və himayəsinə

ümid bağlamaqla çətinliklərə qarşı mübərizəyə qalxır və bütün qüvvələrindən istifadə edirlər. Ona ümid bağlamaqla çətinlikləri arxada qoyur, onlara qalib gəlirlər. Doğrudan da Allaha imanlı olmaq insanlar uçün böyük bir arxadır. Ona imanlı olmaq insanı səbrli .və dözümlü edir. Ona iman bağlamaq ümid çırağını həmişə ürəklərdə saxlayır

Məhz bu səbəbdən mömin insanlar heç vaxt özlərinə qəsd etmirlər. Özünə qəsd etməyin səbəbi yalnız məğlub, ümidsiz və məyus olmaqdır. Mömin insanlar isə, heç .vaxt məğlub və məyus olmurlar

Allahı tanıma və məsuliyyət hissi .٣

Bəzi həkimlər vardır ki, onlara kasıb və imkansız bir xəstə müraciət etdikdə müalicə üçün pul almamaqdan əlavə, onlara dərman almaq üçün öz ciblərindən pul da verirlər. Əgər xəstəlikləri bir qədər ciddi olarsa, səhərə qədər onun kasıb evində xəstənin başı üstə dururlar. Bu cür həkimlər Allaha inanan və mömin şəxslərdir. Eyni zamanda bir qism həkimlər də vardır ki, pul almamış xəstəyə yaxın durmurlar. Bunlar imansız, ya da .imanı zəif olan insanlardır

İnsanın imanı olarsa, öz işində(hər hansı bir iş olursa, olsun) məsuliyyət hiss edəcəkdir. Öz vəzifəsini yaxşı biləcəkdir. Vəzifəsini yaxşı yerinə yetirəcəkdir, öz işində güzəştə .gedəcəkdir. Öz daxilində əməllərini izləyən mənəvi bir keşikçi hiss edəcəkdir

İmansız insanlar isə xüdbin, özünüsevər və təhlükəli insanlardır. Özləri üçün hec bir məsuliyyət hiss etmirlər. Başqalarına zülm edib, onların haqqını tapdalamaq bu cür insanlar üçün cox sadədir. Belə insanlar yaxşı və xeyirxah işlər görməyə çox az razı .olurlar

.Allahı tanımaq və rahatlıq.٣

Psixoloqların araşdırmalarından məlum olur ki, ruhi xəstəliyə məruz qalma hazırki dövrdə əvvəlki vaxtlardan daha çoxdur. Bunun səbəbini belə izah edirlər ki, bu xəstəliyə

düçar olmağın səbəblərindən biri nigarançılıq hissi keçirməkdir. Gələcək hadisələrin, ölümün, müharibənin, kasıbçılığın, məğlubiyyətin və s. nigarançılığı insanı ruhi .xəstəliyə düçar edir

:Bunun müaliəcəsində isə əlavə edirlər

Bu nigarançılıq aradan qaldıran amillərdən biri də Allaha iman bağlamaqdır. Allaha .iman bağlamaq nigarançılığı dəf edir

Mehriban, ruzi verən, bəndələrinin vəziyyətindən hər zaman agah olan və bəndələri ona üz tutan zaman onlara kömək edən Allah imanlı insanları bu çətinliklərdən də .rahat və azad edir

Məhz bu səbəbdən həqiqi möminlər özlərini həmişə rahat hiss edirlər. Heç bir nigarançılıq onlara qalib gələ bilmir. Bütün işləri Allah xatirinədir. Buna görə də, bir ziyan gördükdə əvəzini Allahdan istəyirlər. Hətta müharibə meydanlarında təbəssüm :və sevinc hiss olunur. Qurani- Məcid bu barədə belə buyurur

Əlləziynə amənu və ləm yəlbisu imanəhum bizulmin ulaikə ləhumul əmn.» « İman » gətirib imanlarını zülmlə (günahla) qatışdırmayanlar əmin- amanlıqdadırlar.» (Ənam, .(٨٢

### Fikirləşin və cavab verin

?Ötüb keçmiş insanların həyatında iman və onun nişanələrini müşahidə etmisinizmi.١

Bilirsinizmi nə üçün özlərini mömin adlandıran və imandan dəm vuran, lakin mənəvi.٢ və əxlaqi pozğunluqlara düçar olan şəxslərdə imanın yuxarıda deyilən nişanəsi ?müşahidə olunmur

## III DƏRS

### İki əmin və xatircəm yolla Allahı tanıma

Allahı tanıma barədə qədim zamanlardan indiyədək müxtəlif kitablaryazılmış, alimlər .və qeyriləri arasında çoxlu bəhs və söhbətlər olmuşdur

Hər dəstə bu həqiqətə nail olmaq üçün özünə müxtəlif yol seçmişdir. Lakin bu yolların .ən yaxşısı və insanları bu həqiqətə çatdıran aşağıdakı iki yoldur

.(Daxili (batini) yol (ən yaxşı yol.١

.(Xarici yol (ən aydın yol.٢

Birinci qismdə insan öz vücudunun daxil və batininə baş vuraraq tövhid nidasını öz .daxilindən eşidir

İkinci qismdə isə insan geniş aləmi seyr edərək Allah nişanələrini bütün məxluqatda müşahidə edir. Bu iki yol barədə uzun bəhslər olmuşdur. Biz isə bu iki yolu qısa surətdə .oxucuların nəzərinə catdırırq

### Daxili (batini) yol

:Aşağıdakı məsələlərə yaxşı diqqət edin

A)Alimlər deyirlər: Təbəqə və irqindən asılı olmayaraq istədiyiniz hər hansı bir insanı nəzərinizdə tutun. Əgər onu azad və müstəqil buraxsalar və heç bir təlim keçməsələr, hətta möminlər və materilistlərin nəzəriyyəsindən də ona heç nə deməsələr, o şəxs öz- özünə təbiətdən (maddi dünyadan) üstün olan və bütün dünyaya hakim olan bir varlığa inanacaqdır. O, öz ürəyinin guşələrindən incə, məhəbbətlə dolu, eyni zamanda möhkəm bir nida (haqq nidası) hiss edəcəkdir. Həmin səs və nida onu «Allah» adlandırdığımız böyük elm və qüdrət mənbəyinə dəvət edir. Bu nida insanların pak və .fitri nidasıdır

B)Mümkündür ki, maddi dünyanın və yaşayışın zinətləri o şəxsi özünə cəlb etsin və müvvəqqəti olaraq bu nidanı eşitməkdən qafil olsun. Lakin, elə ki, təbii fəlakətlər (sel, zəlzələ, tufan, havada təyyarə ilə uçarkən havanın dəyişməsi və s.) ona üz verir, elə ki, əli hər tərəfdən üzülür və heç bir ümid yeri qalmır, o zaman həmin nida onun daxilində qüvvətlənir. Hiss edir ki, batinində bir qüdrət və varlıq onuözünədəvət edir. Bu qüdrət bütün qüdrətlərdən üstündür. Bu qüdrətin vasitəsi ilə bütün çətinliklər asan olaraq .aradan qaldıralacaqdır

Çox az insan tapılar ki, çətinliklərlə üzləşdikdə Allahı yadına salmasın. Özündən asılı olmayaraq Allah onun fikrinə gələcək. Bununla da məlum olur ki, həm o bizə, həm də .biz ona həddən artıq yaxınıq. O, bizim can və ruhumuzdadır

Düzdür, bu haqq nidası həmişə insanlarda səslənir, lakin çətinliklər zamanı daha da .qüvvətlənir

V) Tarix bizə göstərir ki, iqtidarda olan,günlərini rahatlıqla kecirən və Allahın adını dilə gətirməkdən belə imtina edənlər iqtidarları əldən gedən zaman onun ətəyindən .yapışır və haqq nidasını aydıncasına eşidirlər

Tarix bizə göstərir ki, Firon suda qərq olan zaman fəryad edərək deyir: «İndi etirafedirəm ki, Musanın (ə) allahından başqa məbud yoxdur.» ( Yunis,٩٠). İnsan həyatında böyük rol oynayanvə Fironun gəlir mənbəyinə çevrilmiş su (Nil cayı) indi onun ölüm hökmünü icra edir. Firon bu cürvəziyyətdə bir necə kiçik ləpənin əlində aciz qalıb əli hər yerdən üzülmüşdür. Bu nida onun fitrətindən səslənən bir nidadır. Təkcə Firon yox, bəlkə də bütün insanlar belə çıxılmaz vəziyyətdə bu nidanı eşidir və Allaha .pənah gətirirlər

Q)Siz özünüz nə vaxt qəlbinizə nəzər salsanız, görəcəksiniz ki, ürəyinizdə həmişə bir nur parlayır və sizi Allaha tərəf dəvət edir. Ola bilər, siz dəfələrlə çıxılmaz vəziyyətə düşmüsünüzvə əliniz hər yerdən üzülmüşdür. O vaxt mütləq sizin fikrinizə gəlib ki, bu dünyada yenilməz bir qüdrət var. Yalnız o qüdrət məni bu çətinlikdən qurtara bilər. Bu zaman siz həmin qüdrətə ümid və eşq bağlayaraq öz məyusluğunuzu yaddan çıxarmısınız. Bu yol Allahı tanımaq üçün ən yaxın olan yoldur. Bu yolun sayəsində hər .bir insan Allahı tanıya bilər

### Bir sual

Ola bilər, siz müəllifi belə bir sual qarşısında qoyasınız: Biz mühitin və ata- ananın təlim tərbiyəsindən aldığımız təsirin nəticəsində bu fikrə gəlib Allahın dərgahına üz tuturuq. Deməli, bu bizim öz daxilimizdən olan yol deyil. Bunu yuxarıda deyilənlərə necə ?uyğunlaşdıraq

Doğrudan da, sizin belə bir sual verməyə haqqınız var. Bu sualın cavabını gələn dərsdə

.(verəcəyik (inşaallah

:Quran bu barədə buyurur

«Fəiza rəkibu fil fulki dəəvullahə muxlisinə ləhuddinə fələmma nəccahum iləl- bərra iza hum yuşrikun.» Müşriklər gəmiyə mindikləri zaman (dəryada batacaqlarından qorxub, dində ixlas sahibi olan möminlər kimi) yalnız Allaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi yenə də (Ona) şərik qoşarlar.» (Ənkəbut, ۶۵).

### Fikirləşin və cavab verin

۱.Çalışın, yuxarıdakı ayənin nömrəsini, surənin adını və ayənin mənasını kəlmə-kəlmə əzbərləyin.

۲.İndiyədək sizin əlinizi hər yerdən üzən və ümidinizi təkcə Allaha bağlayan çətin bir hadisə ilə üzləşmisinizmi? (Qısa bir məzmunla yaxud şifahi surətdə onu şəhr edin).

۳.Nə üün daxili yolu ən yaxın yol adlandırmışıq?

## IV dərs

### .Mühüm bir sual–cavab

Sual

Ötən həftə dedik ki, insan öz batinində həmişə tövhid sədasını eşidir. Xüsusən, çətinliklərlə üzləşdikdə bu səda daha da artır. İnsan özündən asılı olmayaraq Allahı yadına salır. Onun tükənməz lütf və mərhəmətindən kömək istəyir.

Burada ola bilər, bir fikir qarşıya çıxsın: daxildən gələn və fitrət nidası adlanan bu səda təbliğat və təlimlər əsasında irəli gəlir. Mühit, məktəb, mədrəsə, ata və ananın təlim və tərbiyəsi sayəsində bu iş (çətinliklər zamanı Allahın dərgahına pənah aparmaq) insanlar üçün bir növ adət olmuşdur. Deməli, bu nida insanın öz batinindən səslənən nida deyil.

:Cavab

.Bu sualın cavabı kiçik bir müqəddimə ilə aydın olur

Adət və ənənələr əsli və əsası olmayan və dəyişib aradan gedən şeylərdir. Yəni, biz tarix boyu bütün bəşəriyyətin riayət etdiyi həyata bir adət tapa bilmərik. Bu gün dəb olan adət, ola bilər, sabah dəyişilsin. Buna görə dəola bilər, eyni zamanda bir millətin .adəti başqa bir millət üçün dəb olmasın

Əgər bütün bəşəriyyət hər zaman (istisna olmayaraq) bir işi icra edirsə, deməli, bu, fitri .bir işdir, heç də adət və ənənə deyildir

Məsələn, ananın öz balası ilə olan əlaqəsi və ana məhəbbəti mümkün deyil ki, kor-koranə, fanatika və adət üzündən olsun. Çünki hec bir zaman, hər hansı bir millətdən .olan ana balasına qarşı laqeydlik etməz. Əksinə onu sevər, qayğısına qalar və s

Ola bilər, bir ana ruhi narahatçılıq üzündən özünü məhv etsin, yaxud cahiliyyət dövründəki kimi bir ata səhv və yanlış təbliğat əsasında öz qızını diri-diri torpağa basdırsn. Lakin bunlar çox nadir hallarda baş verən və tez bir zamanda itib, aradan .gedən istisna hallardır

Bu müqəddiməni nəzərə almaqla indiki və keçmiş insanlar arasında Allaha pərəstiş :etmək məsələsinə nəzər salaq

(.Bu dərs bir qədər qarışıq olduğuna görə, bir qədər yaxşı diqqət edin)

Tarixçi və sosioloqların dediyinə görə, insanlar heç vaxt məzhəb və dinsiz .١ qalmamışlar. Bəşəriyyət hər zaman dinə və məzhəbə (hər hansı məzhəb olursa, olsun ) inanıb, ona iman gətirmişdir. Bunun özü sübut edir ki, Allaha pərəstiş insanların ruh və fitrətində vardır. Ona pərəstiş təlqin, adət və fanatika üzündən olsaydı, həmişəlik .və əbədi olmazdı

Əlimizdə olan dəlil və sübutlar göstərir ki, tarixəqədərki dövrdə yaşamış insanların da özlərinə məxsus məzhəbləri olmuşdur. (Tarixəqədərki dedikdə yazı və xəttin hələ ortaya çıxmadığı dövr nəzərdə tutulur. Bu o vaxtdır ki, insanlar öz tarixlərini indiki və

.(gələcək nəsillərə çatdıra bilməmişlər

Əlbəttə, bunu da bilirik ki, ibtidai dövrün insanları Allahı təbiətdən üstun bir varlıq kimi tanımadıqları üçün, onu təbii məxluqatın arasında axtarırdılar, təbii məxluqatdan özlərinə bütlər düzəldib onlara sitayiş edirdilər. Lakin insan fikir və düşüncəsinin inkişafı sayəsində haqqı (həqiqi məbudu, Allahı) taparaq bütlərdən əl çəkdi, Allahın .təbiət aləmindən üstün qüdrəti ilə tanış oldu

Böyük və tanınmış pisixoloqlardan bir qismi açıq-aşkar deyir ki, insan ruhunun dörd.۲ .əsas hissi var

A)Bilik hissi. Bu hiss insanı elmə sövq edir. İnsanın ruhu bu hiss vasitəsi ilə bilik təşnəsi olur, məcbur qalaraq elmin ardınca gedir. İstər bu elmin maddi faydası olsun, istərsə .də olmasın

B)Yaxşılıq və xeyirxahlıq hissi. Bu hiss insanın dünyada yaxşı və əxlaqi işlər görməsinə .səbəb olur

V)Gözəllik və hünər hissi. Bu hissin vasitəsi ilə şer, ədəbiyyat və hünər (öz həqiqi .mənalarında) qüvvəyə minir

Q)Məzhəb və din hissi. Bu hiss insanı Allahı tanıyıb onun fərmanlarına əməl etməyə dəvət edir. Deməli, məzhəb hissi insan ruhunun ən əsas dörd hissəsindən biridir. Yəni, heç vaxt bu hiss insandan ayrılmayıb və bundan belə də ayrılmayacaq. Gələn dərsimizdə deyəcəyik ki, materialist və müşriklərin də bir çoxu bir növ Allahın vücudunu etiraf etmişlər. Düzdür, onun adını çəkməkdən imtina edir və ona təbiət deyir, yada başqa adlar qoyurlar. Lakin həmin təbiət üçün Allahın sifətlərinə bənzər sifətlər iddia edirlər. Məsələn, onlar deyirlər ki, təbiət insanda iki böyrək yaratmışdır. Səbəbini də belə izah edirlər: Təbiət bilmişdir ki, ola bilər, bu böyrək onun işini .görməlidir

Heç bu mövzu şüursuz təbiətlə uyğun gəlirmi? Yoxsa, bu iş elm və qüdrəti sonsuz olan Allahın işidir? Baxmayaraq ki, onlar onu təbiət adlandırırlar. Bu bəhsdə dediyimizə ,əsasən belə nəticəyə gəlirik ki

;Allaha eşq və məhəbbət həmişə olub və olacaq

.Allaha iman və etiqad bəsləmək insanın ruh və canını isindirən həmişəlik bir şölədir

Allahı tanımaq üçün uzağa getmək lazım deyil. Öz batin və daxilimizə baş vuraraq ona .olan iman və etiqadı orada tapa bilərik

Qurani-Məcid bu barədə belə buyurur: «Vənəhnu əqrabu iləyhi min həblil vərid.» «Biz (insana şah damarından da yaxınıq.» (Qaf, ۱۶

### Fikirləşin və cavab verin

.Adət və fitrət üçün bir neçə misal çəkin.۱

?Nə üçün avam camaat bütpərəstliyə tərəf yönəlirdi.۲

?Nə üçün materialistlər Allahı təbiət adlandırırlar.۳

.Baş vermiş bir əhvalat

## V DƏRS

### İşarə

Ötən dərsdə dedik ki, dildə Allahı inkar edənlərin özləri də ruhən Allaha iman .bağlamışlar

Şübhəsiz, müvəffəqiyyət və qələbələr insanlarda (xüsusən çıxarı olmayan insanlarda) qürur və təkəbbür əmələ gətirir. Bu qürur insanın hər şeyi unutmasına səbəb olur. Hətta, iş o yerə çatır ki, insan öz fitrətində olanları da unudur. Lakin vəziyyət dəyişdikdə, çətinliklər insana üz verdikdə qürur pərdələri aradan qalxır, tövhid- Allaha pərəstiş nişanələri aşkar olur. Tarix bu cür nümunələrlə doludur. Aşağıdakı əhvalat bu .nümunələrdən biridir

Bir vəzir var idi. Bu vəzir çox qüdrətli idi. Heç kim onunla rəqabət apara bilmirdi. Bir gün həmin vəzir ruhani və dini alimlərin yığışdığı bir məclisə girib dedi: Siz nə vaxta qədər .«bu dünyanın bir Allahı var» deyəcəksiniz? Mən onun yoxluğuna min dəlil gətirərərəm

Alimlər bilirdilər ki, bu vəzir bürhan, məntiq, dəlil və sübut əhli deyil və heç bir haqq sözü qəbul etmir. Buna görə də onun sözü qarşısındamənalı və təhqiredici bir sükuta .daldılar

Bu hadisədən bir müddət keçdi. Bir gün vəzir müttəhim olaraq o vaxtın iqtidarı tərəfindən tutulub zindana salındı. O vaxt həmin məclisdə olan alimlərdən biri özü-özünə dedi ki, o vəzirin oyanmaq (qəflət yuxusundan oyanmaq) vaxtı gəlib çatıb. Artıq onun təkəbbür və qürur pərdələri gözünün qarşısından çəkilib və haqqı qəbul etməyə hazırdır. Əgər onun yanına gedib nəsihət versəm, mütləq ona təsir edəcək. Fürsətdən istifadə edib zindana gəldi. Onunla görüşmək icazəsi alıb zindana girdi. Gördü ki, vəzir bir otaqda tək başına gəzərək fikir edir. Qulaq asıb gördü ki, dodağının altında bir şer :zümzümə edir. Diqqətlə qulaq asdıqda gördü ki, bu məzmunda şer oxuyur

Biz hamımız şirik, lakin bayraq üstə çəkilmiş şir. Külək əsdikdə hücum etməyə» başlayırıq. Hücum etmək istəyirik, lakin külək əsmir. Qurban olaq heç vaxt gözə «.görünməyən varlığa

Yəni, biz bayrağın üstə çəkilmiş şirə bənzəyirik. (Bəzi ölkələrin bayrağı üzərində bir şir şəkli vardır. Şerdə də buna işarə olunub). Külək əsdikdə hərəkətə gəlirik və elə bil ki, hücum etməyə hazırlaşırıq. Həqiqətdə isə bizi hərəkətə gətirən küləkdir. Bizim isə öz gücümüz yoxdur. Nə qədər hərəkətə gəlmək istəsək də, külək əsməzsə, yerimizdə qalacağıq. Bizi bu qüdrətə malik edən Allah hər bir zaman bu qüdrəti bizim əlimizdən .ala bilər. Hamımızın canı ona fəda olsun

Alim baxıb gördü ki, belə bir vəziyyətdə o nəinki təkcə Allahı qəbul edib, hətta bəlkə .böyük arif və zahid şəxsə çevrilib

Lakin buna baxmayaraq, vəzirin hal-əhvalını soruşduqdan sonra ona dedi:-Yadınızdadırsa, bir gün demişdiniz, Allahın olmamasına min bir dəlil və sübut .gətirərəm

İndi mən gəlmişəm, sənin min dəlil və sübutunu bir sübutla rədd edim. Allah həmin varlıqdır ki, sənin o əzəmətli qüdrətini asanlıqla əlindən aldı. Vəzir utanaraq başını aşağı saldı, heç bir cavab vermədi. Çünki öz səhvini anlamışdı. Artıq öz batinində Allah .və iman nuru hiss edirdi

Quran (bu barədə) Firon haqqında belə buyurur: «Firon batacağı anda: «İsrail .(oğullarının inandıqlarından başqa tanrı olmadığına iman gətirdim» dedi» (Yunus, ٩٠

### Fikirləşin və cavab verin

.Baş vermiş bu əhvalatın nəticəsini bir neçə sətirdə izah edin.١

?Nə üçün Bəni -İsraili Bəni- İsrail adlandırırlar.٢

?Firon kim olub, harda yaşamış və nə iddia etmişdir.٣

## VI DƏRS

### Allahı tanımanın ikinci yolu

Xaricdən olan yol

(Zahiri yol)

Yaşadığımız dünyaya bir balaca nəzər saldıqda görürük ki, bu dünya qarışıq və proqramsız qurulmayıb. Əksinə, bu dünyada olan bütün məxluqatın hamısı müəyyən bir proqram əsasında dövr edirlər. Dünyadakı canlı varlıqlar böyük bir orduya bənzəyir. Bu ordu müxtəlif hissələrə bölünmüşdür və hər hissə məqsədyönlü hərəkət .edir

:Aşağıdakı məsələlər bu barədə olan bütün şübhələri aradan qaldıra bilər

Bir şeyin vücuda gəlib sağ-salamat qalması üçün şərait vəbir sıra qanunlar əl-ələ.١ verməlidirlər. Məsələn, bir ağacın əkilib boya başa çatması üçün torpaq, su, münasib hava və müəyyən dərəcə hərarət, istilik lazımdır. Bu şərait yarandıqda torpağa basdırılmış toxum cücərib inkişaf edir. Beləliklə də bir ağac əmələ gəlir. Yuxarıda sadalanan şərtlər olmadan ağacın cücərməsi qeyri-mümkündür. Bu şərtlərin bir yerdə

.olması üçün isə, ağıl, elm və biliyə ehtiyac vardır

Hər bir varlığın bir sıra özünəməxsus keyfiyyətləri vardır. Məsələn, su və odun hər .٢ birininözünəməxsus (suyun rütubət, odun isə hərarət) xüsusiyyətləri vardır. Bu .xüsusiyətlər həmişə onlarla bir yerdədir və hər biri sabit bir qanun əsasında dövr edir

Dünyaya bir az diqqətlə baxdıqda məlum olur ki, bir məxluqun öz bədən üzvləri ilə .۴ əlaqəsindən əlavə müxtəlif məxluqların da biri-biri ilə sıx əlaqələri vardır. Məsələn, canlıların yaşaması üçün günəş işıq saçmalı, yağış yağmalı, külək əsməlidir. Bu işdə yer və yer mənbələrinin də böyük rolu vardır. Bunların hamısı dünyada müəyyən bir .nizam-intizamın dövr etdiyini göstərir

.Nizamla ağlın əlaqəsi

Nizam-intizam olan yerdə ağıl, düşüncə, hədəf və plan işlədilməsi həqiqətini hamı öz vicdanı qarşısında etiraf edir. Çünki harada nizam-intizam varsa, orada elm və qüdrət .mənbəyi də var. Bu məsələnin doğruluğu aşkardır və, sübuta ehtiyacı yoxdur

İnsan bilir ki, gözü görməyən (istisnalardan başqa) və savadsız bir insan makinada kiçik bir məqalə də yaza bilməz. Eləcə də iki yaşlı uşaq (istisnalardan başqa) qələmi ağ .kağız üstə o yan-bu yana fırladaraq gözəl bir rəsm çəkə bilməz

Gözəl bir inşa və ya məqalə, yaxud muzeydə gözəl bir tablo, rəsm əsəri gördükdə dərhal bilirik ki, onu savadlı, istedadlı bir şəxs və ya mahir bir rəssam yazmış, yaxud .çəkmişdir. Hətta onu yazanı, yaxud çəkəni görməsək də, bu cür deyəcəyik

Deməli, harada nizam-intizam əsasında olan bir quruluş varsa, mütləq orada ağıl vədüşüncə də var. Bu nizam-intizam nə qədər gözəl, aydın, dəqiq, olarsa, onda .istifadə olunmuş ağıl və elm də buna uyğun olacaqdır

Bəzən hər nizam-intizamlı quruluşun mənbəyinin ağıl və elm olması məsələsini isbat etmək üçün ali riyaziyyatda işlədilən «ehtimallar hesabı» mövzusundan istifadə edirlər. Bu yolla edirlər ki, məsələn, savadsız bir insan makinanın düymələrini (necə gəldi) basmaqla təsadüfən bir məqaləni yazmaq üçün ehtimallar hesabına əsasən milyardlarla il sərf etməlidir. Lakin heç yer kürəsinin ömrü də buna kifayət etməz. Qurani-Məcid Allahı zahiri yolla tanımaq barədə buyurur: «Quranın haqq olduğu müşriklərəbəlli olsun deyə, biz öz qüdrət nişanələrimizi həm xarici aləmdə (kainatda, göylərin və yerin ətrafında), həm də onların öz daxilində mütləq göstərəcəyik. (Ya peyğəmbər!) Məgər Rəbinin hər şeyə şahid olması (sənin dediklərinin doğru olmasına) .(kifayət deyilmi? (Fussilət, ٥٣

### Fikirləşin və cavab verin

Yaradılmış varlıqlara baxaraq onun alim və agah tərəfindən xəlq olunduğuna yəqin .١ (.etdiyimiz şeylər barədə bir neçə dəlil gətirin (dərsdə deyilənlərdən əlavə

Afaq (xaric) və ənfus (daxil) arasında nə fərq var? Allahın xarici və daxili . ٢ .nişanələrindən bir neçə nümunə gətirin

## VII DƏRS

### Yaranışda olan nizam–intizamdan nümunələr

Dünyada olan nizam-intizam, hədəf, məqsəd və proqram hamıya aşkardır. İndi isə .bunlardan bir neçə nümunəni sizlərə təqdim edirik

Bu kitabda dünyadakı nizam-intizam barədə çəkilmiş bir neçə kiçik və böyük .nümunəni oxucuların nəzərinə çatdıracağıq

Xoşbəxtlikdən, bu gün təbiət elmlərinin inkişafı sayəsində və təbiət incəliklərinin, eləcə də insanın, heyvanın, bitkilərin, kəhkaşanlar aləminin, hətta, kiçik bir hüceyrənin sirlərinin kəşf olunması ilə Allahı tanıma qapıları insanların üzünə açılmışdır. Hətta iş o

yerə çatmışdır ki, təbiət elmlərinə dair yazılmış kitabları «tövhid» və «Allahı tanıma kitabları» adlandırmaq olar. Bu kitablar insanlara Allahın qüdrətinin əzəmət və böyüklüyünü çatdırır. Çünki bu kitablar dünya varlıqlarının nizamına olan baxışdakı pərdəni aradan götürür. Bu kitablar dünyanı yaradan Allahın nə qədər alim və qadir .olduğunu çatdırır

### İnsan bədəninə başçılıq edən üzv

İnsan kəlləsinin içində rəngi kül rənginə bənzər, «beyin» adlanan bir üzv var. Beyin insan bədənin ən mühüm və incə üzvüdür. Çünki o, bütün qüvvə və hissiyatla başçılıq .edir. İnsanın bütün iradə və istəyi ondan asılıdır

Beynin əhəmiyyətli, incə və zərif üzv olması barədə baş vermiş əhvalatı sizin .nəzərinizə catdırırıq

İranda nəşr olunan jurnalların birində yazımışdır): Şirazlı cavan bir tələbə Xuzistanda) avtomobil qəzasına uğrayır. Avtomobil qəzasında onun beyni zədələnir. Lakin bədəninin zahirində heç bir nöqsan, zədə yox idi. Bütün bədən üzvləri salamat idi. Təəccüblü burasıdır ki, o, bütün keçmişini unutmuşdu. Fikri, düşüncəsi yaxşı idi, bütün deyilənləri anlayırdı. Lakin öz ata-anasını görsəydi, tanımazdı. Anasını ona göstərib «bu sənin anandır» dedikdə təəccüb edirdi. Onu Şirazdakı evlərinə gətirdilər. Divarda asılmış öz çəkdiyi rəsmləri ona göstərdikdə təəccüblənərək «mən bunları birinci .dəfədir, görürəm» deyirdi

Həkimlər onu müayinədən keçirdikdə məlum oldu ki, onun beynindən aldığı zədə nəticəsində fikirlə yaddaş və hafizə mənbəyini birləşdirən kiçik bir damar qırılmışdır. Elə bil ki, işıq sayğacının düyməsini basmaqla bütün işıqlar keçir və hər yer zülmətə qərq olur. Kiçik bir damarın qırılması da gənc tələbənin kecmişini zülmətlərə aparmışdır. Ola bilər ki, o qırılan hissənin bir iynə ucu qədər həcmi olsun. Lakin onun gənc tələbənin həyatında

buraxdığı təsir həddən artıq böyükdür. Bundan məlum olur ki, insanın beyni nə qədər .qarışıq, incə, zərif və əhəmiyyətli bir üzvdür

:Beyin və sinir sistemi iki əsas hissədən təşkil olunmuşdur

İnsanın özündən asılı olan sinir sistemi: insanın öz ixtiyarı ilə gördüyü yolu getmək,(١ .baxmaq, danışmaq və s.kimi işlərin mənbəyidir

İnsanın özündən asılı olmayan sinir sistemi: Bu hissə insanın ürək döyüntüləri, mədə(٢ .və bu kimi işlərə başçılıq edir

Beynin bu hissəsinin bir azının işdən düşməsi ürəyin, yaxud digər üzvün dayanmasına .kifayət edər

.Beynin heyrət doğuran hissələrindən biri

Ağıl huş, iradə, şüur, düşüncə və hafizənin mərkəzi olan hissədir. Qısa sözlə desək, bu hissə (ağıl) beynin ən əsas hissələrindən biridir. Qəzəb, hirs, əsəb, qorxu kimi ruhi müqavimətlərin hamısı ona aiddir. Əgər hər hansı bir canlıda cərahiyyə əməliyyatı aparıb, digər bədən üzvlərini sağlam saxlamaq şərti ilə bu hissəni götürsələr, həmin .canlı sağ qalar. Lakin o, bütün ağıl və düşüncəsini itirmiş olacaq

Bir göyərçindən bu hissəni götürmüşdülər. Bir qədər sağ yaşadı. Yaşadığı bu müddətdə onun qabağına dən tökürdülər. Ac olmasına baxmayaraq, o, dəni yemirdi. Onu uçuranda bir maneəyə toxunub yerə düşməyincə havada olardı.(Şüuru .(olmadığından, dən yeməz, havaya qalxdıqda yerə enməzdi

.Beynin digər təəccüblü hissəsi hafizədir

İndiyədək hafizənin necə heyrət doğurucu və maraqlı olması barədə fikirləşmisinizmi? ?Əgər insanın hafizəsi bir saatlıq əlindən alınarsa, o, necə qəmli aqibətə düçar olar

İnsan beyninin kiçik bir hissəsini təşkil edən hafizə qüvvəsi (hafizə mərkəzi) insanın bütün həyatını bütün xüsusiyətləri ilə birgə yığıb saxlamışdır. O, bizimlə əlaqədə olan insanların bütün xüsusiyyətlərini-boyunu, rəngini, paltarını, əxlaqını və s. yadında saxlamağa malikdir. Onların hər biri üçün xüsusi hesab açmışdır. Məhs bu səbəbdən

bir dəfə gördüyümüz şəxsi ikinci dəfə gördükdə hafizə dərhal özündə yığılmış saysız-hesabsız insan xüsusiyyətləri arasından həmin şəxsin xusisiyyətlərini zehnimizə gətirir. Bununla da biz həmin şəxsi tanıyır, onunla lazım olan rəftarı edirik. Əgər dostdursa, hörmət, ehtiram göstəririk, yox, əgər düşməndirsə, ona nifrət edirik. (Lazım gələrsə, digər münasibətlər də göstəririk.) Bu işlər hamısı yalnız bircə anda (bir .az tez, ya gec) baş verir

Hafizənin təəccüblü və heyrətverici olduğunu o zaman anlaya bilərik ki, zehnimizdə olan bütün şeyləri vərəq, dəftər, yaxud kaset üzərinə yazmaq fikrinə düşək. Əgər bu işi həyata keçirmək istəsək, şübhəsiz ki, həddən artıq dəftər, yaxud kaset lazım olacaqdır. Bundan da təəccüblüsü odur ki, kaset və ya dəftərlərin arasından bir hadisəni axtarıb tapmaq istəsək, uzun bir müddət çəkəcək. Lakin hafizə və zehn bu işi .asanlıqla, tez bir anda həyata keçirir

?Şüursuz təbiət necə şüur və düşüncə yarada bilər

İnsanın beyni barədə bir çox kitablar yazılmışdır. Bu kitablardan bir qismi orta və ali məktəblərdə də tədris olunur. Həddən artıq incə, dəqiq, qarışıq və sirli olan bu üzvün ?şüursuz təbiət tərəfindən yaradıldığını qəbul etmək olarmı

Çox təəccüblüdür, ağılsız və düşüncəsiz təbiət necə ağıl və düşüncə xəlq edə bilər? (Necə ki, materilistlər deyirlər. Şübhəsiz ki, bu səhv, batil bir əqidədir. Axı necə ola bilər (?ki, öz ağılı olmayan təbiət başqaları üçün ağıl yaratsın

İnsanın öz vücudunda olan Allah nişanələri barədə Quran buyurur: «Sizin özünüzdə də .((sizi yaradanın birliyini sübut edən) əlamət və nişanələr vardır.» (Zariyat, ٢١

:Fikirləşin və cavab verin

?İnsanın beyni barədə başqa maraqlı əhvalatlar bilirsinizmi.١

Allah müxtəlif hadisələr nəticəsində insanın beyninin sağlam qalması üçün hansı.٢ ?tədbirləri görmüşdür

## VIII DƏRS

### Kiçik bir quşda bir dünya təəccüb

Bu dərsdə artıq insan haqqında söhbəti kənara qoyub aləmin digər varlıqlarında olan .nizama baş çəkirik

Zülmət qaranlıqda asimana nəzər salsaq, uçan bir quş görərik. Bu quş gecə olmasına baxmayaraq, bütün qüvvəsi ilə öz yeməyini əldə etmək üçün havada pərvaz edir. Bu quşun adı yarasa, yaxud gecə quşudur. Bu quşun hər işi təəccüblüdür. Amma gecə .qaranlıqda uçması daha təəccüblüdür

Yarasanın gecə zamanı heç bir maneəyə toxunmadan sürətlə uçması o qədər təəccüblüdür ki, onun haqqında nə qədər mütaliələr olunsa, digər kəşf olunmamış .sirləri də kəşf olunar

Bu quşun gecə zamanı uçması ilə göy səmada qanad çalan və iti uçan göyərçinin uçması arasında heç bir fərq yoxdur. Əlbəttə, əgər onun qarşısında olan manelərdən .xəbəri olmasaydı, yəqin ki, yavaş-yavaş uçardı

Əgər yarasanı uzun, ensiz, döngəsi çox və içərisi qara tüstü ilə dolu olan bir tuneldən uçurtsaq, heç bir maneyə toxunmadan və qanadlarının üstündə qara tüstüdən əsər-əlamət qalmayan bir halda qırağa çıxacaqdır. O, bu işlərini hamısını ötürücü siqnal .vasitəsi ilə görür

Yarasanın ötürücü siqnala malik olduğunu başa düşmək üçün, gərək, ötürücü siqnalın .nə olduğunu bilək

Fizikada «tələffüzün səsi» bəhsi «səsin ardınca gedən siqnal və dalğalar» haqqındadır. Bu dalğaların uzunluğu o qədər coxdur ki, insan onu eşitməyə qadir deyil. Buna görə də bu dalğaları «səsin ardı» adlandırmışlar. Bu dalğaları güclü bir ötürücünün vasitəsi ilə irəli göndərdikdə irəli yayılırlar. Fəzada bir maneə ilə rastlaşdıqda divara dəyib arxaya

qayıdan top kimi geri qayıdırlar. Bu, insanın bir dağ, yaxud uca divar qarşısında qışqırığına bənzəyir. Dalğaların qayıtma zamanını nəzərə almaqla həmin maneəyə nə .qədər məsafə qaldığını bilmək olar

Bir çox təyyarə və gəmilər bu cür hərəkət edirlər. İstədikləri yerə gedirlər. Düşmən .təyyarə və gəmisini tapmaq üçün də bundan istifadə edirlər

Alimlərin dediyinə görə, yarasada ötürücü siqnal və dalğa var. Əgər yarasanı bir otağa salıb uçurtsalar və həmin otağa dalğaların ardınca olan səsi eşidilən səsə cevirən mikrofon qoysalar, yarasanın səsindən insanın qulaqları cingildəyər. Hər saniyədə .yarasadan ۳۰-dan ۶۰-a qədər belə səs eşidiləcək

Burada belə bir sual irəli çıxır: bu dalğa və siqnal yarasanın hansı üzvü ilə səslənir? ?Yəni, onun ötürücü üzvü hansıdır, qəbuledici üzvü hansı

Alimlər bu suala belə cavab verirlər: bu dalğalar yarasanın boğazındakı güclü səs telləri vasitəsilə yaranır və burun dəliklərindən çıxaraq irəli hərəkət edirlər. Qulaqlar .da geri qayıdan dalğaları qəbul edirlər

.Deməli, yarasanın gecə zamanı uçmasında ən böyük rolu onun qulaqları oynayır

Rus alimi Yurin aparığı təcrübələr nəticəsində müəyyən etmişdir ki, əgər yarasanın qulaqları kəsilsə, artıq o, heç bir maneəyə toxunmadan uça bilməyəcək. Lakin onun gözünü çıxarsalar, o, öz hərəkətindən qalmayacaq. Bir sözlə, yarasa gözü ilə yox, .qulağı ilə görür. Bu da çox təəccüblü və maraqlı bir məsələdir

İndi fikirləşin, görün, bu iki aparatı (ötürücü və qəbuledici aparata) kim yarasanın kiçik bədənində xəlq etmişdir? Bu aparatlardan istifadə etməyi kim ona öyrətmişdir? Yarasa bu təlimin sayəsində gecə zamanı yolunun üstündə olan bütün maneələrdən ?qorunmuş olur. Doğrudan, kim bunları ona təlim vermişdir

Əmirəl-möminin Həzrət Əli (ə) Nəhcül-bəlağədə yarasanın xilqət və yaranışı barədə söylədiyi geniş bir xütbədə buyurur: «Hec vaxt gecənin zülmətinə görə öz hərəkət və yolundan qalmır... Hər şeyi qabaqcadan nümunəsi olmadan yaradan Allah pakdır.» (.(Nəhcül-bəlağə, ١۵۵-ci xütbə

**:Fikirləşin və cavab verin**

?Yarasanın yaranışı barədə başqa maraqlı məlumat bilirsinizmi.١

Yarasanın qanadlarının, yumurta qoymasının (doğmasının) və yatmasının başqa .٢ ?quşlardan fərqli olduğunu bilirsinizmi

## IX DƏRS

### Həşaratlarla güllərin dostluğu

Bahar zamanı hava yavaş-yavaş istiləşdikdə bağlara, yaşıl tarlalara nəzər salsanız, çoxlu həşərat dəstələri,bal arıları, kəpənəklər, milçəklər və digər həşaratlar görəcəksiniz. Bu həşaratlar səssiz-sədasız hər tərəfə uçuşurlar. Bu güldən o birisinə , o birisindən bir başqasına və s. üzərinə qonurlar. Bir budaqdan başqa bir budağa .uçurlar

O qədər çalışırlar ki, elə bil bir başçı onların başının üstünü alıb işləməyə məcbur edir. Onların sarı rəngli gülə bənzər, toza bulaşmış qanad və ayaqları onları iş paltarı geyib .calışqanlıqla işlə məşğul olan işçilərə bənzədir

Doğrudan da bu həşaratlar mühüm bir iş ardıncadırlar. Bu, o qədər əhəmiyyətlidir ki, professor Relion Berten bu barədə deyir: «Həşaratsız bizim meyvə səbətlərimizin boş «.qalacağını çox az insan bilir

Biz isə onun sözlərinə bunu da əlavə edirik: «Bizim bağ-bağcalarımız bu cür vəziyyətdə get-gedə öz xürrəm və abadlığını itirəcəkdir.» Deməli, həşaratlar həqiqətdə meyvə və .gül dənələrini yetişdirənlərdir

?Yəqin ki, soruşacaqsınız nə üçün

Ona görə ki, bitkilərin həyatının ən əsas hissəsi olan tozlanma həşaratların köməyi və vasitəsi ilə həyata keçir. Yəqin ki, bitkilərin də heyvanlar kimi erkək və dişi olduqlarını bilirsiniz. Btikilər arasında (erkək bitki ilə dişi bitki arasında) tozlanma əməliyyatı .getməyincə toxum və dən, daha sonra isə meyvə əmələ gəlməyəcəkdir

İndiyədək bu barədə fikirləşmisinizmi ki, heç bir hissiyat və hərəkətə qadir olmayan bitkilər necə bir-biri ilə əlaqədə olurlar? Erkək bitkinin toxumları dişi bitkinin toxumları ?ilə necə birləşir

Bu iş cox vaxt həşaratların öhdəsində olur. Bəzən isə küləyin köməyi ilə bu iş həyata .keçir

Lakin bu iş biz fikirləşdiyimiz kimi sadə deyil. Bu tozlanmanın gözəl və maraqlı bir tarixi .vardır. Onun bir hissəsini aşağıda qeyd edirik

**İki qədim və səmimi dost**

Təbiətşünasların mütaliələri, araşdırmaları nəticəsində məlum olub ki, bitkilər yeri tanımağın ikinci dövrəsinin ikinci hissəsində əmələ gəliblər. Təəccüblü budur ki, elə həmin dövrdə həşaratlar da peyda olmuşlar. Bu iki məxluq (həşarat və bitki) bütün həyat boyu bir-biri ilə səmimi və vəfalı dost olmuş və bir-birinin həyatda qalmasına .qalmasına səbəb olmuşlar

Bitkilər öz dostlarının məhəbbət və ürəyini ələ almaq ücün özlərində şirə cəmləyirlər. Həşaratlar erkək bitkinin toxumunu dişi bitkinin üzərinə aparıb səpələdikdə həmin şirəni yeyirlər. Bu şirə həşaratlara o qədər ləzzət verir ki, özlərindən asılı olmayaraq .bitkilərə tərəf hücum edirlər

Botaniklərdən bir qismi bu fikirdədirlər ki, gül və bitkilərin rəng və ətri də həşaratları özlərinə cəlb etməkdə böyük rol oynayır. Bal arıları üzərində aparılmış təcrübələr nəticəsində məlum olmuşdur ki, onlar rəngləri tanıyır, ətir və iyi bir-birindən seçə .bilirlər

Əslində, özlərini həşaratlar üçün bəzəyən və ətirləndirən güllərdir. Bu güllər xüsusən zövqlü kəpənək və bal arılarını özlərinə cəlb edirlər. Həşaratlar da güllərin bu dəvətini böyük məmuniyyətlə qəbul edir və tozlanma əməliyyatının başlancığını qoyurlar- güllərin üzərində olan şirəni yeyirlər. Bu şirə həşaratların ən gözəl yeməyi hesab olunur. Bu şirələr bir-birinin üstünə yığılaraq bal əmələ gətirir. Çünki həşaratlar (xüsusən bal arısı) bu şirənin üstünə qonduqda onun az miqdarını yeyir, çox hissəsini isə özləri ilə yuvalarına aparırlar. Uzun sabiqəyə malik olan və iki tərəfin təlabatını .ödəyən bu dosluq bitkilərlə həşaratlar arasında həmişə olub və olacaq

### Tövhid dərsi

İnsan bitkilərlə həşaratlar arasında olan dosluq barədə mütaliə etdikdə insanın özündən asılı olmayaraq belə bir sual irəli cıxır: Bitkilərlə həşaratlar arasında bu dosluq ?əlaqəsini kim yaratmışdır

?Həşaratları özlərinə tərəf cəlb edən şirə, rəng və ətri güllərdə kim xəlq etmişdir

Hansı varlıq kəpənəklərə, bal arılarına və digər həşaratlara belə incə qanad, ayaq və ?bədən vermişdir

?Hansı varlıq onlara tozlanma əməliyyatında bitkilərə kömək etməyi öyrətmişdir

?Nə üçün bal arıları bir müddət yalnız müəyyən bir gülün üzərinə qonurlar

?Nə üçün həşəratlarla bitkilərin həyat tarixi bir dövrdə başlaiışdır

?Bu işlərin proqramsız həyata keçdiyini kim qəbul edər

?Təbiətin şüursuz qanunları özü-özünə bu cür gözəl mənzərələri yarada bilərmi

.Bu iş əsla ola bilməz

Quran bu barədə buyurur: «Rəbbin bal arısına belə vəhy (təlqin etdi:) Dalğalarda, ağaclarda və insanların qurduğu yerlərdə (evlərin damında, üzümlüklərdə) özünə yuva tik. Sonra bütün meyvələrdən ye və Rəbbinin sənə göstərdiyi yolla rahat, asanlıqla (.get.» (Nəhl, ۶۸,۶۹

**Fikirləşin və cavab verin**

?Güllərin şirəsinin, rənginin və iyinin nə kimi faydası vardır.١

?Bal arılarının maraqlı həyatı barədə nə bilirsinz.٢

## X dərs

### Həddən artıq kiçik məxluqatlar dünyasında

Biz bu dünyanın maraqlı və möcüzəli məxluqatı arasında yaşadığımız üçün bunlara .adət etmişik

:Misal üçün

Bizim ətrafımızda həddən artıq kiçik heyvan və həşaratlar yaşayırlar ki, bunların(١ bəzilərinin həcmi ola bilsin ki, bir-iki millimetrdən artıq deyil. Bununla belə, onların da böyük heyvanlar (hətta insanlar) kimi əli, ayağı, başı, gözü, qulağı, hətta beyni və sinir .sistemləri vardır

Əgər bir qarışqanın beynini mikroskop altına qoyub baxsaq, onun təəccüblü və maraqlı olduğunu görərik. Qarışqanın bədəninə başçılıq edən müxtəlif hissələr onun beynində bir-birinin yanında düzülmüşlər. Bu hissələrdən birinin fəaliyyətdən düşməsi .qarışqanın bədəninin bir hissəsinin işdən düşməsinə səbəb olacaqdır

Təəccüblü budur ki, qarışqanın iynə ucu boyda (bəlkə də kiçik) olan başında bir aləm zövq, mədəniyyət, hünər, huş və s. vardır. Belə ki, bir çox alim ömrünün çoxunu bu heyvanın üzərində gedən təcrübələrə həsr etmiş və qarışqaya aid olan digər maraqlı .məsələləri öz kitablarında yazıb gələcək nəsillərə çatdırmışdır

Bu heyvanda bu qədər zövqü, huşu və s. xəlq edən varlıq heç bir zövq və huşa malik ?olmayan təbiət ola bilərmi

.Atomların sirli dünyası(٢

Bildiyiniz kimi dünyada indiyədək kəşf olunmuş ən kiçik varlıq atom və onun təşkil olunduğu hissələridir. Atom o qədər kicikdir ki, ən böyük mikroskoplar (samanı dağ .boyda göstərən mikroskoplar) da onu görməkdə acizdirlər

Atomun nə qədər kiçik olduğunu öyrənmək üçün bunu bilmək kifayət edər ki, suyun bir damcısında dünyanın bütün adamlarının sayı qədər atom var. Bir santimetr uzunluğunda nazik bir simin (məftilin) içində olan protonları saymaq istəsək və bu işdə min nəfər insan da bizə kömək etsə, hər saniyədə protonların birini ayırsaq, gecələri sübhə kimi qalmaq şərti ilə ٣٠ ildən ٣٠٠ ilə qədər (atomların müxtəlifliyinə görə) vaxt .lazımdır ki, onların hamısını sayıb qurtaraq

Bir santimetr simin içində bu qədər atomun olduğunu bildikdə, görün bütün dünyada (yer, göy, su hava və s.) nə qədər atom vardır? Bəşəriyyətin fikri onları saymaqdan yorulmazmı? (Əlbəttə, hamısını saymaq qeyri-mümkündür). Onların sayını yalnız onları .və bütün dünyanı yaradan Allah bilir

Atomlar tövhid dərsi öyrədirlər

Atom tanıma bu günkü zamanda olan elmlərin ən əsas və ən maraqlılarndan biridir. Bu kiçik varlıq bizlərə tövhid dərsi öyrədir. Çünki atom dünyasında dörd şey diqqəti daha :çox cəlb edir

Fövqəladə bir quruluş(١

İndiyə qədər elektronlarının sayı tədricən birdən başlayan və yüzdən yuxarıda qurtaran yüzdən çox ünsür kəşf olunmuşdur. Bu təəccüblü quruluşun şüursuz bir .varlıq tərəfindən yaradılması ağla-sığmazdır

Qüvvələrin bərabərliyi(٢

Bilirik ki, iki əksqütblü elektrik qüvvəsi (mənfi və müsbət) bir-birini cəzb edir. Buna əsasən, gərək, mənfi elektriki olan elektronlar və müsbət elektriki olan elektronlar bir-.birini cəzb etsin

Başqa bir tərəfdən də bilirik ki, elektronların öz mərkəzləri ətrafında hərəkəti dəfetmə

qüvvəsi yaradır. Buna əsasən, dəfetmə qüvvəsi elektronları atom mühitindən uzaqlaşdırmaq istəyir. Cazibə qüvvəsi isə elektronları cəzb edib atomları məhv etmək .istəyir

Burada gərək diqqət edək və görək ki, necə də dəqiq hesablama sayəsində cazibə və dəfetmə qüvvəsi atomlarda quraşdırılıb. Elektronlar nə qaça bilir, nə də cəzb oluna bilirlər və həmişə bərabər səviyyədə hərəkətdədirlər. Belə bir quruluşu və bərabərliyi ?kor-koranə bir təbiət yarada bilərmi

Hər biri öz xəttində(۳

Dedik ki, atomlardan bəzilərinin çoxlu elektronları vardır. Lakin bu elektronların hamısı bir xətt üzrə hərəkət etmir. Əksinə, onların hər birininn özünə məxsus müəyyən bir hərəkət xətti vardır. Milyon illərlə bu elektronlar bir-biri ilə toqquşmadan, sürətlə öz .xəttləri üzrə hərəkət edirlər

?Onların hərəsini öz xəttində yerləşdirmək və nizamla hərəkətə gətirmək sadə işdirmi

Atomun əzəmətli qüvvəsi(۴

.Atomun əzəmətli qüvvəsini bilmək ücün təkcə aşağıdakı məsələni bilmək kifayət edər

ci ildə Meksikanın quraq səhralarının birində atom bombası təcrübəsi aparıldı. Çox-۱۹۴۵ kiçik bir atom bombasını poladdan hazırlanmış bir binanın üstünə atdılar. Partlayış nəticəsində bina əriyib suya dönmüş, daha daha sonra isə buxara çevrilmiş, partlayış zamanı dəhşətli bir alov və səs (partlayış səsi) çıxmışdı. Alimlər oraya gəldikdə qaladan .hec bir əsər-əlamət görmədilər

Həmin ildə amerikalılar tərəfindən Yaponiyanın Xirosima (۶ avqust ۱۹۴۵) və Naqasaki (۹ avqust ۱۹۴۵) şəhərlərinə kiçik atom bombası atıldı. Xirosimada ۳۰-۴۰ min nəfər ölmüş, həmin miqdarda insan yaralanmış və radioaktiv şüalanmaya məruz qalmışdı. Naqasikidə isə

min nəfər ölmüş və ٧٠ min nəfər yaralanmışdır. Buna görə də Yaponiya Amerikaya ٧٠ .təslim olmaq (boyun əymək) məcburiyyətində qalmışdır

Mütərcimdən: Atom bombası, nüvəsinin parçalanma reaksiyası nəticəsində nüvədaxili enerjinin (atom enerjisinin) bir hissəsinin ayrılması hesabına çox qüvvətli partlayış yaradan aviasiya bombasıdır. İlk atom bombası ikinci dünya müharibəsinin sonunda ABŞ-da hazırlanmışdır. Atom bombası havada (istənilən hündürlükdə, yer səthində və .su altında, lazımi dərinlikdə ) partladıla bilər

ci ilin iyulunda ABŞ atom bombasını sınaqdan çıxardıqdan sonra Yaponiyanın-١٩۴۵ Xirosima (۶ avqust) şəhərlərinə partlayış gücü ٢٠ min «T» trotil partlayışına ekvivalent olan ٢ bomba atmışdır. (Yaponiyada olan tələfatın sayında kitabdadeyilənlə buradakı miqdarda fərq vardır). Xirosomada ٢٠٠ minə yaxın adam ölmüş və itkin düşmüş, ١۶٠ minə yaxın adam yaralanmış və radioaktiv şüalanmaya məruz qalmışdır. Naqasikidə isə ٧٣ mindən adam ölmüş və itkin düşmüş, sonralar şüa xəstəliyindən və .(yaralanmadan daha ٣۵ min adam ölmüşdür. (Azərbaycan Sovet Ensiklopediyası

Təkcə bir atom haqqında mütaliə etmək insanın Allahı tanımağına kifayət etməzmi? Belə nəticəyə gəlmək olar ki, Allahın varlığına dünyada olan atomların sayı qədər sübut vardır. Qurani Məcid bu barədə buyurur: «Əgər yerdəki bütün ağaclar qələm, dərya isə mürəkkəb olsaydı və yeddi dərya belə ona qoşulsaydı, yenə də Allahın .(sözləri (yazılıb) tükənməzdi.» (Loğman, ٢٧

### Fikirləşin və cavab verin

?Qarışqaların maraqlı və sirli həyatı barəsində başqa maraqlı əhvalatlar bilirsinizmi.١

?Bir atom quruluşunu lövhədə çəkə bilərsinizmi.٢

## X dərsin davamı

### Allahın sifətləri

Bilin ki, Allahı tapmaq, yəni Allahın vücudunu dərk etmək dünyadakı məxluqat barədə mütaliə etmək yolu ilə çox asandır, lakin Allahın sifətlərini tanıyıb bilmək üçün çox .diqqət etmək lazımdır

«?Yəqin ki, soruşacaqsınız: «Nə üçün

Sualın cavabı çox asandır. Çünki Allahın heç nəyi bizə, bizim gördüklərimiz və eşitdiklərimizə bənzəmir. Deməli, Allahın sifətlərini tanımağın ilk şərti onun sifətlərini məxluqatın sifətlərinə bənzətməməkdir. Yəni, onu heç bir təbii məxluqa oxşatmaq düzgün deyil. Burada iş bir az çətinləşir (və Allahın sifətlərini tanımaq çox diqqət və araşdırma tələb edir). Çünki biz təbiətin qoynunda böyüyüb başa çatmış və bütün əlaqəmiz təbiətlə olmuşdur. Həmişə təbiətlə ünsiyyətdə olduğumuz üçün hər şeyi təbiətlə müqayisə etməyə öyrənmişik. Başqa sözlə desək, bizim gördüyümüz şeylərin hamısı cisim və cismin xüsusiyyətləri olmuşdur. Yəni, müəyyən bir zaman və məkana malik olan məxluqların hərəsinin özünə məxsus xüsusiyyətləri olmuşdur. Belə bir halda, belə bir vəziyyətdə nə cismi, nə məkanı və zamanı olan, eyni zamanda bütün zaman və məkanı əhatə edən və heç bir cəhətdən məhdudiyyəti olmayan Allahı anlayıb, tanıyıb, onu qəbul etmək çox çətin bir işdir. Yəni, bu barədə çox diqqət etmək .lazımdır

Qeyd etməliyik ki, biz Allahın əsl zatını, əsl həqiqətini heç vaxt anlaya bilməyəcəyik və heç bunun intizarında da olmamalıyıq. Bu iş ucu-bucağı olmayan böyük bir okeanı kiçik bir qabda yerləşdirməyə, yaxud ana bətnində olan bir uşağın dünyadakı bütün ?işlərdən xəbərdar olmasına bənzəyər. Belə iş mümkündürmü

Qısa sözlə desək, Allahın sifətlərini məxluqatın sifətləri ilə müqayisə etmək düzgün .deyil

Allahın «Cəmal» və «Cəlal» sifətləri

səh:۱۵

:Adətən, Allahın sifətlərini iki qismə bölürlər

.(Sübuti sifətlər yəni, Allahda olan sifətlər. (Allah üçün sübuta yetmiş.١

.Səlbi sifətlər yəni, Allahda olmayan və Allahın onlardan pak olduğu sifətlər.٢

?Belə bir sual irəli çıxır: Allahın zatının necə sifəti var

Sualın cavabı budur ki, Allahın sifətləri bir tərəfdən sonsuzdur, digər tərəfdən isə bütün sifətləri bir sifətdə cəm olmuşdur. Çünki Allahın bütün sübuti sifətləri aşağıdakı cümlə və ifadədə cəm olur: «Allahın zatı hər cəhətdən sonsuz və bütün kamallara malik olan «.bir zat və varlıqdır

Kamal və nöqsanların dərəcələri olduğuna görə, yəni kamal və nöqsan sonsuz olduğuna görə, belə demək olar ki, Allahın sübuti və səlbi sifətləri də sonsuzdur. Çünki hər hansı bir kamal təsəvvürə gəlsə, Allah ona malikdir və hər hansınöqsan da təsəvvürə gəlsə Allah ondan pak və uzaqdır. Deməli, Allahın sifətlərinin (həm sübuti, .həm də səlbi sifətləri) sonu yoxdur

### Allahın ən tanınmış sifətləri

:Allahın məşhur və tanınınmış sübuti sifətləri aşağıdakılardır

.Alim: Yəni Allah Alimdir və hər şeyi bilir.١

.Qadir: Yəni Allah Qadirdir və hər şeyə qüdrəti catır.٢

.Həyy (Diri): Yəni Allah diridir.٣

.Həm elmi, həm də qüdrəti olan diridir.Allahın elm və qüdrəti olduğuna görə, o da diridir

.Murid (İradə edən), yəni, İradə sahibidir. Öz işlərində məcbur deyil.۴

Gördüyü bütün işlərin hamısı hikmət üzündəndir. Yerdə və göydə olan məxluqatın heç .biri hikmətsiz və fəlsəfəsiz yaranmamışdır

Müdrik (Anlayan), yəni, Allah hər şeyi dərk edib anlayır. Hər şeyi görür, bütün səsləri.۵

.eşidir, hər şeydən xəbərdardır

Qədim, Əbədi (Həmişə olan), yəni, Allah həmişə olub və olacaq. Onun vücudunun.۶ başlanğıcı yoxdur. Çünki onun varlığı onun özündəndir. Buna görə də həmişəlik və .əbədidir. Çünki vücudu özündən olan bir varlıq üçün ölüm və fəna mövcud deyildir

Mütəkəllim (Danışan), yəni, Allah səs dalğalarını havada icad edib öz peyğəmbərləri.۷ ilə söhbət etməyə qadirdir. Allah danışandır dedikdə, onun üçün dil, dodağ və boğaz .təsvir olunmur

Sadiq (Düz danışan), yəni, Allahın bütün dedikləri düz və həqiqətdir. Yalan danışmaq.۸ ya nadanlıq üzündəndir, ya da zəiflik üzündən. Heç bir nadanlıq və zəifliyi olmayan, .əksinə, hər şeyə alim və qadir olan Allahın yalan danışması qeyri-mümkündür

:Allahın məşhur səlbi sifətləti isə aşağıdakılardır

Mürəkkəb, yəni, Allah hissələrdən təşkil olunmayıb. Çünki mürəkkəb olan şeyin öz.۱ hissələrinə ehtiyacı var (və hissələr olmasa, həyata qədəm qoya bilməz). Allahın isə .heç bir şeyə ehtiyacı yoxdur. Deməli, o, mürəkkəb deyil

Cisim: Allah cisim deyil. Çünki hər cisim məhduddur, öz şəklini dəyişir, nəhayət,.۲ .(mövcudluğunu itirir. (Allah isə həmişə vardır və olacaq

Məri (Görünən), yəni, Allahı görmək mümkün deyildir. Yalnız cisim gözə görünər..۳ .Allah isə cisim deyil. Demək, gözə görünməz

Allahın məkanı yoxdur. Çünki məkan cisim xüsusiyyətlərindəndir.Allah isə cisim deyil..۴ .Deməli, məkanı da yoxdur

Allahın şəriki yoxdur. Əgər şəriki olsaydı, gərək, məhdud olaydı. Çünki heç bir.۵ cəhətdən məhdud olmayan iki varlığın bir yerdə mövcudluğu mümkün deyil. Bundan əlavə, dünyadakı qanunların (nizamın) vəhdəti (birliyi) dünya Xaliqinin birliyinə .sübutdur

Allahın sifətləri onun vücudunun bir neçə olduğuna dəlalət etmir. (Yəni, Allah alimdir,.۶ deməli alim bir Allah Qadirdir, deməli Qadir birAllah və s. ...). onun bütün sifətləri elə .onun zatının özüdür

Allah möhtac deyildir. Əksinə, o, ehtiyacsızdır. Çünki elm və qüdrət cəhətdən kamil.۷ olan bir varlığın daha heç nəyə ehtiyacı olmaz. Quran Allahın sifətləri barədə buyurur: « .(Ona bənzər heç bir şey yoxdur» (Şura, ۱۱

**Fikirləşin və cavab verin**

?Allahın yeganəliyinə və ona şərik olmadığına başqa sübutlarınız varmı.۱

?Bəzi məzhəblərin üç Allahlı və bəzilərinin də iki Allahlı olduqlarını eşitmisinizmi.۲

?Bunlar hansı məzhəblərdir

## II FƏSİL: ALLAHIN ƏDALƏTİ HAQQINDA ON DƏRS

### I DƏRS

#### ?Ədalət nədir

?Nə üçün Allahın sifətləri arasında təkcə «ədalət» üsuliddinə daxil edilmişdir

?Ədalət» lə «musavat»ın fərqi nədir»

?Nə üçün Allahın sifətləri arsından təkcə «ədalət» üsuliddinə daxil edilmişdir.۱

Allahın ədaləti barədə bəhsə başlamazdan qabaq, gərək, bilək ki, Allahın bu qədər sifətləri arasından nə üçün məhz ədalət sifəti böyük alimlər (şiə alimləri) tərəfindən .üsuliddin daxil edilmişdir

Allah Alim, Qadir, Adil, Həkim, Rəhman, Rəhim, Əbədi, Xaliq, Raziq (ruzi verən) və s. dir. ?Nə üçün təkcə ədalət sifəti üsuliddinə daxil edilmişdir

.Bu sualın cavabını öyrənmək üçün aşağıdakı məsələlərə diqqət olunmalıdır

Allahın sifətləri arasında ədalət sifəti böyük əhəmiyyət və xüsusiyyətə malikdir. Bu(۱

xüsusiyyət odur ki, Allahın bir çox sifətləri ədalət sifətinə aiddir. Çünki ədalət sözünün leksik mənası hər şeyi öz yerində və lazım olduğu kimi etməkdir. Məsələn, Allah insanları yaradıb, deməli, onların ruzusunu da yetirməlidir. Ədalət bunu tələb edir ki, .yaradan yaratdığına ruzi versin

Deməli, Allahın sifətlərindən biri olan «Raziq» (ruzi verən) ədalət əsasındadır. Eləcə də .Rəhman, Rəhim, Həkim və bir çox başqa sifətlər

Məad (qayıdış) məsələsi də Allahın ədalətinə əsasən icra olunacaq. Eləcə də(۲ .peyğəmbərlik, imamlıq ədalətlə əlaqədardır

.İslamın ilkin dövrlərində Allahın ədaləti barədə müsəlmanlar arasında ixtilaf yarandı(۳

Müsəlmanların sünni məzhəbindən olan və «Əşairə» adlanan bir qrup ümumiyyətlə Allahın ədalətini inkar edirlər. Onlar deyirlər ki, Allahın ədalət və zülmünün fərqi yoxdur. Bütün dünya onun mülküdür, ona məxsusdur. O, istədiyi işi görə bilər. Onlar hətta ağıl cəhətdən xeyir və ziyanı da inkar edirlər. Yəni, deyirlər ki, insanın ağıl və düşüncəsi o səviyyədə deyildir ki, öz xeyr və ziyanını anlasın. Hətta, ehsan verməyin yaxşı və zülmün pis iş olduğunu da anlaya bilmərik. (Onlarda bu kimi səhv fikirlər .(həddən artıq coxdur

Bu dəstənin müqabilində isə Allahın ədalətinə inanan iki məzhəb vardır. Sünni .məzhəbinin Mötəzilədəstəsi və bütün şiə məzhəbi bu əqidədədirlər

Birinci dəstə ilə ikinci dəstə arasında fərq olsun deyə, ikinci dəstəni «Ədliyyə» (yəni, Allahın ədalətinə inanan), birinci dəstəni isə «Qeyri-ədliyyə» (yəni, Allah barədə ədalət .etiqadında olmayan) adlandırmışlar. Şiələr ikinci dəstədəndir

Şiə məzhəbi başqa «Ədliyyə» tərəfdarlarından fərqli olaraq (dəlillər əsasında) «İmamət»i də üsuliddin daxil etmişdir. Deməli, harada Ədalət və İmamət dən söhbət gedirsə, .həmin söhbət şiələr barəsindədir

Füruddinin üsuliddindən bir nişanə olduğunu və Allah ədalətinin cəmiyyətdə həddən(۴ artıq təsirli olduğunu, ictimai ədalətin bəşər həyatında böyük rol oynadığını nəzərə almaqla, ədaləti üsuliddinin bir rolu, bir bəndi kimi qəbul etmək insanlar arasında .ədalətin icra olunduğuna və zülmlə mübarizəyə bir nişanədir

Peyğəmbərlər və imamların rəhbərliyi də cəmiyyətdə həqiqi rəhbər və başçının olması məsələsinə ilham verir. Deməli, bütün dünyaya hökmranlıq edən Allahın ədaləti bəşər həyatının hər sahəsində ədalətin lazım olduğuna bir nişanədir. Bu böyüklükdə aləm .ədalətlə yaşayır və cəmiyyət də ədalətsiz bir gün qala bilməz

?Ədalət nədir.۲

.Ədalətin iki müxtəlif mənası var

.A)Bu sözün leksik mənası «Hər şeyin öz yerində olması» deməkdir

Ədalətin bu mənası bütün dünyada, qalaktikamızda, atomlarda, insanın vücudunda, .bitkilər və sair canlılar aləmində hökmranlıq edir

Bu mənanı peyğəmbərin buyurduğu (yəni yer və göy ədalət əsasında qurulmuşdur) .hədisində də görmək olar

Məsələn, əgər yer kürəsi öz cazibə və dəfetmə qüvvələrini əldən versə öz tarazlığını itirmiş olar. Yaxud əgər bu iki qüvvədən biri digərindən çox olsa, ya günəş yer kürəsini özünə tərəf cəzb edərək və nəticədə yer kürəsi yanıb külə dönər, ya da yer kürəsi öz .oxundan çıxaraq məhv olar

:Şair ədalətin bu mənasını şerə çəkərək aşağıdakı məzmunda bir şer demişdir

.Ədalət nədir? Ədalət hər şeyi öz yerinə qoymaqdır

.Zülm nədir? Zülm hər şeyi lazım olmadığı yerə qoymaqdır

Ədalət nədir? Ədalət ağacları sulamaq deməkdir

.Zülm nədir? Zülm tikanları sulamaq deməkdir

Məlumdur ki, əgər suyu gül kolunun, yaxud meyvə ağaclarının dibinə töksələr, bu, yerli- yerində həyata keçirilmiş bir iş və ədalət olar. Yox, əgər suyu tikan koluna töksələr, bu, yerli- yerində həyata keçirilmiş iş və ədalət olmayacaq. Bu da zülm .deməkdir

B)Ədalətin digər mənası «camaatın haqqına riayət»dir. Bunun müqabilində isə, zülm və .başqalarının haqqına riayət etməmək durur

Ədalətin birinci mənası ikinci mənasından genişdir. (Çünki ikinci məna yalnız insanlara, (.birinci məna isə, istər insan, istərsə də qeyri-insan olsun, bütün məxluqata, aiddir

Allah üçün ədalətin hər iki mənası uyğun gəlir. Lakin ən çox ikinci məna nəzərdə .tutulur

Allahın ədalətinin mənası budur ki, o, nə birinin haqqını tapdalayır, nə birinin haqqını başqasına verir, nə də insanlar arasında ayrıseçkilik salır. O, hər cəhətdən adildir. .Onun ədalətini gələn dərslərdə sübuta yetirəcəyik

İstər birinin haqqını tapdalamaq, yaxud birinin haqqını başqasına vermək olsun, istərsə də insanlar arasında ayrıseçkilik salmaq olsun, Allahın qatında zülmün heç bir mənası yoxdur. O, heç vaxt yaxşı insanı cəzalandırmaz, pis insanı mükafatla təltif etməz, birini başqasının yerinə cəzalandırıb, yaxud mükafatlandırmaz, yaşı qurunun oduna yandırmaz. Hətta, əgər cəmiyyətdə bir nəfərdən başqa hamısı günahkar və pis adam olsa belə, Allah həmin bir nəfərin hesabını cəmiyyətdən ayrı çəkəcəkdir. Onu .günahkarlarla eyni səviyyədə tutmayacaqdır

Əşariə firqəsinin «əgər Allah bütün peyğəmbərləri cəhənəmə və bütün günahkarları cənnətə aparsa belə, yenə də ədalətə riayət etmişdir» kimi dedikləri ifadə isə əsası olmayan

bir sözdür. Sağlam və mövhümatla kirlənmiş ağıla malik insanlar bu ifadənin səhv və .əsassız olduğunu dərhal anlayır

?Musavatla ədalətin fərqi nədir.۳

Diqqəti cəlb edən başqa bir məsələ bəzən ədalətlə musavat arasında anlaşılmazlığın olması və bu iki məfhumun bir-biri ilə qarışmasıdır. Belə güman etmək olar ki, ədalət .müsavata riayət etmək deməkdir. Əslində isə, belə deyildir

Ədalətdə müsavata riayət etmək şərt deyil. Əksinə, burada ləyaqətlər və dəyərlər nəzərdə tutulur. Məsələn, bir sinfin şagirdləri arasında ədalətə riayət etmək o demək deyildir ki, onların hamısına eyni qiymət verilsin. Yaxud iki fəhlə arasında ədalətə riayət etmək onların ikisinə də eyni məbləğdə maaş vermək deyildir. Əksinə , ədalətə riayət etmək budur ki, hər şagirdin bilik, savad və ləyaqətinə və hər fəhlənin zəhmət .və işinə görə qiymət, yaxud maaş verilsin

.Təbiətdə də ədalət (geniş və birinci mənasına əsasən) bu mənadadır

Məsələn, balinanın bir tona yaxın ürəyi ilə bir qram ağırlığı olan sərçə ürəyi bərabər olsaydı, bu, ədalət olmazdı. Yaxud böyük və nəhəng bir ağacın kökü ilə kiçik və gənc .ağacın kökü bərəbər olmaz. Əgər bərabər olsa, bu, zülm olar

Təbiət də ədalətin mənası budur ki, hər bir məxluqa öz dəyəri və ləyaqəti qədər pay .verilir

**Fikirləşin və cavab verin**

?Nə üçün Allahın sifətləri arasında yalnız ədalət üsuliddinə daxil edilmişdir.۱

?Əşariə» tərəfdarları kimlər olmuşlar? Onların etiqadalrı barədə nə bilirsiniz» .۲

?Allahın ədalətinə etiqad bəsləməyin cəmiyyət nə kimi təsiri var.۳

.Ədalətin neçə mənası var? Onları izah edin.۴

?Ədalətin mənası müsavatdırmı.۵

II DƏRS

## Allahın ədalətinə dair sübutlar

Ağıl nəzərindən yaxşılıq və pislik.١

Bilməliyik ki, insan ağlı bir həddə qədər yaxşılıq və pisliyi dərk edir. (Bu bəhsin adını .(alimlər «ağıl nəzərindən yaxşılıq və pislik» adlandırmışlar

Məsələn, bilirik ki, ədalət, ehsan vermək yaxşı, zülm, paxıllıq isə pis işdir. Hətta, bunu din və məzhəb ortaya çıxmazdan qabaq da bilirdik. Düzdür, bir sıra işlər var ki, insanın ağıl və düşüncəsi onu anlamaqda acizdir və bu işdə gərək, peyğəmbər (və imamlar) .onlara kömək etsin

Deməli, müsəlmanlardan «əşariə» adlanan bir qrup hətta ədalət və zülm kimiişlərin «ağıl» nəzərindən yaxşılıq və pisliyini inkar edirsə və yaxşılıq və pisliyi təyin etməyi .Allahın öhdəsinə qoyursa, açıq-aşkar səhvə yol verir

Əgər insanın ağlı yaxşılıqla pisliyi təyin edə bilmirsə, bəs onda « Allah möcüzəni yalançı şəxslərə verməz» məsələsini necə anlaya bilərik? Lakin yalan danışmağın pis iş olduğunu vəAllahın belə bir iş görmədiyini bildikdə anlayırıq ki, Allahın verdiyi bütün vədlər haqq, (peyğəmbərlərmin vasitəsi ilə)dediyi bütün sözlər həqiqətdir. O, heç vaxt yalançıya (özünü yalandan peyğəmbər adlandıran şəxsə) kömək etməz və ona .möcüzəgöndərməz. Bununla da şəriət və dinə etimad etmək olar

Deməli, belə nəticəyə gəlirik ki, ağıl nəzərindən yaxşılıq və pislik məsələsi dinin əsas (.bəhslərindən biridir. (Diqqət

İndi isə Allahın ədalətinin sübutlarına qayıdırıq. Bu həqiqəti (Allahın Adil olduğunu) :anlatmaq üçün gərək, bilək ki

Zülmün mənbəyi və səbəbi aşağıdakı işlərdən biridir.٢

A)Cəhl və nadanlıq

Zülm edən şəxs bəzən nə etdiyini bilmir. Başqasının haqqını tapdaladığını bilmir və öz .işindən xəbərsizdir

B)Ehtiyac

Bəzən başqalarının əlində olan şey insanı məcbur edir ki, bu şeytani işə (zülmə) əl .atsın. Ancaq əgər insanın həmin şeyə ehtiyacı olmasaydı, bu işə əl atmazdı

V)Acizlik

Bəzən insan başqasının haqqını kəsmək istəmir, lakin buna imkan və qüdrəti çatmır və .istər-istəməz zülm edir

Q)Xudbinlik, qəzəb, intiqam və kin-kudurət

Bəzən ola bilsin ki, yuxarıda deyilən səbəblərdən heç biri ortada olmasın. Lakin xudbinlik və özünüsevmə insanın zülmə əl atmasına, yaxudintiqam, qəzəb və ya .qəlbində olan kin-kudurət üzündən zülm etməsinə bais olur

Yuxarıda deyilən səbəblərin heç birinin Allahda olmadığını nəzərə almaqla belə nəticəyə gəlmək olar ki, Allah heç vaxt zülm etməz. Çünki o, hər şeyi bilir (deməli, zülmün birinci səbəbi olan cəhl onun vücudunda yoxdur), heç kimə ehtiyacı yoxdur (deməli, zülmün ikinci səbəbi olan ehtiyac da onda yoxdur) və o, hər bir insana mehribandır (və zülmün heç bir səbəbi onda yoxdur. Deməli, o zalım deyildir). O, sonsuz bir varlıqdır və onun kamalının həddi-hüdudu yoxdur. Belə bir varlıqdan ədalət və xeyrdən başqa bir iş baş verməz. Zalım və kafirləri cəzalandırarsa, bu onun zülmünə dəlalət etmir. Əksinə, kafirlərin öz əməllərinin nəticəsidir. İndi də gördükləri işlərin nəticəsinə yetişirlər. Elə bil, narkotik maddələr və spirtli içkilər içməklə bir nəfər .özünü sağalmaz və məhvedici xəstəliklərə düçar edir

Quran bu məsələni belə açıqlayır: «Bu, yalnız (dünyada gördüyünüz pis) əmələrin .(nəticəsidir. (Sizə artıq və əlavə heç bir şey edilmir.)» (Nəml, ٩٠

Quran və Allahın ədaləti.٣

Diqqəti cəlb edən məsələ budur ki, Quranda da Allahın ədaləti barədə çoxlu ayələr

.gəlmiş və bu məsələ çox gözəl surətdə bəyan olunmuşdur

Bir ayə belə buyurur: «Doğrudan da, Allah insanlara zərrəcə zülm etməz, lakin insanlar özləri özlərinə zülm edərlər.» (Yunis, ۴۴). Başqa bir ayədə oxuyuruq: «Doğrudan da, Allah (heç kəsə) zərrə qədər belə zülm etməz (Nisa,۴۰). Qiyamətdə sorğu-sualın da ədalətlə keçirələcəyi barədə deyilir: «Biz qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq və zülm edilməz» (Ənbiya, ۴۷). (Xatırladaq ki, sonuncu ayədə deyilən tərəzi insanın yaxşı və pis əməllərini ölçən tərəzidir və bu dünyanın tərəziləri (.kimi adi tərəzi deyildir

Ədalətə dəvət.۴

Bundan öncə dedik ki, insan gərək, Allahın sifətlərini özünə nümunə və örnək etsin. Bununla da Allahın sifətləri cəmiyyətdə icra olunsun. Buna əsasən, Quran Allahın ədalətinə işarə etdiyi qədər cəmiyyətdə və insanların hər bir fərdi tərəfindən də ədalətin icra olunmasına böyük əhəmiyyət verir. Quran bir çox ayədə insanların və keçmiş nəsillərin azğınlığının əsas səbəbini zülm olaraq göstərmişdir və onları ən .acınacaqlı əzaba düçar olmuş insanlar hesab etmişdir

Qurani-Kərim keçmiş nəsillərin başına gələnləri bəyan etməklə zülm və fəsadın nəticəsində keçmiş nəsilləri Allah əzabına düçar olduğunu deyir və insanları xəbərdar .edir-qorxun ki, siz də zülmün nəticəsində belə bir əzaba düçar olasınız

Quran açıq-aşkar və ümumi bir qayda-qanun kimi buyurur: «Həqiqətən, Allah (Quranda insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara haqqını verməyi (kasıb qohum-əqrəbaya şəriətin vacib bildiyi tərzdə əl tutmağı) tövsiyə,zina etməyi, pis işlər .(görməyi və zülm etməyi isə qadağan edir.» (Nəhl,۹۰

Təəccüblü budur ki, zülm etmək pis və bəyənilməz iş olduğu kimi, zülmü qəbul etmək də İslam və Quran nəzərindən pis və bəyənilməz bir iş hesab olunur. Bunu Bəqərə surəsinin

cu ayəsi də bəyan edir: «Nə zülm edərsiniz, nə də sizə zülm olunar. (Nə zülm edin,-٢٧٩ «(.nə də zülmü qəbul etməyin

Qısa sözlə desək, zülmü qəbul edib zalıma boyun əymək zalımı daha da həvəsləndirir, nəticədə həddən artıq çox zülm olunur. Bu iş (zülmə tabe olmaq) özü də bir növ zülm .hesab olunur

### Fikirləşin və cavab verin

İnsan ağlı müstəqil şəkildə və şəriəti nəzərə almadan yaxşını və pisi təyin edə.١ ?bilərmi

?Zülmün səbəbi nədir? Allahın ədaləti barədə hansı əqli dəlil vardır.٢

?Quran Allahın ədaləti və zülmü barədə nə buyurur.٣

?İnsanın ədalət və zülm qarşısında vəzifəsi nədir.۴

?Zülmü qəbul edib zalıma tabe olmaq günahdırmı.۵

## III DƏRS

### Pisliklər və ziyanların fəlsəfəsi

Qədim zamanlardan başlamış indiyədək Allahın ədalətinə şəkk edən bir sıra insanlar bəzi səhv düşüncə və əqidələrə düçar olmuşlar. Onların zənnincə, bəzi işlər vardır ki, Allahın ədalətinə uyğun gəlmir. Bu işlər təkcə Allahın ədalətli olmamasının qəbulu ilə yox, bəzən hətta, Allahın inkar ilə nəticələnir. Məsələn, gözlənilməz və qeyri-adi hadisə-tufan, sel, zəlzələ və s. kimi təbii fəlakətləri göstərmək olar. (Onların zənnincə). Həmçinin, insanlar arasında olan fərqləri də (biri çolaq, biri kor, biri kar, bir dəstə isə .sağlam) misal göstərmək olar. Eləcə də ziyanlar və xəsarətlər

Bəzən bu bəhs Allahın tanıma bəhsində, bəzən isə materialistlərdə Allahın ədaləti haqqında müzakirə zamanı irəli sürülür. Biz isə bu haqda Allahın ədaləti bəhsində .danışırıq

Bu söz-söhbətin, gümanların səhv və batil olduğunu isbat etmək üçün geniş müzakirə

.açılmalı və aşağıdakı məsələlərə diqqət olunmalıdır

Nisbi mühakimə və məhdud məlumatlar(١

Adətən, insanlar əşyalarla təmasda olduqları üçün öz mühakimələrində əşyalara istinad edirlər. Məsələn, deyilir ki, filan əşya uzaqdadır. Yəni, bizə nisbətən uzaqdadır. Yaxud filankəs güclü və ya zəifdir. Müsibətlər və ziyanlar barədə də insanlar bu cür .mühakimə yürüdürlər

Məsələn, bir məntəqəyə yağış yağır. Məntəqənin şəraitini nəzərə alaraq yağışın .müsbət təsiri olarsa, onu nemət, mənfi təsiri olarsa, onu bəla adlandırırıq

Yaxud köhnə bir binanı uçurub, yerində təzə bir bina tikmək istəyirlər. Sökülən zaman oradan ötən bir nəfər toz-torpağı gördükdə narahat olub deyingənlik edir. Lakin fikirləşmir ki, orada xəstəxana tikiləcək, gələcəkdə həmin binadan yüzlərlə insan .istifadə edəcəkdir

İlk baxışdan ilanın zəhərini şər, bəla adlandırırq. Lakin bilmirik ki, həmin zəhərlə ilan özünü müdafiə edir. Yaxud bilmirik ki, həmin ilan zəhərindən bir çox xəstələrə şəfa .verən dərmanlar hazırlanır

Bu cür səhvlərin qarşısını almaq üçün yeganə yol yalnız fərdi məlumatlara .arxalanmamaqdır. Əksinə, bütün cəhətləri nəzərə alaraq hökm etmək lazımdır

Ümumiyyətlə, dünyada baş verən bütün hadisələr zəncir halqaları kimi bir-biri ilə bağlı və əlaqədardır. Bir şəhərdə əsən güclü külək, yağan leysan, hamısı bu zəncir silsiləsinin bir hissəsidir. Bu hadisələr digər şəhərlərdə də baş verən hadisələrə .əlaqədardır. Eyni zamanda, keçmişdə baş verəcək hadisələrlə də əlaqədardırlar

Yuxarıda deyilənlərdən belə nəticəyə gəlirik ki, dunya hadisələrinin əksəriyyətini kənara qoyub, onların kiçik bir hissəsi barədə hökm vermək səhv və məntiqsiz bir işdir. .Dünyada elə bir şey yoxdur ki, tamamilə şər və ziyandan ibarət olsun

Düzdür, bəzi şeylər var ki, onların ziyanı var, lakin onda olan fayda və xeyir ziyanından daha coxdur. Məsələn, bir xəstə üçün cərrahiyyə əməliyyatının ziyanı var. Çünki xəstə

əziyyət çəkir. Lakin həmin cərrahiyə əməliyyatının faydası ziyanından qat-qat çoxdur. .((Onun nəticəsində xəstə şəfa tapır

Məsələnin daha aydın olması üçün nümunə kimi zəlzələni götürək. Düzdür, zəlzələ baş verən məntəqəyə çoxlu zərər dəyir. Bu da bizim nəzərimizdə şər və ziyan olan bir işdir. Ancaq həmin zəlzələnin dünyanın digər hadisələri ilə əlaqədar olduğu nəzərə alındıqda .ola bilsin ki, bizim fikrimiz dəyişsin

Zəlzələnin təkcə yerin altında olan hərarət və buxarların və ya quru, dəyişməyən ayın daima yer kürəsini özünə cəlb etməsinin, yaxud da deyilənlərin hər ikisinin səbəbindən baş verməsi barədə alimlər müxtəlif nəzəriyyələr yürüdürlər. Bu nəzəriyyələrdən hər hansını qəbul etsək, yenə də gərək, zəlzələnin digər cəhətlərini nəzərə alaq. Yəni, bilməliyik ki, yerin altında əmələ gəlmiş hərarətin indiki zamanda dünyada böyük rol oynayan neft mənbəyini, eləcə də daş kömür hövzəsinin aşkar edilməsində nə qədər .rolu var. Bunları nəzərə aldıqda zəlzələnin xeyirli olduğunu da anlayarıq

Həmçinin dənizlərdə, çaylarda, okeanlarda ayın cazibəsi nəticəsində su səthinin qabarması və çəkilməsi dəniz sularının, eləcə də dənizdəki canlı, və cansız varlıqların salamat qalmasında, bəzən də qurumuş sahillərin suvarılmasında böyük rol oynayır. .Deməli, bu da xeyirdir

Belə məsələlərə nəzər saldıqda anlayırıq ki, bizim məhdud elmimizin nəticəsində bəzi işlər şər və bəzi işlər xeyir adlandırılmışdır. Hadisələrə nə qədər cox diqqət yetirsək, bir .o qədər onların həqiqətinə yetişərik

Qurani-Məcid insanlara buyurur ki, «sizə yalnız cüzi bir elm və bilik verilmişdir.» (İsra, (.٨٥

.Bu cür azvə cüzi elmlə dünyanın hadisələri barədə hökm verməyə tələsmək olmaz

Xoşa gəlməz hadisələr və xəbərdarlıqlar(٢

Bir çox insan nemətin içində olduğu halda qürur, təkəbbür və özünüsevərlik onu basır. Bu zaman çox mühüm məsələlər və vəzifələri onun yadından çıxır. Həmçinin, insanın güzaranı yaxşı , rahat keçdikdə qəflət yuxusu onu yaxalayır. Əgər bu hal axıradək

.davam etsə, insanın bədbəxtçiliyi (mənəvi bədbəxtçiliyi) ilə nəticələnər

Şübhəsiz ki, insan həyatında baş verən bir çox xoşa gəlməz hadisə insanı bu cür qəflət .yuxusundan ayıltmaqdan ötəridir

Yəqin ki, eşitmisiniz, təcrübəli sürücülər həmişə düz, eniş-yoxuşu və döngəsi olmayan şosselərdən şikayət edir, bu yolların xətərli olduğunu bildirirlər. Çünki yolun bu şəkildə olması sürücünü yuxu və ya mürgü vəziyyətinə salır. Bəzi ölkələrdə təhlükənin .qarşısını almaq üçün bu cür şoselərdə süni eniş-yoxuş düzəldirlər

İnsan həyatı da eynilə bu cürdür. Əgər insan öz həyatında xoşa gəlməz hadisələrlə, çətinliklərlə üzləşməsə, qəflət yuxusu insanı yaxalayar, Allah, bütün vəzifə və .məsuliyyətlər insanın yadından çıxar

Əlbəttə, insanın özünü bu çətinliklərə doğru aparması da düzgün deyil. Xeyr, bu lazım deyil. Onsuz da, çətinliklər həmişə insanlar üçün mövcuddur. Burada məqsəd insanın bu hadisələrin səbəb və fəlsəfəsini bilməsidir. Xoşagəlməz hadisələrin, çətinliklərin fəlsəfəsi budur ki, Allah bu işlərin vasitəsi ilə insanı qürur və təkəbbürdən kənara çəkir, onu səadəti ilə düşmən olan qəflət yuxusundan oyadır. Xatırladaq ki, bu, çətinliklərin, xoşa gəlməz hadisələrin yalnız bir hissəsidir. Bundan başqa fəlsəfə və səbəblər var. (.Gələn dərslərdə bu barədə söhbət edəcəyik. (İnşaallah

Qurani-Məcid insana üz vermiş fəlakətlər barədə belə buyurur: «Onları müsibət və (.fəlakətə düçar etdik ki, bəlkə bizə yalvaralar.» (Ənam, ۴۲

**Fikirləşin və cavab verin**

?Pisliklər və ziyanlar məsələsini hansı firqələr əqidəvi bəhslərdə irəli sürmüşlər.۱

Pislik və ziyanlara aid bir neçə nümunə göstərin. Öz həyatınızda ziyanla.۲ ?üzləşmisinizmi

Hər tərəfli və nisbi hökm vermək, tamamilə şər və müsbətən xeyr olan şeydən.۳ ?məqsəd nədir

?Tufan və zəlzələlər təkcə ziyanmı verirlər.۴

?Həyatda baş verən xoşa gəlməz hadisələrin nə kimi müsbət təsiri var.۵

## IV DƏRS

### Xoşagəlməz hadisələrin fəlsəfəsi

Keçən dərs dedik ki, bəzi səhv düşüncəyə malik insanlar həyatda irəli çıxan çətinlikləri, xoşagəlməz hadisələri allahın ədalətli olmadığına, hətta bəzi hallarda Allahın .olmamasına sübut kimi irəli sürürlər

Ötən dərsdə bu hadisələrin bir qismini və onun fəlsəfəsindən ikisini qeyd etdik. İndi isə .həmin bəhsin ardını davam edirik

İnsan çətinliklərin qoynunda tərbiyə olunur(۳

Bir daha təkrar edirik ki, insan heç vaxt özü-özünü çətinliyə salmamalıdır. Eyni zamanda, çətinliklərlə üzləşdikdə insanın qüdrəti, ruhiyyəsi artır. Polad parçasının isti kürənin içində qızdırılaraq döyülməsi onu möhkəmləndirdiyi kimi, eləcə də insan .çətinliklərlə üz-üzə gəldikdə iradə və ruhiyyəsi möhkəmlənir

Əlbəttə bütün insanların, bütün millətlərin çətinliklərə qarşı göstərdikləri müqavimət bərabər və eyni səviyyədə deyil. Bəzi insanlar çətinliklərin qarşısında aciz qalaraq məyus olur və mənfi nəticə yaradırlar. Bəziləri isə, çətinliklərlə üzləşdikdə mübarizəyə .qalxaraq öz zəif cəhətlərini islah edirlər

Çətinliklərlə üzləşdikdə insanların əksəriyyəti səthi və nisbi hökm verdikləri üçün yalnız onun çətinliklərini, acılığını və mənfi cəhətlərini nəzərə alırlar. Həmin hadisənin müsbət .cəhətləri isə nəzərdə tutulmur

Əlbəttə, biz həyatda baş verən bütün çətin hadisələrin müsbət cəhətinin olduğunu .demirik. Ancaq heç olmasa, bir qismi bu cürdür

Əgər böyük alimlərin həyatına diqqət yetirsəniz, görərsiniz ki, onların əksəriyyəti çətinliklər icərisində böyümüş və elmi dərəcələrə yüksəlmişlər. Naz-qəmzə, eyş-işrət içərisində böyümüş insanlar heç vaxt belə məqamlara yetişə bilməzlər. Yetişsə də, .həddən artıq az insanlar yetişər

Əsl hərbi komandirlər uzun müddət çətinliklərin, odun-alovun və müharibənin içərisində olanlardır. Həqiqi iqtisadçılar iqtisadi böhran vəziyyətində olan bazarlarda .ticarət və müamilə edənlərdir. Əsl siyasətçilər isə, siyasi prblemlərlə üzləşənlərdir

.Qısa sözlə desək, çətinliklər insanı öz qoynunda böyüdür və tərbiyə edir

Qurani-Məcid belə buyurur: «Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah .((sizdən ötrü) çoxlu xeyir nəzərdə tutmuş olsun». (Nisa,۱۹

.Çətinliklər Allaha doğru dönüşə səbəb olur(۴

Ötən dərslərdə dedik ki, insanın hər bir üzvünün məqsəd və qayəsi vardır. Gözün, qulağın, ürəyin, beynin və digər bədən üzvlərinin hər birinin özünə məxsus vəzifəsi .vardır. Heç biri məqsədsiz xəlq olmayıb

Əgər insanın tək-tək bədən üzvlərinin, hətta barmaq izlərinin məqsədi varsa, necə ola bilər ki, insanın bütün vücudu qayəsiz və yaranışı fəlsəfəsiz olsun? Elə ötən dərslərdə bu qayənin nə olduğunu söyləmişdik. Bu qayə insanın hər bir cəhətdən kamilliyə və kamala çatmasıdır. Yəqin ki, bu kamilliyə çatmaq üçün insanın bir sıra təlim-tərbiyə proqlamlarına ehtiyacı var. Məhz bu səbəbdən Allah-Təala insanın fitrətində yaratdığı tövhiddən əlavə ۱۲۴

min peyğəmbər və bir neçə səmavi kitab göndərmişdir. Şübhəsiz ki, bunları .göndərməkdə məqsəd yalnız insanlara təkamül yolunda rəhbərlik etməkdir

Eyni zamanda, insan bu məqsədə yetişmə və kamilləşmə müddətində törətdiyi günahların nəticəsini, əzabını görməli, Allahın fərmanından kənar hərəkət etdiyi üçün həyatda bir sıra çətinliklərlə üzləşməlidir. Bu vasitə ilə insan törətdiyi günahın nəticə və aqibəti ilə tanış olaraq Allaha tərəf qayıdır. Bu cür bəla, müsibət və çətinliklər isə .həqiqətdə Allah tərəfindən göndərilmiş bir nemətdir

Quran bu məsələni öz məntiqilə bəyan etmişdir: «İnsanların öz əlləri ilə etdikləri pis əməllər (öz günahları) üzündən suda və quruda fəsad, pozuntu əmələ gələr (bəzi yerlərdə quraqlıq, qıtlıq olar, bəzilərində zəhərli yağışlar yağar, zəlzələ baş verər,dənizlərdə gəmilər batar) ki, Allah (bununla) onlara etdikləri bəzi günahların .(cəzasını daddırsın və bəlkə onlar (tövbə edib pis yoldan) qayıtsınlar.» ( Rum, ۴۱

Yuxarıdakı ayəyə əsasən, müsibət və bəlaları «şər» bilmək və onları «bəla» adlandıraraq .Allahın ədalətinə zidd hesab etmək səhv və məntiqsiz bir əqidədir

.Bu məsələyə nə qədər çox diqqət yetirilsə, o qədər çox onun fəlsəfəsinə yetişərik

### Fikirləşin və cavab verin

?İnsanın yaranışındakı məqsəd nədir? Və bu məqsədə hansı yolla yetişmək olar.۱

?Çətinliklərlə üzləşdikdə insanın iradə və ruhiyyəsi necə möhkəmlənir.۲

Çətinliklər içində böyüyüb, böyük elmi məqamlara çatmış insanlardan görüb, yaxud.۳ .tarixdə oxumusunuzmu? Əgər bilirsinizsə, onların həyatından danışın

?Quran insanların etdiyi günahların əvəzi barədə nə buyurur.۴

?Hansı insanlar çətinliklərdən müsbət, hansılar isə mənfi nəticə çıxarırlar.۵

## V DƏRS

### Yenə də ziyan və çətinliklərin fəlsəfəsi

Şər işlərin, ziyanların, müşküllərin, çətinliklərin və xoşagəlməz hadisələri tövhid və Allahı tanıma bəhslərində mütaliə edənlər üçün çoxlu suallar irəli çıxardığını nəzərə alaraq, yenə də bu məsələ barədə bir daha ətraflı söhbət edir, çətinlik və ziyanlar .barədə söylədiyimizfikirləri davam etdiririk

Çətinliklər insan həyatına ruh verir(۵

Əgər nemətlər hər zaman insanın əlində olarsa, öz dəyər, qədr və əhəmiyyətini .itirəcəkdir. Bəlkə də bunu qəbul etmək bəziləri üçün çətin olsun

Bu gün artıq sübuta yetirilmişdir ki, bir cismi otağın ortasında qoyub, hər tərəfdən o cismin üzərinə güclü, qüvvətli və eyni səvviyyəli işıq buraxsalar (cisim və otaq təmizolmaq şərti ilə), həmin cismi gözlə görmək mümkün olmayacaq. Çünki bir şeyi görmək üçün, gərək, onun kölgəsi işığın əks tərəfində olub, cəhətlərini təyin etsin. Bununla da cism öz ətrafından fərqlənərək müşahidə olunur. (Yuxarıdakı misalda isə (.bu şərait aradan çıxır

Nemətlərin qədrini bilmək də çətinliklərin ortaya cıxması və nemətlərin əldən getməsi .olmadan mümkün deyil

Əgər insan ömründə bir dəfə belə xəstələnməsə, sağlamlığın qədrini bilməz. Əgər insan bir dəfə gecəni güclü, dəhşətli qızdırma içərisində keçirsə, səhər açılarkən axşamkı qızdırmadan heç bir əsər-əlamət qalmazsa, sağlamlığının qədrini anlayacaq. .Biləcək ki, sağlamlıq adlı böyük bir nemət onun ixtiyarındadır

Ümumiyyətlə, bir səviyyədə ömr sürmək (hətta maddi imkan cəhətdən ən gözəl səviyyədə olsa da) ruhsuz olur, insanı yorur, hətta insanı ölüm halına salır. Bəzi hallarda maddi imkanı yüksək səviyyədə olan və həyatını heç bir çətinlik olmadan keçirən insanlar nəhayət intihara əl atmış, yaxud ömr boyu həyatlarından .şikayətlənmişlər

Mahir bir memar böyük bir salon üçün divar tikdikdə heç vaxt divarları zindan divarları kimi düz və eyni səviyyədə tikmir. Əksinə, salonun divarlarını bəzəyir, memarlıq .nəzərindən ona yaraşıq verir

Təbiət nə üçün bu qədər gözəldir? Nə üçün dağların başına kimi çəkilmiş meşələr, ?ağaclar arasından axan bulaq və arxlar insana həzz verir və insanın ruhunu oyadır

.Bunun ən açıq səbəbi təbiətin eyni cür və bərabər olmamasıdır

Quranın bir çox ayələrində işıq və qaranlığın, gecə və gündüzün təsirləri haqda deyilənlərdə də məqsəd insanların bir səviyyədə yaşamasına son qoymaqdır. Məsələn, günəş daima asimanın bir nöqtəsində durub yer kürəsinə işıq saçsa, həyatda heç bir dəyişiklik olmaz. Nə gecə olar, nə günəş batar. İnsanlar hamısı yorulub əldən .düşər və bir çox digər çətinliklər də ortaya çıxar

Buna görə də, həyatda yaranan çətinliklərin bir qisminin insana ruh verdiyini, onun ruhiyyəsini artırdığını qəbul etməliyik. Çtinliklər yaşayışı insanın gözündə ucaldır, onu cilvələndirir. Çətinliklər insana nemətin qədrini bilməyi və əlində olan nemətlərdən .necə istifadə etməyi öyrədir

İnsanların özlərinin yaratdıqları çətinliklər(۶

Bu bəhsdə diqqəti cəlb edən sonuncu məsələ budur ki, insanların çoxu bəzən xoşagəlməz hadisələrin səbəbini araşdırdıqda səhvə düçar olurlar. Zalım insanların törətdiyi zülmləri Allahın boynuna qoyaraq onu ədalətsiz sanırlar. Yaxud bəşəriyyətin proqramsız və nizamsız gördüyü işləri təbiətin boynuna ataraq təbiəti nizamsız hesab edirlər. Məsələn, deyirlər ki, nə üçün zəlzələ olduqda şəhərdəkilər az, kəndlilər isə çox ziyan görürlər. Bu iş hansı ədalət əsasındadır? Əgər bəla gəlirsə, nə üçün insanlar arasında bərabər bölünmür? Və ya deyirlər, nə üçün bütün bəlalar, və çətinliklər məzlumların və fəqirlərin başına gəlir? Yaxud deyirlər ki, ümumi xəstəliklər camaat .arasına yayıldıqda kasıblar və fəqirlər hamıdan çox həlak olurlar

Bu qism insanlar xəbərsizdirlər ki, bunların heç biri Allahın ədalətinə və təbiətə aid deyildir. Bu cür işlər insanların bir-birinə etdikləri zülm nəticəsində meydana çıxır. Əgər kəndlilər də şəhərlilər kimi özlərinə möhkəm evlər, binalar tiksələr, zəlzələ zamanı onlar da şəhərlilər kimi az ziyan çəkərlər. (Təəssüflər olsun ki, belə deyil.) Ancaq kəndlilər özlərinə azacıq palçıqdan, daşdan, torpaqdan, taxtadan ev tikdikdə, əlbəttə ki, zəlzələ zamanı çoxlu tələfat olmalıdır. Bu cür ev möhkəm bir küləyin əsməsi və ya ۱-

۲ bal zəlzələnin nəticəsində də uçulub dağıla bilər. Bunlar heç də Allahın ədalətinə aid .deyildir

Birinin sarayda, digərinin isə koma və daxmada yaşaması Allahın ədalətinə aid olmayan şeydir. Bu sualları Allahın ədalətinə aid edərək ona yox, bəşəriyyətin qurduğu səhv proqlamlara irad tutmaq lazımdır. Bunun üçün calışmalıyıq ki, insanların bu cür ədalətsizliyinə son qoyulsun. Yoxsulluğu aradan qaldırmaq, məzlumların köməyinə yetişib, onların haqqını özlərinə qaytarmaq lazımdır. Əgər bunlar həyata keçsə, .şübhəsiz, bu iradlar da yox olub gedəcək

Əgər insanların hamısının yeməyi, müalicəsi bir olsa, ümumi xəstəliklər qarşısında hamı bir dərəcədə olar. Lakin bir qismin maddi imkanı yüksək səviyyədə olsa, (və heyvanlarına da xüsusi həkimlər nəzarət etsə), ancaq başqa bir qismin hətta xəstə körpəsinimüalicə etməyə imkanı olmasa, əlbəttə ki, bu cür ədalətsizliklər baş verəcək. Bu cür hallar cəmiyyətdə həddən artıq çoxdur və bunların hamısı insanların .ədalətsizliyinə aiddir

Belə hallarda Allahın ədalətinə irad tutmaqdansa, özümüzə irad tutmalı və özümüzü .islah etməliyik

!Zalıma deyilməlidir ki, zülm etmə

!Məzluma deyilməlidir ki, zülmə qarşı sakit oturma

İnsanların hamısına (istər şəhərli, istər kəndli, istər kasıb, istərsə də varlı olsun) eyni səviyyədə yemək, dərman preparatları çatdırılmalı, təlim-tərbiyə, mədəniyyət .öyrədilməlidir

.Bir sözlə, öz günahımızı Allahın və təbiətin boynuna qoymamalıyıq

Allah bizi bu cür yaşamağa nə vaxt məcbur etmişdir? Allah bu cür quruluşu bizlərə harada tövsiyə etmişdir? O, bizi azad buraxmışdır. Ona görə ki, azadlıq kamillik və təkamül rəmzidir. İnsanlar isə, öz azadlıqlardan pis və mənfi istifadə edərək bir-birinə zülm edirlər. Bu zülm də cəmiyyətdə pis və xoşagəlməz fəsadlara səbəb olur. Təəssüf ki, insanların əksəriyyəti bu səhvə düçar olmuşdur. Tarixdə də bu cür nümunələrərast .gəlirik. Bu məsələni Quran qısa, lakin həddən artıq mənalı bir ayə ilə açıqlamışır

Həqiqətən, Allah insanlara zərrəcə zülm etməz, lakin (onlar) özləri özlərinə zülm» (.edərlər.» (Yunis,۴۴

Bununla da «ziyan və çətinliklərin fəlsəfəsi» bəhsinə son qoyuruq. Düzdür, bu barədə daha da ətraflı söhbət etmək olar, lakin bu kitabın və bəhsin həcminə görə bu qədər .kifayət edər

### Fikirləşin və cavab verin

?Nə ücün «ziyan və çətinliklərin fəlsəfəsi»ni üç dərsdə davam etdiririk.۱

Həyatın eyni bir səviyyədə sürməsinin nə kimi pis təsiri var? Rifah içində yaşayan .۲ ?insanların həyatlarından şikayətləndiklərini görmüsünüzmü

?Təbiətdəki zülmət və (qaranlıq) və nur (işıq) barədə nə bilirsiniz.۳

Həyatda baş verən bəla və müsibətlər hamısı Allah və ya təbiət tərəfindədir, yoxsa .۴ ?insanların da bu işdə rolu var

İctimai çətinlikləri aradan qaldırmaq üçün düzgün bir yol varmı? Bizim məzlumlar.۵ ?qarşısında vəzifəmiz nədir

## VI DƏRS

### Məcburiyyət və ixtiyar məsələsi

Allahın ədaləti ilə sıx əlaqəsi olan məsələlərdən biri də «məcburiyyət və ixtiyar» .məsələsidir

Məcburiyyətə əqidə bağlayanların nəzərincə, insan öz əməl, rəftar, hərəkət və

söhbətində heç bir ixtiyar sahibi deyil. İnsanların bütün hərəkətləri elektrik maşının hərəkətləri kimidir. Burada belə bir sual yaranır: bu nəzəriyyə Allahın ədaləti ilə necə uyğun gəlir? Bəlkə də məhz buna görə Əşairə dəstəsi (bir neçə dərs bundan qabaq da bu dəstənin adı çəkilmişdir. Bu dəstə ağıl nəzərindən yaxşılıq və pisliyi inkar edirdi) «məcburiyyət» nəzəriyyəsini qəbul, Allahın ədalətini isə inkar etmişdir. Doğrudan da, əgər «məcburiyyət» nəzəriyyəsi qəbul olunsa, onda Allahın ədalətinin mənası .olmayacaq

:Bu məsələnin aydın olması üçün bir necə mövzunu araşdırmalıyıq

Məcburiyyət»ə etiqad bağlamanın mənbəyi»(۱

Hər bir insan hiss edir ki, o, qərarlarında azaddır. Məsələn, filan dostuna maddi kömək etsin, ya etməsin. Susuzluq halında onun qabağına su qoyulduqda içsin, ya içməsin. Bir nəfər ona pislik etmişdir, onu bağışlayıb təqsirindən keçsin və ya bağışlamasın. Bütün insanlar xəstəlik və ya qocalıq üzündən titrəyən əllə, ixtiyar üzündən hərəkət edən əl .arasında fərq qoyurlar

Belə olduğu- azadlıq və ixtiyarı bütün insanların özlərində hiss etdikləri, halda nə üçün ?bir qrup insan «məcburiyyət və ixtiyarsızlıq» nəzəriyyəsinə əqidə bağlamışdır

Bu suala müxtəlif cavablar vermək olar. Onların ən əsaslarından biri budur ki, insan mühitin və tərbiyənin təsiri altına düşür. Təbliğatın, ictimai mədəniyyətin insan ruhuna, fikir və əqidəsinə təsirini etdiyini görür. Bəzən iqtisadi vəziyyət də insana öz təsirini göstərir. Bu səbəblərin hamısı üst-üstə gəldikdə insan belə güman edir ki, o, azad və ixtiyar sahibi deyil- öz daxili və xarici qüvvələrimiz əl-ələ verib bizi müxtəlif qərarlara gəlməyə vadar edirlər. Əgər bu qüvvələr olmasaydı, bəlkə də biz belə qərarlara gəlməyib, etdiyimiz işləri etməzdik. Bu qüvvələri isə mühit, iqtisadi vəziyyət, təlim-tərbiyə məcburiyyəti adlandırmaq olar. Bütün bunlar filosofların «məcburiyyət» .nəzəriyyəsinə tərəfdar çıxmasına səbəb olmuşdur

.Məcburiyyət»ə əqidə bağlayanların ən əsas səhvi».٢

Bu əqidədə olanlar bir şeyi nəzərə almır və ondan xəbərsiz qalırlar. Bu, haqqında danışdığımız«məcburiyyət və ixtiyar» məsələsinin «nöqsanlı səbəblər» bəhsinə yox, «tam və kamil səbəblər» bəhsinə aid olmasıdır. Başqa sözlə desək, heç kəs mühitin, mədəniyyətin, iqtisadi səbəblərin insanın düşüncə, əqidə və rəftarına təsir etdiyini inkar etmir. Söhbət bundadır ki, bunlarla yanaşı yenə də son plan və son qərar insanın öz əlindədir və o, öz işində azaddır. Çünki bütün insanlar anlayırlar ki, hətta fəsadla dolu olan bir mühitdə də insan yolunu azmaqda məcbur deyil. Belə bir mühitdə də .insan özünü qoruyub saxlaya bilər

Buna görə də, gərək məcburiyyət nəzəriyyəsinə əqidə bağlayanların məcburiyyət üçün sadaladıqları bir sıra səbəbləri (mühit, iqtisadi vəziyyət və s.) «tam və kamil .səbəblər» bəhsindən ayıraq

Elə bu səbəbdən bəzi insanlar asayiş, rahatlıq içərisində və iqtisadi vəziyyəti yüksək səviyyədə olan ailədə böyüsələr də, digər ailə üzvlərindən fərqlənirlər. Ailədə olan ictimai xronikaya müxalif olmurlar. Hətta bəzən belə gedişata qarşı çıxıb çevriliş aparırlar. Əgər mühit, mədəniyyət, təbliğat bütün insanlara tam şəkildə təsir edirsə, onda dünyada heç bir inqilab həyata keçməməlidir. İnsanlar yaşadıqları mühit çətin də .olsa, keçinməli və yeni bir mühit icad etməməlidirlər

Bunlardan məlum olur ki, yuxarıda məcburiyyət üçün deyilən səbəblərin heç bir insanın taleyini həll etmir. Bu səbəblər insanda yalnız təsir qoyur. İnsanın taleyini həll .edən ancaq onun öz iradə və qərarıdır

Bu məsələni qızmar yay günlərində qərara gəlib Allahın əmri ilə oruc tutmağa bənzətmək olar. Bu vaxt bütün əzalarımız su tələb edir, lakin biz Allahın əmrini yerinə yetirmək məqsədi ilə bunların hamısına göz yumub su içmirik. Ola bilər, kimsə Allahın əmrindən kənara çıxaraq oruc tutmasın.(Deməli, bunların hamısı insanın öz (.ixtiyarındadır

Belə nəticəyə gəlirik ki, yuxarıdakı səbəblərdən fərqli olaraq insanın taleyini həll edən .insanın öz iradə və qərarıdır

Məcburiyyət» nəzəriyyəsinin siyasi və ictimai səbəbləri«(۳

Məcburiyyət və ixtiyar məsələsindən tarix boyu sui-istifadə etmişlər. Bir sıra səbəblər «məcburiyyət» nəzəriyyəsinə əqidə bağlamaq və insanın özünün də heç bir ixtiyarı :olmamasını nəzərə almaqla həmişə öz təsirlərini qoymuşlar. O cümlədən

A)Siyasi səbəblər

Yezid kimi zalım və xudbin siyasətçilər aşağı təbəqədən olan insanların qiyamının qarşını almaq,eləcə də öz qanunsuz rəhbərliklərini davam etdirmək üçün həmişə bu nəzəriyyəyə əl atmışlar ki, insanın özündən heç bir şey asılı deyil. İnsan öz işlərində məcburdur. Bir dəstə başçı, rəhbər, digər dəstə isə rəiyyətdirsə, bunların hamısı .qəzavü-qədər və məcburiyyət üzündəndir və heç bir şey insanın özündən asılı deyil

Məlumdur ki, bu fikir məzlumların hərakatının qarşısını almaqda və zalımların öz siyasətlərini davam etdirməsində nə qədər böyük rol oynayır. Şəriət və ağla əsasən isə insanın taleyi, iradəsi öz əlindədir. Həyatda məcburiyyət mənasında olan qəzavü-qədər yoxdur. Allahın qoyduğu qəzavü-qədər insanın öz iradə, qərar, hərəkət və .istəyinə əsasən təyin edilmişdir

B)Psixoloji səbəblər

Dünyada bir qrup süst və tənbəl insanlar var ki, onlar həyatda həmişə məğlubiyyətə uğrayır və heç vaxt uğur qazanmırlar. Ancaq bunun səbəbini öz tənbəlliklərinin boynuna yox, məcburiyyətin boynuna yıxırlar. Bu əqidəyə tapınaraq özlərini həyatda məcbur bilirlər. Bununla da özlərinə təsəlli verirlər. Deyirlər, çarəmiz nədir, bəxtimiz əvvəldən belə yazılıb, bəxtimiz əvvəldən qara olub. Daha qara bəxti Zəmzəm, Kövsər .suyu ilə də yumaq mümkün deyil.Təəssüflər olsun ki, bəxtimiz bizə kömək etmir

V) İctimai səbəblər

Bir qrup insanlar azad olmaq və ürəkləri istəyən günahları etmək istəyirlər. Bununla yanaşı, özlərini günahkar adlandırmaq da istəmirlər. Bu arzularını həyata keçirmək üçün «məcburiyyət» nəzəriyyəsinə əqidə bağlayırlar. Bununla da gördükləri günahlar üçün bəhanə gətirirlər. Məlumdur ki, bunların hamısı yalan və yanlışdır. Hətta bu əqidədə olan insanların özləri də bu üzrlərin əsassız olduğunu bildirirlər. Lakin nəfsləri onlara həqiqəti etiraf etməyə imkan vermir. Buna görə də, cəmiyyətin əqidəsini sağlam və düzgün yetişdirmək üçün bu cür əqidələrlə mübarizə aparmaq lazımdır.

**Fikirləşin və cavab verin.**

١. «Məcburiyyət» nəzəriyyəsi ilə «ixtiyar» nəzəriyyəsinin nə fərqi var?

٢. «Məcburiyyət» nəzəriyyəsinə əqidə bağlayanların ən əsas dəlili nədir?

٣. Mühitin, mədəniyyətin, iqtisadi vəziyyətin insanlara təsir etməsinin müqabilində nə cavab vermək olar?

٤. «Məcburiyət» nəzəriyyəsi nəticəsində irəli cıxan siyasi, psixoloji və ictimai səbəblər hansılardır?

٥. Biz bu cür səbəblərə qarşı nə etməliyik?

## VII DƏRS

### İnsan iradəsinin və ixtiyarının azadlığına dair ən aşkar sübut.

١. Bütün insanların vicdanı məcburiyyəti inkar edir.

Alimlər, filosoflar insanın iradəcə azad və ixtiyar sahibi olması barədə çoxlu mübahisələr etmiş və bu məsələ də bir çox sübut və dəlillər gətirmişlər. Biz isə bu barədə ətraflı danışmayacağıq. Yalnız iradə azadlığı üçün gətirilmiş ən aydın və aşkar dəlili oxucuların nəzərinə çatdırırıq. O dəlil insanların öz vicdanıdır.

İzah: İnsanlar nəyi inkar etsələr də, bir həqiqəti inkar etmirlər. Bu, cəmiyyət də qanunnun olmalı olduğu həqiqətidir. İstər mömin, istərsə də materialist, şərqli,qərbli,

keçmiş, indiki, varlı, kasıb – hamısı deyir ki, insanlar arasında qanun hökmranlıq etməlidir. İnsanlar qanun qarşısında məsuliyyət daşımalıdırlar. Kim qanundan kənar .hərəkət edərsə, cəzalandırılmalıdır

Bir sözlə, qanunun aliliyi, insanların qanun qarşısında məsuliyyət daşımaları və eləcə də qanunu pozanın cəzalandırılması bütün insanların qəbul etdiyi bir məsələdir. Yalnız keçmişdə yaşamış vəhşi qəbilə və tayfalar bu üç məsələni rəsmi olaraq qəbul .etmirdilər

İnsanların ümumi vicdanı adlandırdığımız bu məsələ insan iradəsinin azadlığına olan ən aşkar dəlildir. Necə inanmaq olar ki, insan öz iradə və rəftarında məcbur olsun və heç bir ixtiyar sahibi olmasın, eyni zamanda, qanun qarşısında məsuliyyət daşısın və qanunu pozarsa, onu məhkəməyə çəkib sorğu-suala etsinlər, cinayəti sübuta yetdikdən sonra onu zindana salsınlar, yaxud edama məhkum etsinlər? (Əgər insan rəftarında məcburdursa, o zaman bu işlərin heç birinin mənası olmayacaq). Bu bəzən dağdan yollara tökülüb insanlara zərər yetirəndaş parçalarını tutub mühakimə etməyə bənzəyər. Düzdür, zahirdə bir insanla daş parcası arasında fərq var ancaq, əgər insanın iradə azadlığını danırıqsa, onda bu zahiri fərqin heç bir mənası qalmayacaq. Hər ikisi məcburiyyət üzündən hərəkətə gəlmiş və cəmiyyətə müəyyən ziyan vurmuşlar. (Biri dağdan aşağı enib bir nəfəri öldürüb, biri də silahla birini vurub (.öldürüb

Məcburiyyət» nəzəriyyəsinə əqidə bağlayanların fikrincə, bu iki işin nəticəsində heç bir» fərq yoxdur, heç biri öz iradəsi ilə iş görməmişdir. Onda nə üçün biri (insan) mühakimə ?olunmalı, digəri (daş parcası) isə mühakimə olunmamalıdır

Belə bir mövqedə insan iki yol ayrıcında durur: ya gərək bütün insanların vicdanı ilə qoyulmuş qanunu pozaraq bütün məhkəmələri ləğv etsin, ya da «məcburiyyət» .nəzəriyyəsini inkar etsin

.Şübhəsiz ki, ikinci yol daha üstündür

Təəccüblü budur ki, həyatta məcburiyyət əqidəsində olanların özləri də həyatda və əməldə qanundan, məhkəmədən və əsl azadlıqdan dəm vururlar. Əgərbir nəfər onlara qarşı kobud və nalayiq hərəkət edərsə, onu məhkəməyə verirlər. Müttəhimi .cəzalandırmayınca, sakit olmurlar

Əgər insan azad deyilsə, özündən heç bir şey asılı deyilsə, bu şikayətlərin, səs-küyün ?nə mənası var

İnsanların bu ümumi vicdanı sübut və şahiddir ki, bütün insanlar öz batinlərində azad olduqlarını qəbul etmişlər və buna əmindirlər. Həmişə öz azadlıqlarına vəfadar olmuş, hətta bir gün olsun belə bu əqidədən dönməmişlər. İnsanlar bilirlər ki, bu əqidəsiz .yaşamaq, şəxsi və ictimai müşkülləri həll etmək qeyri mümkündür

İslamın böyük alimi, filosofu Xacə Nəsrəddin Tusi bu məsələni məcburiyyət və ixtiyar barədə yazdığı kitabda çox gözəl bir ifadə ilə bəyan etmişdir: «Bizim öz vicdanımız «.şahiddir ki, bizim bütün işlərimiz özümüzə aiddir

:Din və məzhəb məcburiyyətlə ziddir(۲

Yuxarıda deyilənlərin hamısı «məcburiyyət» nəzəriyyəsinin insanların vicdanı ilə zidd olmasına aid idi. Burada insanların dindar, məzhəb əhli, yaxud dinsiz və heç bir dinə .xidmət etməyən olmasın heç bir fərqi yoxdur

Məcburiyyət nəzəriyyəsi vicdanla olduğu kimi, din və məzhəblə də müxalif və ziddir. Din və məzhəb təfəkkürü də məcburiyyət nəzəriyyəsinin batil və səhv olduğuna dair digər qanedici sübutlar ortaya qoyur. Din və məzhəb təfəkkürü heç vaxt məcburiyyət nəzəriyyəsi ilə uyğun gələ bilməz. Əgər bu nəzəriyyə qəbul edilərsə, onda dinin əsasları, proqramları çətinliklə üzləşər. Allahınkeçən dərslərdə sübuta yetirilmiş ədaləti ilə məcburiyyət nəzəriyyəsi necə uyğun gələ bilər? Necə ola bilər ki, Allahın bir nəfəri filan pis işi görməyə vadar və məcbur edə, sonra da həmin işə görə onu cəzalandıra? (Bu Allahın ədaləti ilə düz gəlirmi?) Bu iş heç bir məntiqlə uyğun gəlmir. Əgər məcburiyyət nəzəriyyəsini qəbul etsək, onda savab, günah, cənnət və cəhənnəmin hamısı mənasız və hədəfsiz olacaqdır. Həmçinin, əməl dəftəri, qiyamət gününün hesab kitabı, Quran ayələrində günahkarlara vəd olunmuş əzab və eləcə də

möminlərə verilmiş müjdələr öz mənasını itirəcəkdir. Çünki bu nəzəriyyəyə əsasən, nə bir nəfər möminin özündən bir şey asılıdır, nə də bir günahkar və kafirin əlindən bir iş gələr. Bunlardan əlavə, biz din və məzhəbin ilkin mərhələlərində «məsuliyyət»lə üzləşirik. Hər bir insanın din qarşısında məsuliyyət daşıdığını görürük. Əgər insanlar öz iradələrində azad və muxtar (ixtiyar sahibi) olmasalar, onda məsuliyyətin nə mənası olar? Əli özündən ixtiyarsız əsən şəxsə «əlini tərpətmə» deyə bilərikmi? Yaxud enişdən aşağı gələn və özünü saxlaya bilməyən insana «dayan» deyə bilərikmi? Məhz buna görə də əmirəl-möminin Həzrət Əli (ə) hədislərinin birində buyurur ki, məcburiyyət .əqidəsi bütpərəstlərin və şeytan hizbinin (partiyasının) əqidəsidir

Həzrət Əli (ə)-ın hədisinin ibarəsi belədir «Bu əqidə bütpərəstlərin, Allah düşmənlərinin (.və şeytan yolunda olanların əqidəsidir.» (Üsuli-kafi. ۱-ci cild, səh.۱۱۹

### .Fikirləşin və cavab verin

?Məcburiyyət» nəzəriyyəsinin batil və səhv olduğunu sübut edən aşkar dəlil hansıdır» .۱

.İnsanın iradəcə azad olması baxımından insanların ümumi vicdanını izah edin.۲

Məcburiyyət» nəzəriyyəsi iddiasında olanların fikrincə əməldə də məcburiyyət» .۳ ?varmı

?Məcburiyyət» Allahın ədaləti ilə uyğun gəlirmi? Əgər uyğun gəlmirsə, səbəbi nədir» .۴

?İnsan iradəsinin azad olması insana necə məsuliyyət daşıtdırır.۵

## VIII DƏRS

### ?Məcburiyyətlə ixtiyar arasında olan hədd nədir

(.Vasitə nəzəriyyəsi)

. Məcburiyyətin qarşılığı olan nəzəriyyə(۱

Məcburiyyət nəzəriyyəsinin müqabilində «təfviz» adlanan bir nəzəriyyə vardır. Bu əqidədə olanlar deyirlər ki, Allah insanı yaratdıqdan sonra onu tam şəkildə azad buraxmışdır. Beləliklə də, insan bütün işlərində tam azaddır və Allah onun işlərində heç bir rol oynamır. Şübhəsiz ki, bu nəzəriyyə də tövhidlə uyğun gəlmir. Çünki tövhid bizlərə öyrədib ki, aləm Allahın mülküdür, heç bir şey onun hakimiyyətindən kənar deyil. Hətta insan iradəsinin azad olduğuna baxmayaraq, eyni zamanda, insanların bütün əməlləri onun qüdrət və hakimiyyət çərçivəsindədir. Əgər belə olmasa, onda Allaha şərik qoşmuş olarıq. Daha aydın desək, biri bütün yeri-göyü xəlq etmiş böyük Allah, digəri isə kiçik Allah. Brinci Allah insanın işlərində rol oynamadığına görə, biz .müstəqil, azad, iradəsi öz əlində olan insanı ikinci Allah kimi təsəvvür etmiş olarıq

Vasitə» nəzəriyyəsi: Məcburiyyət nəzəriyyəsi ilə təfviz, yəni tam azadlıq nəzəriyyəsi» (٢ .arasında olan hədd «vasitə» həddi, vasitə nəzəriyyəsi adlanır

Əsas məsələ budur ki, biz bu iki məsələ arasında, yəni insan iradəsinin azadlığı və eyni zamanda Allahın insanın əməllərinə hakimiyyət etməsi arasında zidiyyət təsəvvür etməliyik. Əsas məsələ budur ki, biz həm tam şəkildə Allahın ədalətini və insan iradəsinin azadlığını, həm də Allahın bütün aləmə, kainata, hətta insanın əməllərinə hakimiyyət etdiyini qəbul edək. Bu məsələni üsuliddində vasitə «nəzəriyyəsi» adlandırırlar. (Yəni, məcburiyyət və tam azadlıq nəzəriyyələri arasındakı hədd. Yəni, insan öz əməllərində məcbur deyil, lakin tam şəkildə azad da deyil. Allahın da onun (.rəftarında rolu və hakimiyyəti var

.Bu bəhs bir az qarışıq və çətin olduğu üçün, onu sadə bir misalla açıqlayırıq

Təsəvvür edin ki, siz trolleybus sükanının arxasında əyləşib maşını idarə edirsiniz. Əgər elektrik cərayanı bir anlıq kəsilsə, trolleybus dərhal hərəkətindən qalacaq. Elektrik olan zaman siz azadsınız: istədiyiniz yerdə maşını saxlaya bilərsiniz, istədiyiniz qədər dayana bilərsiniz, hansı sürətlə istəsəniz, hərəkət edə bilərsiniz. Lakin sizin bu azadlığınıza baxmayaraq elektrik cərayanına nəzarət edən şəxs istədiyi vaxt sizi .hərəkətdən saxlaya bilər. Çünki trolleybusun bütün hərəkətləri elektrikdən asılıdır

Bu misala diqqət etdikdə sürücünün azad, ixtiyar sahibi olduğu ilə yanaşı onun başqa bir şəxsdən asılı olduğunu da anlayırıq. Bu iki işin bir-biri ilə heç bir ziddiyyət və ixtilafı

.yoxdur

:Başqa bir misal

Təsəvvür edin ki, bir nəfərin əli xəstəlik və ya gözlənilməz bir hadisə nəticəsində keyimiş və daha hərəkət etməyə qüdrəti qalmamışdır. Lakin əgər ona elektrik cihaz ilə kömək etsələr, əli hərəkətə gələr. Onun əlini elektrikin köməyi ilə hərəkətə gətirdikdə əgər həmin şəxs bu anda bir cinayət törətsə, məsələn, bir nəfəri bıçaqla vursa, şübhəsiz bu şəxs törətdiyi cinayətə görə məsuliyyət daşımalıdır. Cünki o anda onun həm qüdrəti olub, həm də ixtiyarı öz əlində idi. Azad şəxs də gördüyü işlər müqabilində məsuliyyət daşıyır. Buna baxmayaraq, həmin şəxsə qüdrət verən, əlini hərəkətə .gətirən elektrikdir

.İndi isə öz bəhsimizə qayıdaq

Allah bizə qüdrət, qüvvət vermiş, huş, ağıl, düşüncə bəxş etmişdir. Bunlar hər an Allah tərəfindən bizə verilir və arası kəsilmir. Əgər onun lütf və mərhəməti bir an bizdən kəsilsə, məhv olarıq. Əgər biz bir iş görürüksə, onun bizə bəxş etdiyi qüdrətlə görürük. Hətta azadlığımız da bizə onun tərəfindən verilib. Yəni, o bizim azad olmağımızı və bu .yolla təkamülə yetişəcəyimizi istəmişdir

Buna əsasən, biz iradəmizin azad və muxtar olması ilə yanaşı Allahın ixtiyarındayıq. Biz özümüz qüdrət sahibi olmağımıza baxmayaraq, yenə də ona tabeyik. Onsuz biz puç olarıq. Bu əqidə, bu nəzəriyyə yaxud «vasitə» nəzəriyyəsi adlanır. Yəni, nə bir bəndəni

Allaha tay və şərik qərar veririk, nə də bəndələri öz əməllərində məcbur bilirik. (Diqqət (.edin

Şiə imamlarından «məcburiyət və «azadlıq» nəzəriyyələri arasında başqa bir hədd varmı» deyə soruşduqda buyururlar ki, bəli! Bu iki nəzəriyyə arasında başqa bir hədd .vardır ki, onların yerdən göyəcən fərqləri var

Quranda «məcburiyyət» və «ixtiyar» məsələsi(٣

Qurani-Məcid öz gözəl ayələri ilə insan iradəsinin azad olduğunu açıqlamışdır. Bu məsələ Quranın yüzlərlə ayəsində gözə çarpır. Bu ayələri bir neçə dəstəyə bölmək :olar

A)Əmr və nəhy, vacib və haram, məsuliyyətləri bəyan edən ayələrin hamısı insan iradəsinin azad olduğuna şahiddir. Əgər insan öz əməllərində məcbur olarsa, onda bu .ayələrin heç bir mənası olmaz

B)Günahkarları tənə, möminləri isə mədh edən ayələr də insanın azad və ixtiyar sahibi olduğuna bir sübutdur. Çünki məcburiyyət olan yerdə tənə və tərifin heç bir mənası .yoxdur

V)Qiyamət gününün sorğu-sualı, hesab kitabı, Cənnət və Cəhənnəmdən söhbət edən ayələr də insanın azad olduğuna daha bir sübutdur. Çünki məcburiyyətlə bu deyilənlər uyğun gəlmir. Əksinə, məcburiyyət olduqda günahkarları cəzalandırmaq açıq-aşkar .zülm olar

«.Q) «Kullu nəfsin kəsəbət rəhinəh

Hər kəs öz əməlinin girovudur.» «(Hərə öz əməlinin girovunu alacaqdır.)», «Hər kəs öz» «.əməlinin girovudur» kimi ayələr də açıq-aşkar insan azadlığından danışırlar

d) «Biz ona haqq yolu göstərdik. İstər (nemətlərimizə) minnətdar olsun, istər nankor .(bu onun öz işidir.)» kimi ayələr də insanın azad olduğunu göstərən sübutlardan biridir

Quranda bir sıra ayələr də vardır ki, bunlar «vasitə» nəzəriyyəsini isbat edirlər.Lakin bəzi düşüncəsiz insanlar bu ayələri insanın məcbur olduğuna dair sübut və şahid

gətirmişlər. O cümlədən «(Ey insanlar! Onu da bilin ki,) Allah istəməsə, siz heç nə istəyib .iradə edə bilməzsiniz.» ayəsini buna nümunə gətirmək olar

Bu və bu kimi digər ayələr insanın rəftar və iradəsində məcbur olduğunubildirmir. Əksinə, bu cür ayələr bizə bunu çatdırır ki, insanın irədəcə azad və ixtiyar sahibi olmasına baxmayaraq, eyni zamanda o, Allahın nəzarəti altındadır. Bu barədə ətraflı .məlumat bir az bundan əvvəl söylənilmişdir

### Fikirləşin və cavab verin

?Təfviz» (tam azadçılıq) nəzəriyyəsinin məqsəd nədir və bu nəzəriyyənin nə iradı var» .١

İmamlardan öyrəndiyimiz «əmrun bəynəl əmrəyn (vasitə)» nəzəriyyəsini aid bir misal.٢ .çəkməklə izah edin

?Məcburiyyət və ixtiyar nəzəriyyələri Quranda necə mövqe tutur.٣

Əgər məcburiyyət nəzəriyyəsini qəbul etsək, qiyamət gününün hesab-kitabı, sorğu-.۴ ?sual, Cənnət və Cəhənnəm nə mövqe daşıyar

Ey insanlar! Onu da bilin ki,) Allah (bir şeyi) istəməsə, siz onu istəyə bilməzsiniz»,)» .۵ ?ayəsi məcburiyyət nəzəriyyəsinə dəlil, sübut və şahid ola bilərmi

## IX DƏRS

### Hidayət və azğınlıq Allahın əlindədir

.Hidayət və azğınlığın növləri.١

Məsələn, bir nəfər sizə əlində tutduğu bir ünvanı göstərərək ünvanı tanımadığını və sizdən kömək istədiyini bildirir. Sizin ünvanı ona tanıtdırmaq üçün iki yolunuz var. Biri odur ki, ona qoşulub istədiyi yerə gətirib ünvanı ona göstərəsiniz. İkincisi isə odur ki, ünvanın yerini, nişanəsini deyib onu tanış edəsiniz. Siz hər iki surətdə onu öz məqsədinə çatdırmış olursunuz. Lakin bu iki yol arasında fərq var. Birinci halda siz ünvanı ona göstərməkdən

əlavə, onu ötürüb məqsədinə çatdırmısınız. İkinci halda isə yalnız ünvanın yerini və .nişanələrini söyləmisiniz

Quranın bir çox ayələrində, eləcə də islami hədislərdə gəlmiş «hidayət» sözü bu iki .mənanın hər ikisində işlədilmişdir

Bundan əlavə bəzən yalnız təşrii məna daşıyır. Yəni, qanun və fərmanlar vasitəsilə həyata keçir. Bəzən isə təkvini məna daşıyır. Yəni, təbii yollarla, xilqətin qurduğu vücudla həyata keçir. Necə ki, bir nütfə kamil bir insana tərəf hidayət olur və insana çevrilir. Hidayətin bu iki mənası da Quran və hədislərdə gəlmişdir. İndi ki, hidayətin (eləcə də onunla qarşı duran zəlalət və azğınçılığın) növlərini öyrəndik, əsl bəhsimizə .qayıdırıq

Quranın çox ayələrində gəlmişdir ki, hidayət və azğınlıq Allahın işidir. Şübhəsiz ki, insana düz yolu göstərən odur. Çünki o, peyğəmbərlər göndərməklə və asimani kitabları nazil etməklə yolu insanlar üçün müəyyən etmişdir. Ancaq məqsədə çatdırmaq, özü də məcburi şəkildə, yəqin ki, insan iradəsinin azadlığı ilə uyğun gəlmir. Lakin məqsədə çatmaq üçün lazım olan qüvvələr Allah tərəfindən bizə verildiyi üçün və bu işdə bizə o kömək etdiyinə görə deyirik ki, hidayət Allahın əlindədir. Belə ki, Allah .bütün başlanğıcları insan üçün hazırlayaraq onları bəşərin ixtiyarında qoymuşdur

Mühüm bir sual.۲

Quranda hidayə və zəlalətin yalnız Allahın əlində olduğuna işarə edən ayələrlə .rastlaşırıq

Məsələn, «İbrahim» surəsinin ۴-cü ayəsində deylilir: «Allah kimi istəsə hidayət edər, kimi «.də istəsə yolundan azdırar. O, yenilməz qüdrət və hikmət sahibidir

Bəzi insanlar Quranın digər ayələrini nəzərə almamaqla belə sual verirlər ki, əgər insanı hidayət edən, yaxud yolundan azdıran Allahdırsa, bəs onda insanların nə günahı var? Lakin diqqəti cəlb edən budur ki, Quran ayələrini bir-biri ilə əlaqələndirib onun əsl, həqiqi mənasını ələ gətirmək lazımdır. Biz indi hidayət və zəlalət barədə olan ayələrin bir neçəsini sizin nəzərinizə çatdırırıq. Bu ayələri yuxarıda deyilən ayə ilə müqayisə

.edib lazımi nəticəyə gələ bilərsiniz

.(Allah zalimləri (haqq yoldan) azdırar.» (İbrahim,۲۷»

Allah (küfr etməklə) həddi aşan, şəkk içində olan kimsəni belə yoldan azdırar.» (Qafir,»
.(Mumin,۳۴

.(Bizim uğrumuzda cihad edənləri öz yollarımıza qovuşduracağıq.» (Ənkəbut, ۶۹»

Yuxarıdakı ayələrdə gördüyümüz kimi, Allahın istək və iradəsi heç də hesabsız deyildir. Nə bir nəfər hikmətsiz və hesabsız hidayət olunur, nə də bir nəfər hesabsız yolundan azdırılır. ƏgərAllah onun yolunda cihad edən, çətinliklərlə mübarizəyə qalxan, öz nəfsi ilə mübarizə edən, düşmənlərlə üz-üzə gələn bir şəxsə onu hidayət edəcəyini vəd .edirsə, bu ədalətin eynidir

Əlbəttə ki, zülm, şəkk və şeytani hərəkətlərdə həddini aşmış insanları Allah hidayət etməz. Nəinki, təkcə hidayət etməz, əksinə, onu yolundan azdırar. Bu şəxslərin qəlbləri, gördükləri bu işlər nəticəsində daşa dönmüşdür və onlar bir daha düz yola hidayət oluna bilməzlər. Əgər Quran ayələrində «Allah istədiyini yoldan azdırar» kimi ifadələrlə rastlaşırıqsa, mənası budur. Allah əməllərimizin nəticəsni bizim öz .(ixtiyarımıza qoymuşdursa, bu da eyni ədalətdir (Diqqət edin

?Günah etməyin səbəbi Allahın əzəli və əbədi elmidirmi.۳

Məcburiyyət və ixtiyar barədə sonuncu məsələ budur ki, məcburiyyət əqidəsində olan insanlar özlərini paklığa çıxarmaq üçün bəhanə kimi Allahın onların günah etmələrinə səbəb olan əbədi elmini göstərirlər. Onlar deyirlər ki, Allah filan şəxsin filan vaxda filan ?günahı edəcəyinibilirdi, ya yox

Əgər cavab versək ki, yox, bu Allahın elmi ilə uyğun gəlmir. (Çünki Allah hər şeyi bilir.) Əgər desək ki, bəli bilirdi, deyəcəklər ki, onda mütləq o şəxs həmin günahı etməlidir. .Yoxsa, Allahın elmi düz çıxmaz

Deməli, Allahın elminin düzgün çıxması üçün bütün günahkarlar günahları, möminlər .isə itaətlərini etməyə məcburdurlar

Onlar özlərini sudan quru çıxarmaq üçün bu bəhanəyə əl atmışlar, ancaq bir şeyi nəzərə almayıblar ki, Allah filan şəxsin filan günahı edəcəyini bilsə də, bu, günahkar öz günahında məcburdur mənasına gəlməz. Allah bilir ki, filan şəxs filan günahı mömin də itaətini öz ixtiyar və iradəsi ilə görəcəkdir. Yəni, Allah bu işləri (günah və itaət edəcəyimizi) bizim öz ixtiyarımızla görəcəyimizi bilir. Əgər məcbur olsaq, onda Allahın elmi düzgün çıxmaz. (Deməli, Allahın elminin düzgün çıxması üçün tək çarəmiz insanın .(iradəcə azad və ixtiyar sahibi olduğunu etiraf etməkdir.) (Diqqət edin

Bu məsələni aşkar bir misalla daha da açıqlayaq. Fərz edin ki, bir sinifdə tənbəl bir şagird var. Sinfin müəllimi topladığı təcrübə nəticəsində bilir ki, həmin şagird imtahanı verə bilməyəcək. Buna yəqini də var ki, o, sinifdə qalacaq. İmtahan zamanı çatdıqda həmin şagird imtahanı verə bilmir və sinifdə qalır. İndi həmin şagird deyə bilərmi ki, ey müəllim, sənin mənim imtahanı verə bilməyəcəyim haqdakı biliyin məni imtahandan kəsilməyə məcbur etdi? Yaxud məsum bir şəxs filan cinayətin baş verəcəyini bilir. Cinayət baş verdikdə cani məsuma deyə bilərmi ki, sənin elmin məni cinayət törətməyə məcbur etdi? Və ya baş verəcək hadisələr haqqında bir az qabaqcadan xəbərdarlıq edən cihazlar barədə hadisə baş verdikdən sonra deyə bilərikmi ki, bu cihazlar bu hadisənin baş verməsinə səbəb oldu? Deməli, belə nəticəyə gəlirik ki, .Allahın elmi heç kəsi öz işində məcbur etmir

### Fikirləşin və cavab verin

.Hidayətin neçə növü var? Açıqlayın.١

.Hidayət və zəlaləti Allaha nisbət verən ayələrdən bir neçə nümunə gətirin.٢

?Allahın birini hidayət edib, digərini yoldan azdırmasının mənası nədir.٣

?Allahın əbədi elmindən məqsəd nədir.۴

.Allahın əbədi elmi insanları öz işlərində məcbur edirmi? Buna dair bir misal gətirin.۵

## X DƏRS

### Allahın ədaləti və insanların cəhənnəmdə əbədi qalması məsələsi

Bildiyimiz kimi, Quranın bir çox ayələrində Allah kafir və bir sıra günahkar insanlara Cəhənnəmdə əbədi qalacaqlarını vəd etmişdir. Məsələn, «Tövbə» surəsinin ۶۸-ci ayəsində deyilir: Yəni, «Allah münafiq kişi və qadınlara, kafirlərə içində əbədi qalacaqlarıcəhənnəm odu vəd etmişdir.» Eləcə də, Allah tərəfindən mömin kişi və qadınlara Cənnətdə əbədi qalacaqları vəd edilmişdir. Məsələn, həmin surənin ۷۲-ci ayəsində oxuyuruq: Yəni, «Allah mömin kişi və qadınlara (ağacları) altından çaylar axan .cənnətlərdə əbədi qalacaqlarını vəd etmişdir»

Burada belə bir sual yaranır; necə olur ki, bir nəfər ۸۰, ya çox olsun, ۱۰۰ il ömür sürür və bir neçə pis iş görür, lakin qiyamət günü milyon illərlə, yaxud əbədi olaraq onun ?cəzasını çəkməli olur

Bu sual yalnız cəhənnəmin əbədi əzabına aiddir. Behiştdə əbədi qalmağa gəlincə isə, bu sualın mənası yoxdur. Çünki mükafat (Cənnət mükafatı) nə qədər çox olarsa, bir o qədər Allahın rəhmət və fəzlinin çoxluğunun nişanəsidir. Lakin pis əməllərin müqabilində insan əbədi əzaba düçar olması necə? Bu Allahın ədaləti ilə uyğun gəlirmi? Allahın ədaləti ilə günahların cəzasını çəkmək arasında tarazlıq ?olmamalıdırmı

:Cavab

:Bu sualın cavabını bilmək üçün bir neçə mətləbi nəzərə almalıyıq

A)Axirət dünyasının əzab və cəzası bu dünyanın cəzası kimi deyildir. Məsələn, bir nəfər dünyada oğurluq edibsə, onu bir müddət zindanda saxlayıb sonra azad edirlər. Qiyamət cəzası isə əməllərin (günahların) təsir və xüsusiyyətinə əsasən verilir. Başqa sözlə desək, günahkarların axirətdə çəkəcəyi əzabların hamısı onların öz əməllərinin .nəticəsidir ki, indi onları əhatə etmişdir

Qurani- Məcid bu məsələni çox gözəl şəkildə bəyan etmişdir: Yəni, «Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Siz ancaq etdiyiniz əməllərin cəzasını çəkəcəksiniz.» .((Yasin, ۵۴

Bu həqiqəti sadə bir misalla aydınlaşdıra bilərik. Təsəvvür edin ki, bir nəfər narkotik maddələr qəbul etməyə və ya spirtli içkilər içməyə adət etmişdir. Ona deyiləndə ki, bunlar sənin ziyanınadır, qulaq asmır. Bir neçə həftə vəya bir neçə ay öz kefi ilə məşğulolduqdan sonra yavaş-yavaş mədəsi, ürəyi ağrımağa, əsəbləri pozulmağa başlayır. Sonra ömrünün axırınadək bu xəstəliklərdən əziyyət çəkir, gecə-gündüz çığır-bağır salır, ah-nalə edir. İndi deyə bilərikmi, bu şəxs bir neçə həftə və ya bir neçə ay günah işlətmişdir, bəs indi nə üçün ömrünün axırınadəkonun əziyyətini çəkməli olur? Dərhal cavab verilir ki, bu onun öz əməlinin nəticəsidir. Hətta o, Nuh(ə) qədər də ömür sürsə, yenə ömrünün sonuna kimi bu əziyyəti çəkməlidir. Ona deməliyik ki, bu .sənin öz əlində hazırladığın bəladır

Qiyamət gününün əzabları da bir cəhətdən buna bənzəyir. Buna görə də, Allahın .ədalətinə heç bir qüsur gətirmir

B)Bəziləri belə güman edirlər ki, günahın cəzasının müddəti günahın müddəti qədər olmalıdır. Bu səhv və yalnış bir fikirdir. Çünki günahla cəza arasında zaman rabitəsi .yoxdur. Cəza günahın xüsusiyyət və nəticəsinə görə verilir

Məsələn, bir şəxs günahsız bir insanı qətlə yetirir və bir sıra dünyəvi qanunlara əsasən onu ömürlük ölümə məhkum edirlər. Baxıb görürük ki, cinayət az bir zamanda baş verib, lakin cani ömürlük zindana məhkum olunub. Bu işi heç kim zülm hesab etmir. Çünki bu işdə saniyə, dəqiqə, saat, ay rol oynamır. Əsas məsələ günahın .xüsusiyyətidir

V)Cəhənnəmdə həmişəlik qalıb əbədi əzab çəkmək yalnız bütün nicat qapılarını öz üzlərinə bağlamış və bilərəkdən fəsada, nifaqa doğru gedən insanlara aiddir. Günah bu insanlara o qədər təsir edib ki, onların bütün vücudunu özündə qərq etmiş, əslində .onları günahın özünə gətirib çıxarmışdır

Qurani- Kərim bunu öz gözəl ifadəsi ilə belə bəyan edir: «Bəli, günah qazanan və qazandığı günahkarlarla əhatə olunan şəxslər cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar..» (Bəqərə, ٨١). Bu cür insanlar Allahla əlaqəni tamamilə kəsmiş, nicat qapılarının hamısını üzlərinə bağlamışlar. Bu cür insanlar bilərəkdən öz qanadlarını sındırmış, uçmağa imkanı olmayan və həmişə yerdə qalmağa məcbur olmuş quşlara .bənzəyirlər

Bu üç mətləbi nəzərə aldıqda məlum olur ki, bir sıra münafiq, kafir insanlar üçün nəzərdə tutulmuş əbədi cəhənnəm əzabı heç də Allahın ədaləti ilə zidd deyildir. Bu, onların öz gördükləri işlərin nəticəsidir. Peyğəmbərlər onlara xəbərdarlıq etmişdilər ki, bu işlərin çox acınacaqlı nəticəsi vardır. Əgər bu insanlar cahil olmuş və peyğəmbərlərin sözü onların qulağına çatmamışdırsa, şübhəsiz ki, onlar bu cür əzaba .düçar olmayacaqlar

Xatırladaq ki, Quran ayələrindən və rəvayətlərdən belə məlum olur ki, Allahın rəhməti həddən artıq geniş olduğuna görə, günahkarların çoxu bağışlanacaqdır. Bəziləri şəfaət vasitəsi ilə, bəziləri bağışlanma və əfv vasitəsi ilə, bəziləri gördükləri kiçik yaxşı əməllərin Allah tərəfindən böyük hesab olunması vasitəsi ilə, bəziləri də bir müddət cəhənnəmdə qalıb, təmizləndikdən sonra bağışlanıb cənnətə gedəcəklər. Təkcə bir dəstə qalır ki, onlar da haqqla həddən artıq düşmənçilik etdiklərinə, zülm, fəsadda öz .həddlərini aşaraq talelərini qaraltdıqlarına görə, cəhənəmdə əbədi qalmalı olacaqlar

**Fikirləşin və cavab verin**

?Bəzi şəxslər cəhənnəmdə əbədi qalmağı Allahın ədaləti ilə necə zidd bilirlər.١

Axirət aləminin cəzaları bu dünyanın cəzaları kimidirmi? Əgər elə deyilsə, bəs.٢ ?necədir

?Ədalət günahın cəzasının onun zamanı ilə bərabər olmasını tələb edirmi.٣

?Cəhənnəmdə əbədi qalma kimlərə aiddir.۴

?Kimlər Allahın rəhmətinə nail olub bağışlanacaqlar.۵

## III FƏSİL PEYĞƏMBƏR TANIMA HAQQINDA ON DƏRS

### I DƏRS

#### İnsanların ilahi rəhbərlərə (peyğəmbərlərə) olan ehtiyacı

İnsan elminin məhdudluğu

Bəziləri soruşa bilər: peyğəmbərlərin insanları düz yola dəvət etmələri lazımdırmı? Məgər insan öz həqiqətlərini anlaya bilmirmi? Məgər elmin inkişaf etməsi sirlərin açılmasına və həqiqətlərin kəşf olunmasına kömək etmirmi? Bundan əlavə, onu da xatırladaq ki, peyğəmbərlərin insanlara öyrətdiklərini bəzən öz ağlımızla dərk edir, bəzən isə etmirik. Birinci halda (ağlımız peyğəmbərlərin dediklərini anladığı halda) peyğəmbərlərin gəlməsinə ehtiyac yoxdur. (Çünki onların dediklərini öz ağlımızla dərk edirik.) İkinci halda isə biz ağlımızın dərk etmədiyi şeyləri qəbul edə bilmərik. Başqa bir tərəfdən, peyğəmbərlərin dediklərini qəbul etmək üçün insan özünü tam şəkildə onların ixtiyarına buraxmalıdır. Məgər bu düzgündürmü? İnsan peyğəmbərlərin sözünü kor-koranə qəbul edə bilərmi?Məgər peyğəmbərlər bizim özümüz kimi ?insanlar deyillər? Özümüzü özümüz kimisinin ixtiyarına verməyin nə mənası var

:Cavablar

Bir neçə məsələni nəzərə almaqla bütün verilən sualların cavabı və peyğəmbərlərin .insanların həyatındakı mövqeyi məlum olur

Bilməliyik ki, bizim elmimiz məhduddur. Bəşər elmində bu qədər inkişafın olmasına(١

baxmayaraq, yenə də bildiklərimizin bilmədiklərimizə olan nisbəti bir damla suyun dəryaya olan nisbəti kimidir. Bəzi böyük alimlərin dili ilə desək, bizim bütün bildiklərimiz dünya adlı

kitabın əlifbasıdır. Başqa sözlə, bizim ağlımızın anlayış çərçivəsi elə bir məntəqədir ki, elm və bilik şüası onu işıqlandırır, bizim isə onun xaricindən xəbərimiz yoxdur. Peyğəmbərlər gəlib bu məntəqəni insanın ehtiyacı olan qədər işıqlandırır. Əslində bizim ağlımız böyük bir projektor, peyğəmbərlər və səmavi vəhy isə bütün dünyanı işıqlandıran günəşdir. Güclü bir projektora malik olan şəxs deyə bilərmi ki, mənim ?günəş işığına ehtiyacım yoxdur

Daha açıq desək, həyata aid məsələləri üç hissəyə bölmək olar, ağlasığan, .ağlasığmayan və məchul məsələlər

Peyğəmbərlər heç vaxt ağlasığmaz, yəni ağıl və düşüncənin əksinə olan söz deməmişlər. Əgər deyiblərsə, peyğəmbər olmamışlar. Əksinə, onlar məchulları anlamaqda bizə kömək etmişlər. Bu da bizim üçün çox mühümdür. Buna əsasən, insanın ağlı olan yerdə və elmin bu qədər inkişaf etdiyi bir vaxtda «insanların peyğəmbərə ehtiyacı yoxdur» deyən şəxslər nə bəşər elminin çərçivəsini tanıyırlar, nə də peyğəmbərlərin risalətinin mənasını anlayırlar. Bu, birinci sinifdə əlifbanı öyrənmiş uşağın «mən hər şeyi bilirəm, dərs oxumağa və müəllimə ehtiyacım yoxdur» deməsinə ?bənzəyir. Bu söz əsassız deyilmi

Bunu da deyək ki, peyğəmbərlər təkcə müəllim olmamışlar. Onların rəhbərlik .məsələləri barədə gələn dərslərdə ətraflı söhbət edəcəyik

Heç kim iddia etmir ki, insan özünü özü kimi olan başqa birisinin ixtiyarına verməlidir.(٢ Məsələ burasındadır ki, peyğəmbərlərin səmavi vəhy, yəni, Allahın sonsuz olan elmi ilə rabitələri vardır. (Bunu gələn dərslərdə isbat edəcəyik.) Bu rabitəni biz qəti və möhkəm dəlillərlə tanımalıyıq. Bu surətdə onların dediklərini, təlim-tərbiyələrini can-başla qəbul .etməliyik

Əgər xəstə bir şəxs ona ürəyi yanan və öz ixtisasında mahir olan bir həkimin yazdığı reseptə əməl edərsə, səhv işmi görmüş olar? Peyğəmbərlər də böyük ruh .həkimləridir

Müəllimin dedikləri ağlımıza uyğun gələrsə, onu qəbul etməyin nə qəbahəti var? .Peyğəmbərlər də, bəşərin böyük məllimləridir

Yaxşısı budur ki, biz peyğəmbərlərin gəlməsinin lazım və zəruri olduğunu sübut edən .dəlilləri daha dəqiq araşdıraq

### İnsanların üç səbəbə görə peyğəmbərlərə ehtiyacı var

Təlim-tərbiyə cəhətdən olan ehtiyac.١

Əgər bir nəfər xəyalında nurdan hazırlanmış və saniyədə ٣٠٠٠٠٠ kilometr məsafəni qət edən bir miniyə minib geniş asimanda dövr etsə, bu kainatın təkcə bir guşəsini .müşahidə etmək üçün onda Nuh ömrü lazımdır

Kainatbu qədər genişliyi ilə, yəqin ki, əbəs yerə yaradılmayıb. Allahı tanıma bəhslərində demişik ki, bu dünyanın yaranmasında Allaha heç bir fayda, mənfəət gəlmir. Çünki o, hər cəhətdən kamil və ehtiyacsız bir varlıqdır. Onunnöqsanı olmadığından, bu dünyanı xəlq etməklə həmin nöqsanı aradan qaldırmaq istədiyini söyləyə bilmərik . Deməli, Allahın dünyanı yaratmaqda məqsədi başqalarına fayda və mənfəət vermək, məxluqatı kamala çatdırmaqdır. Necə ki, günəş bizə ehtiyacı olmadığı halda yerə saçır və bununyalnız biz faydası var. Bizim isə günəşə bir xeyrimiz .yoxdur

Bundan əlavə, bizim biliyimiz kamilliyə yetişmək üçün kifayət edərmi? Biz bu dünyanın sirlərindən nə qədərini bilirik? Ümumiyyətlə, həyatın mənası nədir? Bu dünya nə vaxtdan yaranıb? Heç kim bu suallara düzgün cavab verə bilmir. Bu dünya nə vaxtadək davam edəcəkdir? Buna da düzgün bir cavab verən tapılmır. İqtisadi və ictimai həyat barədə bəşər alimlərinin hər birinin öz nəzəriyyəsi vardır. Məsələn, bir qrupkapitalizmi, başqa bir qrup sosializm və kommunizmi tövsiyə edir. Üçüncü qrup isə hər ikisinin ziyanlı olduğunu bildirərək heç birini bəyənmir. Həyatın digər məsələlərində də alimlər arasında bu cür nəzəri ixtilaflar çoxdur. Bu yerdə insafla etiraf etməliyik ki, insanın yaranışının əsl məqsədi olan təkamülə yetişmək üçün düzgün və həqiqətlə uyğun olan təlim-tərbiyəyə ehtiyacı var. Bu təlim-tərbiyə elə olmalıdır ki, bu uzun məsafədə bizə mənzil başına çatmaqda kömək

olsun. Bu da yalnız Allahın elmi ilə, yəni peyğəmbərlərə göndərdiyi vəhylər nəticəsində mümkün olur. Məhz buna görə də, bizi xəlq etmiş Allah bizə yolu qət etmək üçün (.həmin elmi verməlidir. (Bu da ancaq peyğəmbərlərin vasitəsi ilə mümkündür

İctimai və əxlaqi cəhətdən rəhbərə olan ehtiyac.۲

Bildiyimiz kimi, insanın vücudunda ağıl və düşüncədən başqa bir sıra istək və meyllər də vardır. Məsələn, özümüzü sevmək meyli, hirs və qəzəb meyli, şəhvət və digər meyllər. İnsan öz (heyvani) meyllərinin qarşısını almaq üçün hər tərəfdən, hər nəzər və cəhətdən kamil olmalıdır. O şəxs rəftarı , söhbəti, hərəkətləri ilə əsl əxlaqı, tərbiyəni, mənəviyyatı insanlara öyrətməlidir. Məsum peyğəmbərlədən başqa kim bu işin öhdəsindən gələ bilər? Məhz buna görə də mehriban və qadir Allah bəşəri bu cür insanlardan məhrum etməmiş və insanlar üçün rəhbər, müəllim, əsl mənada desək, .peyğəmbərlər göndərmişdir

(.Bu bəhsin davamını gələn dərsdə oxuyacaqsınız)

**:Fikirləşin və cavab verin**

Elminiz nə qədər artsa da, yenə bilmədiklərinizin bildiklərinizdən çox olduğunu hiss.۱ (.edirsinizmi? (Bir misal göstərin

Bir nəfərə kor-koranə surətdə itaət etməklə peyğəmbərlərə itaət etməyin fərqini.۲ ?bilirsinizmi

?Tanımadığımız yolu bələdçisiz getsək, hansı çətinliklərlə üzləşə bilərik.۳

.İnsanların hansı cəhətlərdən peyğəmbərə ehtiyacları olduğunu izah edin.۴

?Bu barədə daha hansı başlıq altında bəhs edəcəyimizi güman edirsiniz.۵

## II dərs

### Qanun təyin etmə nəzərindən peyğəmbərlərə olan ehtiyac

Ötən dərsdə insanların peyğəmbərlərə olan ehtiyaclarının cəhətini, yəni təlim və tərbiyə cəhətindən olan ehtiyacını öyrəndik. İndi isə növbə peyğəmbərlərin insanların

.həyatında ən əsas rolu olan ictimai qanunlarla bağlılığına yetişmişdir

Ötən dərsdə insanların peyğəmbərlərə olan ehtiyaclarının cəhətini, yəni təlim və tərbiyə cəhətindən olan ehtiyacını öyrəndik. İndi isə növbə peyğəmbərlərin insanların

.həyatında ən əsas rolu olan ictimai qanunlarla bağlılığına yetişmişdir

Məlum olduğu kimi, insanların ən böyük və əsas xüsusiyyəti, onların hər bir sahədə qazandıqları uğurların səbəbi ictimai şəkildə yaşamalarıdır. Qətiyyətlə demək olar ki, əgər insanlar bir-birindən ayrı yaşasaydılar, indi onların hamısı fikir, düşüncə, mədəniyyət tərzi nəzərindən eynilə daş dövrünün insanları kimi olardılar. İnsanlara mədəniyyət bəxş ,edən onların elmini bu qədər inkişaf etdirən yalnız ictimai yaşamdır. Məsələn, aya uçuşu təsəvvür etsək, görürük ki, bu, bir, yaxud bir neçə nəfərin səyi nəticəsində yox, milyonlarla alimin min illərlə göstərdiyi səylər, təcrübələr, kəşflər nəticəsində həyata keçmiş bir işdir. Yaxud indiki zamanda mahir və təcrübəli bir həkim özü ölmüş, lakin qəlbi hələ döyünməkdə davam edən insanın ürəyini başqa bir insanın ürəyi ilə əvəz edərək onu ölümdən xilas edərsə, bu minlərlə həkim və cərrahın səyi nəticəsində və onların indiki şagirdlərinin əli ilə həyata keçmiş bir işdir. Əlbəttə, bunu da xatırladaq ki, bu cür ictimai yaşayışın bəzi mənfi cəhətləri

də vardır. Məsələn, bir-birinin haqqını tapdalamaq, bir-birinə təcavüz və zorakılıq ,etmək

hətta bəzən bir-birinə (ölkə-ölkəyə) qarşı müharibə və qırğın törətmək kimi nümunələri

.göstərmək olar. Bu halda qanuna, nizam-intizama olan ehtiyac aydın hiss olunur

:Qanun insanların üç əsas çətinliyini aradan qaldırır

Qanun hər bir insanın cəmiyyət qarşısında, eləcə də cəmiyyətin hər bir insan(۱ qarşısında vəzifəsini müəyyən edir. İstedadları çiçəkləndirərək səyləri bir-biri ilə .uyğunlaşdırır

Qanun insanların öz vəzifələrinə əməl etmələri üçün lazım olan nəzarətin(۲ .yaranmasına yol açır

Qanun insanların bir-birinin hüququna təcavüz etməsinin qarşısını alaraq hər cür(۳ hərc-mərcliyin, çəkişmələrin baş verməsinə mane olur və lazım olduğu vaxt caniləri .münasib cəzaya məhkum edir

İndi görək, insanların ehtiyacı olan qanunları kim daha gözəl təyin edə bilər? Bu şərtlə ki, yuxarıda deyilən üç bəndin hamısına riayət olunsun. Bu məsələni daha yaxşı .açıqlamaq üçün sadə bir misaldan istifadə edirik

İnsan cəmiyyətini uzun bir qatara, qanunları isə həmin qatarı idarə edən lokomotivə bənzətmək olar. Qanun bütün yol boyu çəkilmiş və qatarın məqsədini təyin edən :relsdir. Məlumdur ki, yaxşı dəmir yolu aşağıdakı xüsusiyyətlərə malik olmalıdır

.A)Qatarın keçəcəyi yollar qatarın bütün ağırlığını saxlaya bilməlidir

B)İki relsin arasında olan məsafə qatarın təkərlərinin məsafəsi ilə uyğun gəlməlidir. .Həmçinin, yol boyu tunellərin hündürlüyü qatarın hündürlüyünə münasib olmalıdır

.V)Qatarın əyləc sistemi yollardakı eniş-yoxuşun öhdəsindən gələ bilmədir

Q)Yollarda baş verə bilən hadisələr dəqiq hesablanıb ehtimal edilməlidir ki, qatar .bütün məsafəni salamat gedə bilsin

Bu misalı nəzərə alaraq insan cəmiyyətinə qayıdırıq. İnsanlar üçün qanun təyin etmək :istəyən şəxs aşağıdakıxüsusiyyətlərə malik olmalıdır

A)Müxtəlif insanları yaxşı tanımalı, onların bütün istək, meyl və ehtiyaclarından agah .olmalıdır

B)İnsanlarda olan bütün dəyər və istedadları nəzərə alaraq onların çiçəklənməsi üçün .qanuntəyin etməlidir

V) Cəmiyyətdə baş verən hadisələri, eləcə də onlara qarşı göstərilə biləcək .müqavimətləri qabaqcadan bilməlidir

Q)Cəmiyyətdən heç bir şəxsi mənafe güdməməli və qanun təyin edən zaman özünün .və ya yaxın adamlarının xeyrini düşünməməlidir

.D)Gələcəkdə həyata keçəcək inkişaf və geriləmələrdən xəbərdar olmalıdır

.E)Son dərəcə səhvsiz, nöqsansız və eybsiz olmalıdır

J)Nəhayət, qanun təyin edən şəxs cəmiyyətdəki qüvvələrin heç birinin təsiri altında olmamalı, heç kimdən qorxmamalı, eyni zamanda bütün insanlara qarşı mehriban və .ürəyiyanan olmalıdır

### ?Kim bu xüsusiyyətlərə malikdir

İnsan qanun təyin edənlərin ən yaxşısı ola bilərmi? İndiyədək bir nəfər belə olsun, insanı yaxşı tanıyıbmı?Əsrimizin böyük alimlərindən biri insan barədə geniş bir kitab .yazaraq həmin kitabı «İnsan- tanınmamış varlıq» adlandırmışdır

?İndiyədək insanın bütün meyl və istəkləri kəşf olunubmu

Adi insanlar arasında cəmiyyətdən şəxsi mənfəət güdməyən bir şəxs tapa ?bilərsinizmi

?Allahdan başqa insanın cismani və ruhani ehtiyaclarını bilən varmı

?İnsanlar arasında səhv və nöqsanı olmayan, bəşərə lazımlı bir şəxs tanyırsınızmı

Deməli, Allah və onun vəhyini qəbul edən şəxsdən (peyğəmbərdən) başqa, heç kim .qanunverici ola bilməz

Bununla da belə nəticəyə gəlirik ki, insanları təkamül və səadətə qovuşmaq üçün xəlq etmiş Allah onların hidayəti üçün bir sıra qanunlar və rəhbərlər təyin edərək insanlara .çatdırmalıdır

Əgər camaat qanunun Allah tərəfindən olduğunu bilsə, şübhəsiz ki, xatircəmlik və arxayınlıqla ona əməl edəcəkdir. Başqa sözlə desək, bu arxayınçılıq qanunun icra .olunacağını tam şəkildə təmin edir

### Tövhidlə nübüvvətin əlaqəsi

Xatırlatmaq lazımdır ki, yaranışda olan nizam-intizamın özü də peyğəmbərlərin olması .və onların vəzifəsinə açıq-aşkar bir sübutdur

İzah: Maraqlı və heyrətli yaranışın quruluşunda azacıq araşdırma apardıqda məlum olur ki, Allah məxluqatın ona olan ehtiyaclarının heç birini əsirgəməmişdir. Məsələn, ,əgər o

bizə görmək üçün göz veribsə, onu qorumaq üçün qaş və kiprik də vermişdir. Gözü həmişə rütubətli saxlamaq üçün onda göz yaşı xəlq etmişdir. Əgər göz qurusa, bu gözünişdən düşməsi ilə nəticələnər. Bundan əlavə, gözün içində olan kiçik bir dəliyin vasitəsi ilə gözün artıq yaşları burna tökülür. Əgər bu dəlik olmasaydı, artıq və əlavə göz yaşlarının hamısı insanın sifətinə tökülərdi. Göz qapaqlarını elə həssas və dəqiq yaratmışdır ki, onlar güclü və zəif işığa qarşı öz-özünə kiçilib, böyüyürlər. Bunun vasitəsi ilə işıq axını tənzimlənir və gözə heç bir zərər dəymir. Gözün ətrafında olan kiçik əzələlər başı tərpətmədən gözü o tərəf- bu tərəfə fırlatmağa qadirdirlər. Bununla .da, göz ətrafında olan şeyləri asanlıqla görə bilir

İnsanın bu ehtiyaclarını təmin edən Allah onu rəhbərlərdən və vəhylə rabitəsi olan ?məsum peyğəmbərdən məhrum edərmi

Tanınmış filosof Əbu Əli ibn Sina «Şəfa» kitabında yazır: «İnsanın peyğəmbərlərə olan ehtiyacı qaş və kipriklərin tüklərinin bitməsindən, ayağın altındakı çökəkliyin içəri batmasından daha zəruri və mühüm bir şeydir. Buna görə də ola bilməz ki, Allah o ehtiyacları ödəsin (məsələn, qaşın tükünü bitirsin), lakin insanın peyğəmbərə olan «.ehtiyacını ödəməsin

### Fikirləşin və cavab verin

?İnsan həyatının ən əsas xüsusiyyətləri nədir.١

?Nəyə görə insan qanunsuz yaşaya bilməz.٢

.Qanunun insanların həyatındakı rolunu göstərən sadə bir misal deyin.٣

?Ən yaxşı qanun təyin edən hansı xüsusiyyətlərə malik olmalıdır.۴

?Nə üçün peyğəmbərlər elə insanların özlərindən olmalıdırlar.۵

## III DƏRS

### ?Nə üçün peyğəmbərlər məsumdurlar

(?günahsızdırlar)

Günah və səhvdən uzaq olma

Məlumdur ki, bütün peyğəmbərlər hər şeydən qabaq özünü camaatın gözündə doğrultmalı, camaatın rəğbətini qazanmalı və camaatın ona etimadı olmalıdır. Belə ki, heç kim onun sözlərində yalan, səhv, xilafkarlıq olduğunu ehtimal belə etməməlidir. .Əgər belə olmasa, onun rəhbərlik məqamı aradan çıxacaq

Əgər peyğəmbərlər məsum olmasalar, bəhanə axtaranlar onların səhvlərinə görəcək, həqiqət axtaranlar isə onların dəvətlərinin məğzi aradan qalxdığına görə, onlara tabe olmayacaqlar. Tabe olsalar da, sidqi-ürəklə tabe olmayacaqlar. «Etimad dəlili» adlandırılan bu dəlil peyğəmbərlərin nə üçün məsum olduqları sualına bir cavab, şahid .və sübutdur

Başqa sözlə, necə ola bilər, Allah sərgərdan və laqeyd bir insana itaət etməyi əmr etsin, həmin insan isə səhv, yaxud günah işlətsin? Belə bir vəziyyətdə insanlar onun ardınca gedib itaət etməlidirlərmi? Əgər itaət etsələr, günah və səhvə itaət etmiş olarlar, yox, əgər itaət etməsələr, onda peyğəmbərin rəhbərlik məqamı aradan qalxar. Özü də, peyğəmbərlərin rəhbərlik məqamı başqalarının rəhbərlik məqamından fərqlənir. Çünki bütün insanlar əqidə və məsləklərini onun dediyi sözlərə əsasən tənzimləyir. Məhz buna görə, müfəssirlər (təfsirçilər) «Allaha, peyğəmbərə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin» ayəsinə yetişdikdə deyirlər ki, qeyd-şərtsiz itaət əmri həm peyğəmbərlər, həm də ixtiyar sahiblərinin məsum olduqlarına sübutdur. (İxtiyar sahibləri dedikdə isə imamlar başa düşülür). Əgər onlar (peyğəmbərlər və ixtiyar sahibləri) məsum olmasaydılar, Allah açıq şəkildə onların .ardınca getməyi və itaət etməyi əmr etməzdi

Peyğəmbərlərin məsum olduqlarını sübut edən başqa bir yol peyğəmbərlərdə günahın səbəbinin olmamasıdır. (yəni, elə bir səbəb yoxdur ki, onlar bu səbəbdən günaha əl (.atsınlar

İzah: Biz özümüzə nəzər saldıqda görürük ki, bəzi günah və ya pis işlərə münasibətdə .demək olar ki, məsumuq

Aşağıdakı nümunələrə diqqət edin

Ağıllı bir şəxsin od, kül və çirkin şeyləri yemək fikrinə düşdüyünü görmüsünüzmü? Əlbəttə ki, xeyr. Əgər görsək, bir nəfər bu cür hərəkətlər edir, dərhal onun dəli olduğunu zənn edəcəyik. Çünki ağıllı şəxsin bu hərəkətləri etməsi mümkün deyil və bunu heç cür ağlımıza sığışdıra bilmərik. Bu kimi işlərin pis və bəyənilməz olduğunu təhlil etdikdə görürük ki, bu işlər o qədər pisdir ki, heç bir düşüncəli insan bunlara əl atmaz. Qısacadeyə bilərik ki, düşüncəsi olan hər bir insan bu cür iş və hərəkətlərdən .(yana məsumdur (günahsız və təqsirsizdir

Bəhsimizin dairəsini bir az da genişləndirib deyirik ki, insanların bir qismi bəzi günahlar və pis işlərə nisbətən məsumdur, lakin başqa bir hissə həmin günahlara düçar olmuşdur. Məsələn, mahir bir həkim mikroblu və bulanlıq suyu içməz. Amma savadsız bir əkinçi o suyu içir. Çünki o, suda olan mikrobları tanımır və onun zərərindən .xəbərsizdir

Deməli, belə çıxır ki, insanın bir mövzu barədə elmi, məlumatı nə qədərçox olsa, bir o qədər pis işlərdən çəkinər və günahlardan uzaq olar. Bu hesabla, əgər bir nəfərin imanı, biliyi həddən artıq yuxarı səviyyədə olsa və Allaha, onun ədalət məhkəməsinə sanki bunların hamısını gözləri qarşısında görürmüş kimi etiqad bəsləsə, bütün günahlardan uzaq olar. Onun pis əməllərə, günahlara olan münasibəti, bizim küçədə anadangəlmə çılpaq hərəkət etməyə olan nisbətimiz kimidir. Haram malı yemək onun nəzərində ağıza od aparmaq kimi bir şeydir. Biz odu ağzımıza almadığımız kimi, o da .haram malı ağzına almaz

Deyilənlərdən belə nəticəyə gəlirik ki, peyğəmbərlərin yüksək dərəcədə olan elmi, imanı onları günah etməkdən çəkindirir. Günah onların hətta fikrlərinə belə gəlmir. .Buna görə deyirik ki, peyğəmbərlər məsumdurlar

### ?İsmət (günahsızlıq) məqamı necə iftixar ola bilər

İsmətin və məsum olmanın mənasını yaxşı anlamayan bəzi şəxslər deyirlər ki, əgər Allah bir nəfəri məsum edibsə və günahı onun hətta fikrinə beləgətirmirsə, bunun harası fəxrdir? Bu məcburi məsumluqdur. Məcburi məsumluğun da heç bir şərafət və dəyəri yoxdur. Yuxarıda verilmiş izahatda bu məsələnin cavabı tamamilə aydındır. Peyğəmbərlərin günahlardan məsum olmaları heç də məcburi deyildir. Əksinə, onlar

bu rütbəyə, bu dərəcəyə öz güclü iman, elm, yəqinlikləri sayəsində nail olmuşlar. Bu da onlar üçün ən böyük şərəfdir. Əgər təcrübəli bir həkim özünü xəstəliklərdən qoruyursa, bu onun məcbur olduğunumu göstərir? Bu cür bir həkim bütün təmizliklərə riayət edirsə, bu onun üçün şərəf hesab olunmurmu? Hüquqşünas təhlükəli bir cinayətin hansı pis nəticələr verəcəyini bilir və həmin cinayətdən özünü gözləyirsə, bu ?onun üçün şərəf deyilmi

Deməli, peyğəmbərlərin nail olduğu məsumluqrütbəsini onlar öz ixtiyarları ilə .qazanmışlar və bu onlar üçün böyük bir iftixardır

### Fikirləşin və cavab verin

?Məsumluğun neçə budağı var.١

?Əgər peyğəmbərlər məsum olmasaydılar, nə olardı.٢

?İsmət (məsumluq) məqamının həqiqəti nədir.٣

Dərsdə deyilən misallardan başqa bütün və ya bəzi insanların uzaq olduğu bir neçə.۴ ?günah saya bilərsinizmi

Peyğəmbərlərin məsumluğu məcburidir, yoxsa öz iradələri ilə qazanmışdır? İsbat.۵ .edin

## IV DƏRS

### Peyğəmbərləri tanımağın ən gözəl yolu

Hər peyğəmbərlik iddiası edən şəxsin iddiasını qəbul etmək, yəqin ki, məntiqsiz və ağıldan kənar bir işdir. Allah tərəfindən peyğəmbərlik iddiası edən ola bilər, düz desin, ehtimal da var ki, yalan desin, özünə məqam əldə etmək üçün belə iddiyaya əl ataraq özünü peyğəmbər adlandırsın. Buna görə də peyğəmbərlərin iddiasının doğru

olub-olmadığını bilmək üçün bir sıra yol və qaydalar olmalıdır. Bu qaydalar vasitəsilə biz iddianın doğru olub- olmadığını anlaya bilərik. Buna nail olmaq üçün bir neçə yol .var. Bu yollardan ikisi daha çox əhəmiyyət daşıyır

Peyğəmbərlik iddiası edən şəxsin iddiasını lazımi surətdə araşdırmalı, əsər və.١ .nişanələrini aydınlaşdırmalıyıq

.Möcüzə və bəşər qüdrətindən xaric olan işlər.٢

.İstərdik, əvvəl möcüzə haqqında bir az söhbət edək

Bəzi insanlar, möcüzə sözünə təəccüblənir, onu əfsanə və ilə eyni səviyyədə tuturlar. Ancaq möcüzə sözünün mənasına elmi nöqteyi-nəzərdən diqqət etdikdə bu təsəvvürlərin yanlış olduğu açıq-aşkar görünür. Möcüzə qeyri –mümkün və heç bir səbəbi olmayan iş deyil. Möcüzə elə bir işdir ki, onun həyata keçməsi adi insanların qüdrətindən kənardır və onu ancaq təbiətdən üstün olan bir qüvvəyə arxalanaraq .həyata keçirmək olar

:Beləliklə, möcüzə aşağıdakı xüsusiyyətlərə malik olmalıdır

.A)Möcüzə mümkün və məqbul bir iş olmalıdır

B)Adi insanlar, hətta qeyri-adi istedada malik olanlar belə onu həyata keçirməkdən .aciz olmalıdırlar

V)Möcüzə göstərən şəxs başqalarını mübarizəyə dəvət etməlidir. Buna görə də, özünə .son dərəcə arxayın olmalıdır

Q)Heç kim onun kimi bir iş həyata keçirə bilməməlidir. Möcüzənin adından məlum .olduğu kimi, bütün insanlar onu həyata keçirməkdən aciz olmalıdırlar

D)Möcüzə həmişə nübüvvət, yaxud imamət iddiası ilə yanaşı olmalıdır. (Deməli, bəzi qeyri-peyğəmbər və imamların etdiyi və bəşər qüdrətindən xaric olan işlər möcüzə deyil.Bu cür işlər «kəramət» adlanır. Öldükdən sonra bir daha həyata qayıtmağın mümkün olmadığı barədə insan övladı indiyədək elmi və əqli bir sübutu əldə edibmi? Yaxud həkimlərin indiyədək əlac tapa bilmədikləri xərçəng xəstəliyinin əlacsız

?olmasına dair elmi və əqli bir nəzəriyyə irəli sürülübmü

Şübhəsiz ki, insan hazırda əlində olduğu qüvvə ilə ölünü diritməyə və ya xərçəng kimi bəzi xəstəlikləri sağaltmağa qadir deyil. Dünyanın bütün həkimləri yığılıb gəlsə də, yenə bunlara əlac tapa bilməz. Ancaq kimsə ilahi qüvvə ilə və Allahın sonsuz elmindən bəhrələnərək ölmüş bir şəxsin ruhunu bədəninə qaytarırsa və çarəsiz xəstələrə şəfa ?edirsə, bunda nə eyib var

Elm deyir: Mən bilmirəm, bacarmıram. Elm demir ki, hər hansı bir işheç vaxt bu iş .mümkün deyil, baş tutmaz, ola bilməz

:Başqa bir misal

Kosmik gəmidən istifadə etmədən ay səthinə enmək mümkün deyil. Ancaq bizim qüdrətimizdən qat-qat üstün olan bir qüdrətin köməyi ilə, heç bir fəza gəmisindən istifadə etmədən bir nəfər ay səthinə enirsə, yaxud başqa planetlərə səfər edirsə, ?burada nə eyib var

Əgər bir şəxs həqiqətən bu cür işlər görürsə, eyni zamanda peyğəmbərlik iddiası edərək başqalarını möcüzələri qarşısında mübarizəyə dəvət edirsə, insanlar da onun bu işləri qarşısında aciz qalırsa, onda bilirikki, doğrudan da, o, Allah tərəfindən göndərilmiş bir peyğəmbərdir. Ola bilməz ki, Allah bu cür işləri yalançı bir şəxsin .(ixtiyarın verərək camaatı yoldan azdırsın. (Diqqət edin

### Möcüzələri mövhumat və xurafatla qarışdırmaq olmaz

İfrat və təfritlər həmişə həqiqətlərin üzə çıxmasına mane olmuşlar. Möcüzə barədə də bu sözü demək olar. Özlərini ziyalı adlandıran bəzi şəxslər ümumiyyətlə möcüzəni inkar edir, bəziləri isə hər kiçik işi möcüzə adlandırırlar. Peyğəmbərlərin göstərdikləri elmi və həqiqi möcüzələri ağlasığmaz əfsanələrlə qarışdırırlar. Möcüzələr bu cür mövhumatlardan fərqlənməyincə onların əsl siması aşkar olmayacaq. Məhz buna görə də islamın böyük

alimləri möcüzə barədə söylənilmişhədisləri bu cür mövhumatlardan, saxtakarlıqlardan qoruyub saxlamağa cəhd etmiş və buna nail olmuşlar. Bu səbəbdən də «Rical» elmi ortaya çıxmışdır. Beləliklə, səhih və düzgün hədislərlə yalan və zəif .hədislər, həqiqətlə mövhumatlar bir-birindən fərqlənmişdir

Hal-hazırda zalım və istismarçı siyasi qüvvələr əsassız və dindən kənar olan etiqadları dini və həqiqi əqidələrlə qarışdırmaq üçün əllərindən gələni edirlər. Biz isə düşmən .vəsvəsələrinə aldanmamalı , özpak, müqəddəs dinimizi qoruyub saxlamalıyıq

Möcüzə ilə qüdrətdən kənar və qeyri-adi başqa işlərin fərqi

Bir çoxları deyirlər ki, mürtazlardan (yoqalardan) bir qismi qüdrət və adətdən kənar olan işləri həyata keçirirlər. Bu cür işləri öz gözləri ilə müşahidə etmiş insanlar da çoxdur. Bunlar heç də əfsanə deyildir, açıq-aşkar həqiqətdir. Burada belə bir sualla üzləşirik: bu cür işlərlə peyğəmbərlərin göstərdiyi möcüzələrin nə fərqi var? Biz onları ?bir-birindən necə ayırd edə bilərik

:Bu sualın müxtəlif cavabları var. Ən başlıcası isə aşağıdakı iki cavabdır

Yoqaların gördüyü işlər məhduddur. Başqa sözlə desək, onlar heç vaxt camaatın .١ onlardan istədiyi işləri görmürlər. Bu, onun məşq və səyi nəticəsində həyata keçirdiyi işdir. Onların bu cür işlərinin məhdud olmasının səbəbi də aydındır. Çünki bütün insanların qüdrəti məhduddur və onlar yalnız bir neçə işdə məharət göstərə bilərlər. Lakin peyğəmbərlərin möcüzələri məhdud deyildir. Onlar lazım olduğu yerdə camaat tərəfindən tələb olunan hər bir möcüzəni göstərə bilirdilər. Səbəbi də budur ki, onlar Allahın sonsuz qüdrətindən bəhrələnirlər, Allah qüdrətinin isə heç bir həddi-hüdudu .yoxdur. İnsanın öz elmi və qüdrəti həddən artıq məhduddur

Bir yoqanın gördüyü işi başqa bir yoqa da görə bilər. Deməli o iş, bəşər qüdrətindən.٢ xaric deyil. Elə buna görə də, bir yoqa hər hansı işi gördükdə heç vaxt başqalarını mübarizəyə dəvət etmir. Bilir ki, onun kimi bu işi bacaranlar çoxdur. Peyğəmbərlər isə tam arxayınçılıqla camaatı mübarizəyə dəvət edərək bu cümləni əllərində şüar tuturlar: «Yer üzündəki bütün insanlar yığışsalar da, bizim gördüyümüzişi görə .«bilməzlər

Bu fərq möcüzə ilə sehrə də aiddir. Bəyan etdiyimiz bu iki cavab, bu iki fərq möcüzəni .tamamilə sehrdən fərqləndirir

### Fikirləşin və cavab verin

?Möcüzəni nə üçün möcüzə adlandırmışdılar.١

?Möcüzə asılılıq qanunundan (illiyyət qanunundan) (səbəb qanunundan) istisnadırmı.٢

?Möcüzəni yoqaların gördüyü işlərdən və sehrdən ayırmağın neçə yolu var.٣

?Möcüzənin əsl şərt və xüsusiyyətləri hansılardır.۴

?Həyatda möcüzəyə bənzər bir iş müşahidə etmisinizmi.۵

## V DƏRS

### İslam peyğəmbərinin ən böyük möcüzəsi

İslam alimlərinin hamısı Qurani-Məcidin islam peyğəmbəri Həzrət Məhəmməd (s)-in ən böyük möcüzəsi olduğu fikrindədirlər. Quranın ən böyük möcüzə olmasının səbəbi :aşağıdakılardır

.Quran insanın ruhu və şüuru ilə əlaqəli əqli bir möcüzədir.١

Quran ١۴ əsr boyunca aşağıdakı şüarı əlində tutmuş bir möcüzədir: «Əgər bu səmavi.٢ kitabın Allah tərəfindən olmadığını zənn edirsinizsə, onda siz də bu cür bir kitab «.gətirin

Quranın camaatı mübarizəyə dəvət etməsi bir neçə surədə bəyan olunmuşdur. İsra surəsinin ٨٨-ci ayəsində deyilir: «(Ey peyğəmbər!) De ki: «Əgər insanlar və cinlər bir yerə yığışıb bu Qurana bənzər bir şey gətirmək üçün biri-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər.» Başqa bir ayədə mübarizənin şərtini bir az asanlaşdıraraq

buyurur: «Yoxsa müşriklər: «Quranı özündən uydurdu.»-deyirlər. Onlara de ki, «Əgər doğru deyirsinizsə, onun kimi özünüzdən on surə uydurub gətirin və (bu işdə) Allahdan başqa, kimi bacarırsınızsa, onu da köməyə çağırın.» (Hud,١٣). Dərhal bu ayənin ardınca əlavə edib deyir: «Yox əgər (köməyə çağırdıqlarınız) sizə cavab verməsələr, bilin ki, o ancaq Allhın elmi ilə nazil olmuşdur» (Hud, ١۴). Başqa bir ayədə mübarizənin şərtini asanlaşdıraraq buyurur: «Əgər bəndəmizə (Muhəmmədə) nazil etdiyimizə (Qurana) şəkkiniz varsa, siz də (fəsahətdə və bəlağətdə) ona bənzər bir surə gətirin və əgər sizin (bu, bəşər kəlamıdır) iddianız doğrudursa, Allahdan savayı bütün şahidlərinizi (bütlərinizi, şair və alimlərinizi) bu işdə köməyə çağırın! (Bəqərə, ٢٣). Sonrakı ayədə peyğəmbərə təsəlli verərək müşriklərin cavabını verib buyurur: «Madam ki, belə bir işi bacarmırsınız, heç bacara da bilməzsiniz, o halda kafirlər üçün hazırlanmış, yanacağı (günahkar) insanlardan və kibrit daşlarından ibarət olan oddan (Cəhənnəmdən) .(qorxun!» (Bəqərə, ٢۴

Quranın insanları (müşrikləri) ardıcıl olaraq mübarizəyə dəvət etməsindən məlum olur ki, peyğəmbərin öz möcüzələri arasında ən çox arxalandığı «Quran» möcüzəsi olmuşdur. Ancaq o Həzrətin digər möcüzələri də olmuşdur. Bu möcüzələri tarix .kitablarından oxuya bilərsiniz

Quran əbədi və hal-hazırda hamının gözü qarşısında olan bir möcüzə olduğuna görə .biz ən çox bu barədə danışacağıq

### ?İnsanlar bu mübarizədə necə aciz qaldılar

Təəcüblü və maraq doğuran odur ki, Quran müxalif qüvvələri mübarizəyə dəvət etmək üçün son dərəcə fəsahət və bəlağətdən istifadə etmiş, xəbərdar edici sözlər işlətmişdir. Beləliklə də, heç kim üçün bəhanə yeri qalmır. «Əgər doğru deyirsinizsə...», «dünyada olanların hamısını köməyə çağırsanız da...», «əgər inanmasanız, yandırıcı od sizin intizarınızdadır» kimi ifadələr bu həqiqəti vurğulayır. Bütün bunlardan başqa, peyğəmbərin müxaliflərlə mübarizəsi də sadə mübarizə deyildi. Çünki İslam onların qəlbən əqidə bağladıqları məzhəbi (bütpərəstliyi) yox etməklə yanaşı, onların iqtisadi, siyasi mənfəətlərinə, hətta vücudlarına belə xətər yetirmişdi. Başqa sözlə desək, islamın nüfuz qazanması onların bütün həyatını alt-üst etmişdi. Buna görə də, çarəsiz

qalıb onunla mübarizəyə qoşulmuşdular. Onlar peyğəmbərin qarşısını alıb, təbliğatına mane olmaq üçün nəyin bahasına olursa, olsun, Quran ayələrinə bənzər ayələr gətirmək məcburiyyətində qalmışdılar. Onlar bu cür ayələr gətirməklə qarşılarındakı müsəlmanları aciz buraxmaq və özlərinə haqq qazandırmaq istəyirdilər. Onlar bu işdə ərəblərin ən fəsahətli və bəlağətli şəxslərindən istifadə edirdilər. Lakin hər dəfə Quranla mübarizəyə əl atdıqda məğlubiyyətlə üzləşir, dərhal geri çəkilirdilər. Bu .barədə ətraflı məlumatı tarix kitablarından əldə edə bilərsiniz

### Vəlid ibn Muğəyrənin başına gələnlər

Ərəblərin (müşriklərin) Quranla mübarizəyə dəvət etdikləri şəxslərdən biri də Bəni-Məxzum tayfasından olan Vəlid ibn Muğəyrə olmuşdur. O, öz dövrünün görkəmli şəxsiyyətlərindən biri olmuş və çox tədbirli şəxs olduğu üçün ərəblər arasında şöhrət qazanmışdı. Müşriklər ondan Quran ayələri barədə fikirləşib onun fövqəladə nüfuzlu sözləri haqqında öz fikrini bildirməsini istədilər. Vəlid peyğəmbərin yanına gəlib ondan bir neçə ayə oxumasını istədi. Peyğəmbər də Səcdə surəsinin bir neçə ayəsini onun üçün oxudu. Bu ayələr Vəlidə o qədər təsir etdi ki, qeyri-ixtiyari olaraq Bəni- Məxzum qəbiləsinin təşkil etdiyi məclisə gəlib belə dedi: «And olsun Allaha! Məhəmməddən «....eşitdiklərim nə bəşər sözüdür, nə də pəri sözü

Vəlidin dediyi sözlərin bir hissəsi belə idi: Yəni, «onun (Məhəmmədin) dediklərində xas bir şirinlik, gözəllik vardır. Sözlərinin yuxarısı meyvə ilə dolu olan ağac gövdəsinə bənzəyir. Sözlərinin əvvəli və sonuisə ağac gövdəsi kimi çox qüvvətlidir. Onun dedikləri

hər şeyə qələbə çalıb üstün gəlir və heç bir şey onun sözlərinə qalib gələ bilməz.» Bu sözlər Qüreyş arasında «Vəlid Məhəmmədin aşiqi olmuş və ona ürək bağlamışdır» şayiəsinin yayılmasına səbəb oldu. Əbu Cəhl (o da Qüreyş tayfasından idi) tələsik Vəlidin evinə gələrək hadisəni (Qüreyş arasında yayılmış şayiəni) ona olduğu kimi .danışıb Vəlidi Qüreyşin məclisinə dəvət etdi

:Vəlid məclisə gəlib dedi

Məhəmmədin divanə olduğunumu zənn edirsiniz? İndiyədək onda dəlilik əlaməti- ?görmüsünüzmü

:Məclisdə oturanlar cavab verdilər ki, xeyr. Vəlid sözünə davam edib dedi

Belə güman edirsiniz ki, o yalançıdır. Məgər o, indiyədək sizlərin aranızda düz danışan- və etibarlı adam kimi tanımayıb? Ona Məhəmmədi- Əmin (düz danışan və etibarlı ?Məhəmməd) ləqəbini siz verməmisinizmi

:Qüreyşin başçılarından bir neçəsi dedi

?Bəs biz ona nə ad qoyaq-

Vəlid bir az fikirləşərək «deyin, o sehrbazdır»-deyə cavab verdi. Onlar bu yolla Qurana aşiq olmuş insanların qarşısını almaq istəyirdilər. Lakin Quran ayələrini sehr adlandırmağın özü onun ayələrinin fövqəladə cazibəli olduğundan xəbər verir. Onlar bu cazibəni sehr adlandırırdılar, həqiqətdə isə bunun sehrlə heç bir əlaqəsi yox idi. Belə bir vəziyyətdə Qüreyş «Məhəmməd məşhur sehrbaz olmuşdur, bu sözlər də (ayələr də) onun sehridir. Ondan uzaq gəzin, çalışın, sözlərini eşitməyin» şüarlarını hər tərəfə .yayırdı

Onlar nə qədər çalışsalar da, yenə bu işin qarşısını ala bilmədilər. Haq tələb edən, həqiqət axtaran və ürəkləri təmiz olan insanlar dəstə-dəstə hər yandan Qurana pənah gətirir, ona bel bağlayırdılar. Onlar bu səmavi mənbədən lazımınca bəhrələnir, .mənəvi qida alırdılar. Düşmənlər isə əlacsız qalıb geri çəkilməyə məcbur olurdular

Hal-hazırda yenə Quran bütün müxalifləri mübarizə meydanına dəvət edir. Ey alimlər,

ey filosoflar, ey şair və yazıçılar! Əgər bu ayələrin Allah tərəfindən olmasına şəkk edib, .onun bəşər kəlamı olduğunu zənn edirsinizsə, siz də onun kimi bir surə gətirin

Bilirik ki, İslam düşmənləri, xüsusilə, İslamı hər şeyi əhatə edən və özlərinin ən başlıca rəqibi hesab edən məsihi (xristian) keşişləri hər il müqəddəs və əzizİslamdininin ziddinə təbliğat aparmaq üçün külli miqdarda pul sərf edirlər. Onlar humanitar yardım bəhanəsi ilə müsəlman ölkələrinə gəlib İslamın ziddinə təbliğat aparır, fəaliyyət göstərirlər. Nə üçün onlar (ərəbdilli xristian alimlər) Quran ayələri kimi ayələr, surələr yazıb özlərinə üstünlük qazandırmırlar? Əgər bu iş baş tutası olsaydı, nəyin bahasına .olursa olsun, yəqin ki, ona da əl atardılar

Onların bu acizliyinin özü Quranın möcüzə olduğuna və Allah tərəfindən nazil .olunduğuna açıq-aşkar və qaneedici bir sübutdur

### Fikirləşin və cavab verin

?Nəyə görə Qurani-Kərim İslam peyğəmbərinin ən böyük və ən üstün möcüzəsidir.۱

?Quran insanları möcüzəyə necə dəvət edir.۲

?Quranın düşmənləri onu nə üçün sehr adlandırmışlar.۳

?Nə üçün Quran indiki məsihiliyin ən əsas rəqibidir.۴

.Vəlid ibn Muğəyrənin başına gələnləri danışın.۵

## VI dərs

### ?Nə üçün müqəttəə hərfləri

Bildiyimiz kimi, Quranın bir çox surələri müqəttə hərfləri ilə başlamışdır. Buna aid «Əlif-lam-mim», «Əlif-lam-mim-ra», «Yasin» və digər ayələri nümunə göstərmək olar. Bəzi rəvayətlərə əsasən, bu müqəttəə hərflərinin ehtimal olunan məna açılışlarından biri budur ki, Allah bu böyük möcüzənin, yəni Quranın sadəcə olaraq «əlifba» hərflərindən təşkil

tapdığını bildirmək istəyir. Görün, bu əzəmətli kəlamlar necə hərf və sözlərdən təşkil olunmuşdur ki, kiçik yaşlı uşaqlar da onu oxumağa qadirdilər. Doğrudan da, bunun özü .böyük bir möcüzədir

Burada bir sual yaranır: Quran hansı nöqteyi-nəzərdən möcüzə hesab olunur? Təkcə fəsahət, balağət cəhətlərindənmi möcüzədir? Başqa sözlə, onun möcüzə olması yalnız şirin, mənalı və nüfuzlu ifadələrinəmi görədir, yoxsa, başqa cəhətlərə görə də ?möcüzədir

Həqiqət budur ki, Qurana hər dəfə müxtəlif aspektlərdən nəzər yetirdikdə onun :müxtəlif möcüzələri aşkar olur. Məsələn

Onun fəsahət və bəlağəti. Onda olan şirin, hər şeyi əhatə edən, mənalı, dəyərli və.١ .çox cazibəli mənaların hamısı başdan-ayağa möcüzədir

O, (Quran) hər baxışdan gözəl şeyləri, xüsusən, mövhumat və cəfəngiyyatdan kənar.٢ .olan dini əqidəni əhatə etmişdir

Onun elmi möcüzələri. Yəni, Quran o vaxtadək insanlar üçün məlum olmayan elmi.٣ .məsələləri izah etmişdir

Quranın qeybdən verdiyi xəbərlər. O vaxt hələ baş verməmiş bir neçə hadisə daha.۴ .sonra açıq-aşkar baş vermişdir

Ayələrin bir-biri ilə heç bir ziddiyyət yaratmaması və mənaların bir-biri ilə tam.۵ .uyğunluğu, həmçinin bir çox başqa möcüzələr

Bu beş mövzu barədə bəhs həddən artıq çoxdur. Biz isə bir neçə dərsdə bunların əsas .məzmununu araşdıracağıq

### Fəsahət və bəlağət.١

.Bilirik ki, hər bir söz iki hissədən ibarətdir: kəlmə və məna

Əgər kəlmələr gözəl, layiqli, bir-birinə uyğun və nöqsansız olsa, eləcə də cümlə birləşmələri, məna və məqsəd könül iatəyən kimi cazibəli olsa, o kəlam fəsih və bəliğ

.kəlam adlanar

Quran bu iki xüsusiyyəti (fəsahət, bəlağət) özündə son dərəcə yüksək səviyyədə ehtiva edir. Belə ki, indiyədək heç kim onun şirinliyi, cazibədarlığı kimi şirin və çox .cazibəli ayələr gətirə bilməyib

Müşriklərin arasından seçilmiş olan Vəlid ibn Muğəyrə kimi şəxs Quran ayələrini eşitdikdən sonra heyrətə gəlib fikrə qərq oldu. Bir müddət fikirləşdikdən sonra Quranla mübarizə etmək məqsədi ilə müşriklərə «deyin, Quran sehr, Məhəmməd isə .sehrbazdır» deyə əmr etdi

Onlar bu adı peyğəmbərə dəfələrlə vermişdilər. Onlar bu yolla Quranın adına xələl gətirmək istəyirdilər. Əslində isə bu Quranın əzəmətini daha da ucaltdı. Çünki bu, (Quranı sehr adlandırmaq) Quranın fövqəladə nüfuzlu olduğuna bir etiraf idi. Quranı sadə yolla tanımaq qeyri mümkündür. Buna görə də, onu cazibəli və tanınmamış bir qüvvə hesab etməliyik. Müşriklər həqiqəti və Quranı möcüzə olaraq qəbul etmək .əvəzinə, haqsızlığa əl ataraq onu sehr adlandırdılar

İslam tarixində inadkar şəxslərin peyğəmbərin hüzuruna gəlib bir neçə Quran ayəsini dinləməklə birdən-birə İslam nurunun qəlblərində parladığı dəfələrlə görülmüşdür. Bu, .Quranın cazibəsinin, fəsahət və bəlağətinin möcüzə olduğunu göstərir

Uzağa getməyək, hal-hazırda ərəb ədəbiyyatı ilə tanışlığı olan insanlar Quranı nə qədər oxuyub təkrar edirlərsə, heç yorulmur, Qurandan doymurlar. Əksinə, daha çox .ləzzət alırlar

Quran ifadələri həddən artıq dəqiq, mətin şəkildə, eyni zamanda açıq-aşkar, yeri .gəldikdə isə, qəti surətdə bəyan edilmişdir

Yeri gəlmişkən, xatırlatmalıyıq ki, ərəblər o zamanlarda ədəbiyyat sahəsində çox irəliləmişdilər. Cahiliyyət dövrünün bəzi şerləri hal-hazırda da ərəb ədəbiyyatının ən .gözəl şerlərindən hesab edilir

Hər il Hicaz ədəbiyyatçılarından bir dəstəsi Məkkə şəhərində yerləşən Əkkaz bazarına yığışıb öz şerlərini təqdim edirdilər. Onların ən yaxşısı «ilin şeri» adına layiq görülərək yazılıb Kəbənin divarlarından asılırdı. Həzrət Məhəmməd(s) peyğəmbərliyə yetişdiyi dövrdə artıq «Yeddi müəlləqat» adlı möhtəşəm poeziya nümunələri hərəsi bir dəfə ilin şeri adına layiq görülüb Kəbənin divarından asılmışdı. Quran nazil olduqdan sonra onların fəsahət və bəlağəti nüfuzdan elə düşdü ki, onları bir-birinin ardınca oradan .götürməli oldular

Quran təfsirçiləri müxtəlif ayələrin əsasında Quranın incəliklərini bacardıqları qədər qələmə almışlar. Siz bu təfsirçilərə müraciət etməklə, yuxarıda deyilən məsələ ilə daha .ətraflı tanış ola bilərsiniz

Quranla tanışlıq göstərir ki, peyğəmbərin Quran barədə buyurduğu aşağıdakı hədis heç də təsadüfi və mübaliğə dərəcəsində deyildir. Peyğəmbər buyurmuşdur: «Quranın zahiri gözəl və zinətli, batini isə çox dərindir. Onda olan maraqlı və heyrətamiz «.məsələlər köhnəlməz

Quran məktəbinin böyük şagirdi olan Əmirəl-möminin Həzrət Əli(ə) da Nəchül-bəlağədə bu barədə belə buyurur: «Qəlbin baharı Qurandadır. Elm çeşmələri Qurandan .«qaynayır. Qəlbi təmizləmək üçün Qurandan yaxşı heç bir şey yoxdur

**Fikirləşin və cavab verin**

?Qurandakı müqəttəə hərflərinin məna açılışı nədir.١

?Quran təkcə bir nöqteyi-nəzərdən möcüzədir, yoxsa müxtəlif cəhətlərdən.٢

?Nəyə görə müşriklər peyğəmbəri sehrbaz adlandırmışlar.٣

?Fəsahətlə bəlağətin fərqi nədir.۴

?Yeddi müəlləqə» hansı dövrə aiddir? Onların mənası nə idi» .۵

## VII dərs

### Quranın dünya görüşü

Hər şeydən əvvəl Quranın nazil olduğu mühitin təfəkkür və mədəniyyət səviyyəsini nəzərdən keçirməliyik. Bütün tarixçilərin fikrincə, Hicaz dünyanın ən geri qalmış hissələrindən biri olmuşdur. Belə ki, bəzən «Cahiliyyət» dövrünün insanlarını vəhşi insanlar adlandırırlar. Etiqad cəhətdən bütpərəstliyə həddən artıq bağlanmış, daş və çubuqdan hazırlanmış müxtəlif şəkilli bütlər Hicazın hər tərəfinə yayılmışdı. Deyilənlərə görə, hətta xurmadan da bütlər düzəldib onlara sitayiş edirlərmiş. Qıtlıq olduqda isə .onları yeyirdilər

Qız uşaqlarına mənfi rəğbət bəsləyirdilər. Hətta iş o yerə çatmışdı ki, qız uşaqlarını diri-diri torpağa basdırırdılar. Buna baxmayaraq, mələkləri Allahın (öz fikirlərində tutduqları Allahın) qızları, Allahı isə adi bir insan hesab edirdilər. Tövhid və təkallahlılıqdan son dərəcə təəccüblənirdilər. Həzrət Məhəmməd(s) onları tövhidə dəvət etdikdə gəlib deyirdilər: «Əcaba, o (Muhəmməd Allahdan başqa heç bir tanrı yoxdur deməklə) tanrıların hamısını bir tanrımı edir? Bu doğrudan da çox təəccüblü bir şeydir». (Sad, ۵). Kim onların cəfəngiyyat, mövhumat və əfsanələrinin əksinə söz .desəydi, onu dəli, divanə adlandırardılar

Onlar qəbilə və tayfa şəklində yaşayırdılar. Qəbilələr arasında ixtilaflar o yerə gəlib çatırdı ki, iki qəbilə arasında gedən vuruşlar dayanmaq bilmirdi. Qarət və soyğunçuluq .onlar üçün adi bir işə çevrilmiş və bununla fəxr edirdilər

Yazıb-oxumaq bacaran insanlar o vaxt mərkəz hesab olunan Məkkədə barmaqla .göstərilirdi. Alim və ziyalıisə həddən artıq az tapılırdı

Bəli, bu cür mühitdən dərs oxumamış, məktəb və müəllim görməmiş bir şəxs çıxıb hər şeyi özündə əhatə edən bir kitab gətirmişdir. Üstündən ۱۴ əsr keçməsinə baxmayaraq, .yenə də alimlər bu kitabın təfsiri ilə məşğuldurlar. Hər an onda yenilik kəşf edirlər

Quran bu dünya və onun gedişatını çox gözəl və dəqiq surətdə bəyan etmişdir. Tövhidi kamil şəkildə bəyan etmiş və yerin, göyün, gündüzün, günəşin, ayın, bitkilərin və ən əsası insan vücudunun hər birini tək və şərik olmayan Allahın nişanələri kimi qələmə .verişdir

Quran bəziayələrdə insan vücudunun batininə nəzər salaraq fitri tövhidə işarə edir. Quran bu barədə buyurur: «Müşriklər gəmiyə mindikləri zaman (dəryada olan möminlər kimi) yalnızAllaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi .(yenə də (Ona) şərik qoşarlar.» (Ənkəbut, ۶۵

Bəzi ayələr ağıl və təfəkkür yolu ilə tövhidin dəlillərini bəyan edir. Təbiət və ətraf mühitdəki nişanələrə arxalanaraq yerin-göyün, heyvanların, dağların, dəryaların yaranmasını, yağışın yağmasını, küləyin əsməsini və insan bədəninin və ruhunun incəliklərini bəyan edir. Allahın sifətlərini açıqlayan zaman Quran ən gözəl yolu seçir. Bir yerdə buyurur: «Ona bənzər heç bir şey yoxdur.» (Şura, ۱۱). Başqa bir ayədə isə belə buyurur: «O özündən başqa bir tanrı olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O, rəhmli və mərhəmətlidir! O, özündən başqa heç bir tanrı olmayan, (bütün məxluqatın) sahibi, müqəddəs və pak olan, (bəndələrinə) əmin-amanlıq, salamatlıq bəxş edən, peyğəmbərlərini öz köməyinə arxayın edən, (hər şeyə) göz-qulaq olan, yenilməz qüdrət və qüvvət sahibi, (hər işdə) qalib olub hökmü keçən və (hər şeyin) fövqündə olan Allah-dır. Ən gözəl adlar (əsmayi-hüsna) ancaq ona məxsusdur. Göylərdə və yerlədə olanların hamısı onu müqəddəs bilib şəninə təriflər deyər. O, yenilməz qüvvət .(və hikmət sahibidir.» (Həşr, ۲۲, ۲۳, ۲۳

Quran Allahın elmini vəsf edərək onun elminin sonsuz olduğunu gözəl ifadə ilə bəyan edir: «Əgər yerdəki bütün ağaclar qələm, dərya isə mürəkkəb olsaydı, yenə də .(Rəbbimin sözləri (yazılıb) tükənməzdi. (Loğman, ۲۷

Quran Allahın hər şeyi əhatə etdiyini və onun vücudunun hər yerdə olduğunu özünə məxsus bir ifadə ilə açıqlayır: «Şərq də, Qərb də Allahındır, hansı tərəfə yönəlsəniz (üz tutsanız) Allah ordadır.» (Bəqərə, ۱۱۵). Başqa bir ayədə deyir: «Siz harada olsanız, o, sizinlədir. Allah sizin etdiyiniz bütün işləri görür.» (Hədid, ۴). Məad və qiyamət məsələsinə çatdıqda isə, müşriklərin ölülərin dirilməsi barədə büruzə verdikləri

təəccübü bəyan edib dərhal cavablarını verir: «Çürümüş sümükləri kim dirildə bilər? De ki, onları ilk dəfə yoxdan yaradan dirildəcəkdir. O, hər bir məxluqu çox gözəl tanıyır. O yaradan ki, sizin üçün yaşıl ağacdan od gətirdi. Budur, siz indi od yandırısınız. Məgər göyləri və yeri yaradan (bir daha) onlar kimisini yaratmağa qadir deyilmi? Əlbəttə qadirdir. (hər şeyi) yaradan və (hər şeyi) bilən odur! Bir şeyi (yaratmaq) istədiyi zaman Allahın buyurduğu ona ancaq: «Ol!»- deməkdir. O da dərhal olar. (Belə bir qüdrətə malik olan Allah üçün ölüləri diriltmək çox sadə bir işdir) (Yasin, ۷۸-dən ۸۲-ci ayəyə qədər). (Bu barədə ətraflı məlumatı «Yasin surəsinin tərcüməsi və təfsiri» kitabından əldə edə (.bilərsiniz

Quran yerin, insanın bütün əməllərini yadda saxladığı və qiyamət günü onların hamısını açıb söyləyəcəyi barədə də xəbər verir: «Məhz o gün (qiyamət günü) Allahın .(ona etdiyi vəhy ilə öz hekayətini söyləyəcəkdir» (Zilzal, ۴-۵

Bəzi ayələrdə insanın əl, ayaq və dərisinin onun əleyhinə verəcəyi şəhadətdən söhbət olunur: «Bu gün onların ağzını möhürləyərik. Etdikləri əməllər barəsində onların əlləri bizimlə danışar, ayaqları isə şəhadət verər.» (Yasin, ۶۵). «Müşriklər öz dərilərinə: «Nə üçün əleyhimizə şəhadət verirsiniz?» deyəcəklər. Dərilərə onlara belə cavab (verəcəkdir: «Hər şeyi dilə gətirən Allah bizi danışdırdı.» (Fussilət, ۲۱

Quran maarifi, onun əhatə dairəsi və eləcə də bu maarifin hər cürə xürafat və mövhumatdan uzaq olduğu onu hal-hazırda təhrif olunmuş İncil və Tövratla yanaşı qoyarkən məlum olur. Hər birindən bir hissəni götürüb müqayisə edək. Məsələn, görək, Adəmin yaranışı barədə Quran nə deyir, İncil nə deyir? Peyğəmbərlərin başına gələnləri

Tövrat necə açıqlayır, Quran necə açıqlayır? Tövrat və İncil Allahınecə qələmə verir, .Quran necə? Bu zaman Quran, Tövrat və İncil arasındakı fərq göz qabağında olacaq

### Fikirləşin və cavab verin

?Quranın meydana çıxdığı mühit hansı xüsusiyyətlərə malik idi.١

?Bütpərəstlik müşriklərin əqidəsinə necə təsir etmişdi.٢

?Fitri və dəlillər əsasında olan tövhidin fərqi nədir.٣

Allahı tanıtdırma və onun sifətlərinin bəyanında Quranın məntiqi necədir? Bir neçə.۴ .misal gətirin

?Quranın əhatə dairəsini necə anlamaq olar.۵

## VIII DƏRS

### Quran və çağdaş dövrün nailiyyətləri

Bilirik ki, Quran təbiətşünaslıq, tibb, psixologiya və ya riyaziyyat kitabı deyil. Quran .hidayət və insanın islahı kitabıdır o, bu yolda lazım olan şeylərin heç birini əsirgəmir

Biz Quranı bütün elmləri əhatə etmiş olan ensklopediya kimi tanımamalı və ona ensklopediya gözü ilə baxmamalıyıq. Qurandan iman və hidayət nuru, təqva və səadət, insaniyyət və əxlaq, nizam-intizam və qanun tələb etməliyik. Quran bu .sayılanların hamısına malikdir

Quran bu məqsədə yetişmək üçün bəzən bir sıra təbiət elmlərinə işarə etmiş, dünyanın bəzi sirr və incəliklərini bəyan etmişdir. Xüsusən, tövhidə aid olan bəhslərdə «nəzm» bürhanı ilə əlaqədar olaraq dünya sirlərinin bir neçəsini açıqlanmış və o dövrün hətta alimlərinə məlum olmayan elmi məsələləri aşkara çıxarmışdır. Quranın bu cür .elmi kəşflərinə malik olan ayələrini «Quranın elmi möcüzələri» adlandırırıq

.İndi isə Quranın elmi möcüzələrinin bir qismini oxucuların nəzərinə çatdırırıq

### Quran və cazibə qanunu

Nyutondan qabaq heç kim cazibə qanununu kamil surətdə kəşf etməmişdi. Bildiyiniz kimi, Nyuton bir alma ağacının altında oturduğu zaman bir alma ağacdan yerə düşür. Bu kiçik və adi hadisə Nyutonun fikrini özünə elə cəlb edir ki, o, illərlə bu fikrə qərq olur: «alma ağacdan qopduqda nə üçün göyə yox, məhz yerə düşdü»? Nəhayət, neçə ildən sonra cazibə qanununu kəşf edib belə nəticəyə gəlir: « İki maddi nöqtə kütlələrinin hasili ilə düz, aralarındakı məsafənin kvadratı ilə tərs mütanasib olan qüvvə ilə bir-birini cəzb edir.»

Bu qanunun kəşfi nəticəsində günəş sisteminin quruluşunun haradan olduğu sübuta yetirildi.

Nə üçün bu əzəmətli kəhkəşan və planetlər öz oxları ətrafında günəşin başına dolanırlar? Nə üçün onlar bir-biri ilə toqquşmurlar? Onları ucu-bucağı olmayan bu geniş asimanda hərəkətə gətirən hansı qüdrətidir? Nə üçün hər biri öz oxu ətrafında fırlanır və bu yoldan çıxmır?

Bəli, Nyuton kəşf etmişdir ki, bir cismin dövri hərəkəti onun mərkəzdən qaçmasına, cazibə qanunu isə onun mərkəzə cəzb olmasına səbəb olur. Bu iki qüvvə (mərkəzdən qaçma və cazibə) bir-biri ilə kamil bir şəkildə uyğun gəldiyi, yəni, cisimlər və onlar arasındakı məsafələr müdafiə qüvvəsinin dövri hərəkətinin surəti və cismin mərkəzdən uzaqlaşmasının ehtiyacı olan qədər cazibə istehsal etdiyi zaman cazibə və mərkəzdənqaçma qüvvələri həmin cisimlərə öz oxu ətrafında dövr etməyə imkan verir. Quran isə bu hadisəni (cazibə qüvvəsini) Nyutondan min ildən də artıq qabaq söyləyib. «Rəd» surəsinin ٢-ci ayəsində açıqlanmışdır: «Göyləri gördüyünüz kimi dayaqsız olaraq yüksəldən, sonra ərşi yaradıb hökmü altına alan, müəyyən vaxta (dünyanın axırına, qiyamətə) qədər (səmada) dolanan Günəşi və Ayı (iradəsinə) tabe edən, bütün işləri yoluna qoyan, ayələri müfəssəl izah edən məhz Allahdır. (Bütün bu dəlillərdən sonra), Rəbbinizlə qarşılaşacağınıza (qiyamət günü dirilib haqq-hesab üçün hüzurunda duracağınıza) bəlkə inanasınız.»

Bu ayə barədə imam Rza(ə)-dan söylənilən hədisdə oxuyuruq: (İmam Rza(ə) üzünü rəvayət söyləyənə tutub xitab etdi:) «Allah dayaqsız olaraq göyləri yüksəldən sütünlar deyir? «Rəvayət söyləyən cavab verdi: «Bəli, deyir. İmam buyurdu: «Deməli sütunlar «.var, lakin siz onları görmürsünüz

Ərəb ədəbiyyatında cazibə qüvvəsini ümumi və avam camaata bəyan etmək üçün«gözə görünməz sütun» sözündən daha yaxşı nə ifadə var? (Necə ki, Quran bu (.ifadədən istifadə etmiş və cazibə qüvvəsini sadə yolla camaata çatdırmışdır

Həzrət Əli(ə)-dan söylənilən hədisdə oxuyuruq: «Göydə olan ulduzlar yerdəki şəhərlər kimidir. Bir şəhər digər şəhərlə (bir ulduz digər ulduzla) nurdan olan bir sütunla «.birləşmişdir

Bu gün alimlər etiraf edirlər ki, göydəki ulduzların arasında milyonlarla ulduz var ki, onlarda canlı və düşüncəli varlıqlar yaşayır. Baxmayaraq ki, bu barədə geniş məlumat .hələ mövcud deyildir

### Yerin öz oxu və günəş ətrafında hərəkətinin kəşfi

Hamımız bilirik ki, yerin öz oxu ətrafında fırlanmasını dünyada ilk dəfə olaraq ilk dəfə təxminən ۴ əsr bundan qabaq yaşamış italyan alimi Qalileo Qaliley kəşf etmişdir. Ondan qabaq isə bütün alimlər Misir aliminin ptolemey sisteminə, yəni, yerin bütün dünyanın mərkəzi olması və digər planetlərin onun ətrafına fırlanması nəzəriyyəsinə inanırdılar. Onu da xatırladaq ki, Qaliley bu nəzəriyyəni irəli sürdüyünə görə din xadimləri tərəfindən kafir adlandırıldı və ölüm cəzasına məhkum olundu. Lakin sonradan tövbə edib heliosentirik sistemdən formal narazılıq etməklə canını qurtardı. Sonralar alimlər onun nəzəriyyəsini qəbul edib onu ortaya çıxardılar. Heliosentrik sistemin (Kopernik sisteminin) Ptolemey sisteminə qalib gəlməsində Qalileyin elmi yaradıcılığının böyük rolu oldu. İndi bu nəzəriyyə artıq hamının qəbul etdiyi bir məsələyə çevrilmişdir. Hətta hissi təcrübələr nəticəsində də bu nəzəriyyə sabitləşmiş, sonralar havaya peyklər göndərildikdən sonra daha ona heç bir şübhə yeri .qalmamışdır

Bir sözlə, yerin mərkəz olub sabit qalması inkar edildi. Məlum oldu ki, insanlar o

vaxtadək (Qalileyin nəzəriyyəsi meydana çıxana qədər) səhv etmişlər, yerin hərəkətini digər planetlərin hərəkəti ilə qarışıq salmışlar. Biz özümüz hərəkətdə olduğumuzdan, .onların bizim ətrafımıza hərəkət etdiklərini güman etmişik

Bunlara baxmayaraq «Ptolemey sistemi» (geosentrik nəzəriyyə) təxminən ۱۵۰۰ il alimlərin əqidəsinə kölgə salmışdı və Quranın nazil olduğu (və irəli sürən) dövrdə bir .nəfər cürət edib «Ptolomey» nəzəriyyəsinin əksinə bir söz deyə bilmirdi

Ancaq Qurana nəzər saldıqda görürük ki, «Kopernik sistem və nəzəriyyəsi» «Nəml» surəsinin ۸۸-ci ayəsində çox aydın şəkildə açıqlanmışdır: «Dağlara baxıb onları donmuş (hərəkətsiz durmuş) zənn edərsən, halbuki, onlar bulud keçdiyi kimi keçib gedərlər. Bu, hər şeyi bacarıqla, yerli-yerində edən Allahın gördüyü işdir. Həqiqətən, o, etdiyiniz bütün əməllərdən xəbərdardır.» Bu ayə açıq-aşkar dağların hərəkətindən söhbət edir. Halbuki, biz onları hərəkətsiz zənn edirik. Dağların hərəkətinin buludların hərəkətinə bənzədilməsində məqsəd isə onların həm sürətlə həm də incəliklə hərəkət etdiyini bildirməkdir. «Yerin hərəkəti» əvəzinə «dağların hərəkəti» ifadəsi də bu məsələnin əzəmətini çatdırır. Məlumdur ki, dağlar ətraflarındakı torpaq və yerin öz hərəkəti olmadan hərəkət edə bilməzlər. Dağların hərəkəti elə yerin öz hərəkəti deməkdir. .İstər öz oxu ətrafında olsun, istər gunəşin ətrafına da, istərsə də hər ikisinin

İndi təsəvvür edin ki, dünyada olan bütün elmi məclislər, akademiyalar, məktəblər hamısı Ptolemey və geosentrik sistemini, yəni yerin sabit qalması və günəş, ulduzlar və digər kəhkəşanların onun ətrafına dövr etməsi nəzəriyyəsini qəbul etsəydilər, belə bir mövqedə Quranın açıq-aşkar «Kopernik sistem və nəzəriyyəsi»ni, yəni yerin öz oxu

ətrafında dövretmə nəzəriyyəsini irəli sürməsi möcüzə hesab olmazdımı? Özü də heç bir məktəb görməmiş və dərs oxumamış bir şəxsin (peyğəmbərin) tərəfindən bu cür bir nəzəriyyə irəli sürülür. Bunun özü bu səmavi kitabın (Quranın) haqq olduğuna sübut ?və şahid deyilmi

### Fikirləşin və cavab verin

?Quranın elmi möcüzələrində məqsəd nədir.١

?Cazibə qanununu ilk dəfə olaraq kim kəşf etmiş və o şəxs hansı əsrdə yaşamışdır.٢

?Quran hansı ayəsində və hansı ifadə ilə cazibə qanununu bəyan etmişdir.٣

Geosentrik nəzəriyyə kimlər tərəfindən irəli sürülmüş və insanların əqidəsinə neçə il.۴ ?hakim olmuşdur

?Quran hansı ayəsində və hansı ifadə ilə yerin hərəkətindən söhbət edir.۵

## IX dərs

### İslam peyğəmbərinin haqq olduğuna aid daha bir dəlil

Peyğəmbərlik iddiası edən şəxsin doğru, yaxud yalan deyib-demədiyini bilmək üçün ondan möcüzə tələb etməkdən başqa, bir yol da vardır. Bu yolun özü onun doğru deyib-demədiyinə canlı bir sübutdur. O yol budur ki, onun aşağıda deyilən :xüsusiyyətlərini diqqətlə araşdırıb nəzərdən keçirək

.Onun əxlaqi xüsusiyyətləri və ictimai keçmişi.١

.Peyğəmbərlik iddiası olan mühitin şəraiti.٢

.Zaman şəraiti.٣

.İddianın əhatə etdiyi dairə.۴

.İcra olunacaq proqramlar və hədəfə yetişmək üçün lazımi vasitələr.۵

.İddianın mühitə etdiyi təsirlər.۶

.İddiaçının hədəfə yetişməsində göstərdiyi çalışqanlıq, fədakarlıq və iman.۷

.Azğın təkliflərlə uyğun olmaması.۸

.Ümumi təfəkkürdə dəvətin təsirinin sürəti.۹

.İddianı qəbul edənləri araşdırıb hansı dəstə və siniflərdən olduqlarını öyrənmək.۱۰

Əgər peyğəmbərlik iddiası edən hər hansı bir şəxs barədə bu on bəndi diqqətlə .araşdırsaq, rahatlıqla onun yalan və ya doğru olub-olmadığını aydınlaşdıra bilərik

Yuxarıda deyilənləri nəzərə alaraq peyğəmbər cənabları haqqında bu on bəndi çox qısa şəkildə nəzərdən keçirəcəyik. Baxmayaraq ki, bu on bəndin hər birinə aid müxtəlif .və geniş kitablar yazmaq olar

İslam peyğəmbərinin əxlaqi xüsusiyyətləri, eləcə də onun ictimai keçmişi barədə.۱ həm dostlar, həm də düşmənlərin dediyinə və tarixin göstərdiklərinə əsasən, elə bunu demək kifayətdir ki, o Həzrət o qədər pak və düzgün şəxs olmuşdur ki, hətta «Cahiliyyət dövrü»ndə də onu «Əmin» (düzgün və əmanətdar) adlandırmışlar. Tarix göstərir ki, o Məkkədən Mədinəyə hicrət etmək istədikdə Həzrət Əli(ə)-ı onun .əmanətlərini camaata çatdırmaq üçün vəkil etdi

Onun şücaət, səbr, dözm, ürəyiaçıqlıq, xoşxasiyyətlik və güzəştə getmə xüsusiyyətlərini həyatda baş verən cihad və sülhlərdən axtarıb tapmaq olar. Məkkənin fəthindən sonra Məkkə əhalisini bağışlayıb İslam düşmənlərini əfv etməsi bu .məsələyə canlı şahiddir

Hamımız bilirik ki, adi insanlar necə olur-olsun, yaşadıqları mühitlə ayaqlaşıb hərəkət.۲ və rəftarını mühitlə uyğunlaşdırırlar. Ola bilər ki, biri az, digəri çox uyğunlaşsın. Fikirləşin, görün necə ola bilər ki, ۴۰ il cəhl, nadanlıq, bütpərəstlik mühitində böyümüş, mühitin başdan-ayağa mövhumatla dolu olduğu yerdə bir şəxs çıxıb xalis və həqiqi tövhiddən danışır və bütpərəstliklə mübarizə aparır? Necə ola bilər, nadanlıq və cəhl ?mühitindən ən yüksək elmi nailiyyətlər parlasın

Bunların təbiətin fövqündə olan İlahi bir qüvvəninin təsdiqindən başqa bir yolla zühura ?çıxdığınainanmaq olarmı

?Görək, bu peyğəmbər hansı əsr və zamanda yaşamışdır.۳

O, dünyanın orta əsrləri keçirdiyi dövrdə yaşamışdır. Elə bir dövr ki, onda yalnız zülm, haqsızlıq, irqçilik və təbəqələrə bölünmüş cəmiyyət həyatı hökm sürürdü. Yaxşı olar ki, Həzrət Məhəmməd(s)-in nübuvət iddiası etdiyi dövrü Həzrət Əli(ə)-ın dilindən eşidək. Həzrət Əli(ə) buyurur: «Allah Məhəmməd(s)-i elə bir dövrdə peyğəmbər təyin etdi ki, insanlar heyrət vadisində qalmışdılar. Onların ağılları nəfsani meyllərə uymuş, təkəbbür və qürur onları fəlakətə sürüklənirdi. Onlar cəhl və nadanlıq içərisində qalıb .(çıxış yolu tapa bilmirdilər». (Nəhcül-bəlağə. ۹۱-ci xütbə

Fikirləşin, görün, şüarı «insanlar arasında müsavat», «ayrı-seçkiliyin, irqçiliyin olmaması» və yəni, «bütün möminlər qardaşdırlar» olan bir dinin (İslam dininin) o vaxtın şəraiti ilə ?uyğunluğu varmı

.Onun iddia və dəvəti.۴

Bütün cəhətlərdə tövhid, insaniyyət dünyasında vəhdəti, zalimanə xüsusiyyətlərin aradan qaldırılması, mübarizə, ümumdünya hökuməti təşkil etmək, məzlum və köməksizlərə arxa olmaq, təqva, iman və paklığı insani dəyərlərin ən başlıcası tanımaq .kimi məsələləri əhatə edir

İcra olunacaq proqramlar da yalnız buna arxalanırdı ki, müqəddəs bir hədəfə yetişmək üçün mütləq müqəddəs mərhələlərdən keçmək lazımdır. O, açıq-aşkar deyirdi ki, Yəni, «Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin.» (Maidə, ۸). Onun müharibə meydanlarında əxlaqi qaydalara riayət olunması üçün verdiyi əmrlər, o cümlədən, döyüşənlərdən başqasına zərər yetirməmək, xurmalıq və ağacları kəsməmək, düşmənin suyunu bulandırmamaq və əsirlərlə son .dərəcə mehribanlıqla rəftar etmək kimi nümunələr bu həqiqətə işarədir

Onun iddia və dəvəti mühitə o qədər təsir etmişdi ki, müşriklər insanların ona yaxın.۶ düşməsindən vəhşətə gəlirdilər. Çünki onlar peyğəmbərin cazibə və dəfetməsini

görüb onun fövqəladə olduğunu bilirdilər. (Bilirdilər ki, bir nəfər ona yaxınlaşdıqda dərhal onu özünə cəlb edəcək). Bəzən, söhbət edən zaman onlar səs-küy salıb camaatın onun sözünü eşitməsinə mane olurdular. Bilirdilər ki, kim onun sözlərini dinləsə, onun vurğunu olacaq. Məhz buna görə, onu sehrbaz, sözlərini isə sehr .adlandırırdılar. Bu məsələnin özü peyğəmbərin təsir qüvvəsini göstərir

Onun bu yolda göstərdiyi fədakarlıq və canfəşanlıqlardan məlum olur ki, bu dinə.٧ hamıdan çox onun özü iman bağlamışdır. Mübarizə meydanlarında yenicə müsəlman olmuş şəxslərin qaçıb aradan çıxmasına baxmayaraq o, öz hədəfi uğrunda əlindən gələni etdi. Düşmənin hücumları, təhdidləri və əks- təbliğləri qarşısında heç vaxt .özünü zəif qələmə vermədi

Müşriklər dəfələrlə onu öz çirkin planları ilə sazişə dəvət etsələr də, buna nail ola.٨ bilmədilər. Ondan yalnız «əgər günəşi mənim bir əlimə, ayı da digər əlimə versəniz (bütün dünyanı mənim ixtiyarımda qoysanız), yenə də öz hədəfimdən əl .çəkməyəcəyəm» cavabını aldılar

Peyğəmbərin dəvətinin insanların ümumi təfəkküründə təsirinin surəti də fövqəladə.٩

idi. Qərb alimlərinin İslam dini barədə yazdığı kitabları mütaliə edənlər bu yazıçıların

İslamın meydana çıxıb tez bir zamanda yayılmasından təəccüblərini gizlədə bilmədiklərini

söyləmişlər. Məsələn, qərbin tanınmış və «Qərb təməddününün tarixi və onun şərqdəki

bünövrələri» əsərini yazmış müəllimlərdən üçü həqiqəti etiraf edərək demişlər: «Dünyada

İslamın tez bir zamanda irəliləyib artmasının, bir əsrdən az bir müddətdə dünyanın çox

hissəsinə kölgə salmasının səbəbi barədə aparılan tədqiqatlara baxmayaraq, hələ də bu

məsələ bir müəmma olaraq qalmaqdadır.» Bəli, bu doğrudan da, bir müəmmadır. Necə də

Nəhayət, bu nəticəyə gəlirik ki, onunla düşmənçilik edənlər kafir və müşriklərin.١٠ başçıları, zalım rəhbərlər və özünüsevər dövlətlilər olmuşdur. Ona iman gətirənlər isə pak ürəkli cavanlar, öz haqlarını tələb edən məzlum insanlar, hətta qul və nökərlər və heç bir sərvəti olmayan insanlar idi. Onların yeganə sərvəti yalnız təmiz və pak qəlbləri .idi. Onlar haqqı tələb edən insanlar idilər

Bu on bənddən belə nəticəyə gəlirik ki, bu dəvət ilahi bir dəvət olmuşdur. Elə bir dəvət ki, təbiətin fövqündən nəşələnmiş, insanları azğınlıqlardan düz yola hidayət etmək .üçün uca Tanrı tərəfindən göndərilmiş bir dəvət olmuşdur

### Fikirləşin və cavab verin

İslam peyğəmbərin haqq olduğunu möcüzədən başqa yolla öyrənmək olarmı? Bu yol.١ ?hansı yoldur

Peyğəmbərin xüsusiyyətlərini araşdırıb nəzərdən keçirmək dedikdə hansı.٢ ?xüsusiyyətlər nəzərdə tutulur? Ən çox hansı işlərə diqqət yetirməliyik

İslamdan qabaqkı ərəblərlə İslamdan sonrakı ərəbləri müqayisə etdikdə bir şey başa.٣ ?düşürsünüzmü

Cahiliyyət dövrünün ərəbləri, ümumiyyətlə, o dövrün insanları barədə bildiyinizi şərh.۴ .edin

?Nə üçün İslamın düşmənləri peyğəmbəri sehrbaz adlandırırdılar.۵

## X dərs

### İslam peyğəmbərinin xatəmiyyəti

Xatəmiyyətin dəqiq mənası

İslam peyğəmbəri Həzrət Məhəmməd(s) Allah peyğəmbərlərinin sonuncusudur. Nübüvvət və peyğəmbərlik silsiləsi onunla başa çatır. Bu məsələyə (Məhəmməd(s)-in sonuncu peyğəmbər olduğuna) etiqad bağlamağın İslam dininin vacib əməllərindən biri hesab olunmasının mənası budur ki, müsəlmanların cərgəsinə qoşullan hər bir kəs

bu məsələnin müsəlmanların əqidəsində əsas inamlardan biri olduğunu anlayacaqdır. Yəni, müsəlmanlar tövhid məsələsində təkid etdikləri kimi, İslam peyğəmbərinin xatəmiyyətində də təkid edirlər. Müsəlmanların hamısı (istər sünni, istər şiə) bu məsələdə bir-biri ilə razılaşırlar və heç kim bu barədə ixtilaf dadeyil. Əslində, bəşəriyyət öz təkamül prosesini bir-birinin ardınca peyğəmbərlərin gəlməsi ilə müxtəlif mərhələlərə çatdırmış və sonuncu peyğəmbərin gəlişi ilə elə bir mərhələyə qədəm qoymuşdur ki, artıq özü-özünü idarə etməyə qüdrəti çatır. Yəni, İslamın geniş və doğru təlim-tərbiyəsi ilə özçətinlik və müşküllərini aradan qaldıra bilir. Başqa sözlə, İslam bəşəriyyətin sonuncu və təkamül yolunda onu hədəfə çatdıra bilən qanunudur, etiqad nöqteyi-nəzərindən ən kamil dini baxışı əhatə edən və hər bir zaman insan .ehtiyacları ilə uyğun gələn bir dindir

Məhəmməd(s)-in xatəmiyyətinin sübutu

Bu iddianı sübuta yetirmək üçün çoxlu sübut və dəlillər var. Aşağıdakı üç dəlil isə .onların ən aydınıdır

Bu məsələnin dinin vacib yönlərindən biri olması, yuxarıda dediyimiz kimi, bütün.۱ dünya müsəlmanlarının qəbul etdiyi bir şeydir. Əgər bir nəfər məntiq, dəlil və əql vasitəsi ilə islam dinini qəbul edərsə, gərək, bu dinin banisi olan Həzrət Məhəmməd(s)-in peyğəmbərlərin sonuncusu olduğunu da qəbul etsin. Çünki ötən dərslərdə İslam dininin haqq olduğunu kifayət qədər sübutlarla isbat etmişdik. Deməli, İslamın .əsaslarından biri olan peyğəmbərin xatəmiyyət məsələsini də qəbul etməliyik

Quran ayələri də Məhəmməd(s)-in sonuncu peyğəmbər olduğunu bəyan edir:.۲ «Məhəmməd(s) aranızdakı kişilərdən heç birinin atası deyil (Oğul odur ki, kişinin öz .(belindən gələ!). Lakin o, Allahın rəsulu və peyğəmbərlərin sonuncusudur.» (Əzhab, ۴۰

Bu ayə ərəblər arasında birini oğulluğa götürmək məsələsi adət olan zaman nazil olmuşdur. Ərəblər başqa ata-anadan olan bir nəfəri özləri üçün oğulluğa götürüb, onu öz ailə üzvləri kimi hesab edir, evdəkilərlə məhrəm olub biri-birinə (öldükdən sonra) .varis olurdular

İslam gələrək Cahiliyət dövrünün bu adətini aradan qaldırdı. İslam (bu ayə) bildirdi ki, oğulluğa götürülmüş şəxslər həqiqi oğlun (insanın öz belindən gələn oğlun) şəri və hüquqi qanunlarına aid deyillər. Bu ayə Peyğəmbərin oğulluğa götürdüyü Zeyd adlı bir nəfərə də şamil olurdu. Ayə buyurur ki, siz ərəblər Peyğəmbəri filankəsin (Zeydin) .atası adlandırmaqdansa, onu Allahın elçisi və peyğəmbərlərin sonuncusu adlandırın

Bu ayədən məlum olur ki, İslam peyğəmbərinin risaləti hamıya məlum olduğu kimi, onun xatəmiyyəti də hamı üçün məlumdur. Burada təkcə bir sual qalır ki: «xatəm» ?sözünün əsl mənası nədir

Xatəm» kəlməsi «xətm» sözündən götürülmüş və qurtaran, başa çatdıran» mənasındadır. Məsələn, məktubun axırına vurulmuş möhrü xatəm adlandırılar. Çünki o .möhür məktubu başa çatdırır

Ərəb dilində üzüyə də xatəm deyirlər. Səbəbi də budur ki, o vaxt üzüyün qaşı üzərinə ad, söz və s. yazıb möhür əvəzinə istifadə edərdilər. Bir nəfər məktub yazıb .qurtardıqda öz üzüyü ilə onu möhürləyərdi

İslam hədislərindən peyğəmbər(s) şah, hakim və imperatorlara məktub yazıb onları İslama dəvət etmək istədikdə səhabələrinin ona belə dedikləri məlumdur: «Əcəmlərdə belə adətdir ki, möhürsüz məktubu qəbul etmirlər». (Peyğəmbər o vaxtadək bütün məktublarını sadə və möhürsüz yazardı). O, əmr etdi ki, onun üçün bir üzük düzəldilib qaşı üzərinə «La ilahə illəllah, Muhəmmədun rəsulullah» həkk olunsun. Bundan sonra .peyğəmbər bütün məktublarını həmin üzüklə möhürləyirdi

.Deməli, xatəm sözünün əsl mənası sona yetirən və qurtaran deməkdir

Hədislərin bir çoxu da İslam peyğəmbərinin sonuncu peyğəmbər olduğunu.٣ .vurğulayır. Buna aid aşağıdakı hədisləri nümunə göstərmək olar

A)Cabir ibn Ənsarinin peyğəmbərdən söylədiyi mötəbər hədisdə deyilir: «Peyğəmbər camaata deyir: Mənim peyğəmbərlər arasında misalım bir evin tikilib qurtarması və təkcə bir daşın yerinin boş qalmasına bənzəyir. Hər kim o evə girsə, baxıb deyəcək, nə gözəl evdir, heyf ki, bir daşı çatmır. Mən həmin boş qalan yeri dolduran daşa .(bənzəyirəm və bütün peyğəmbərlər mənimlə xətm olunurlar. (Məcməül-bəyan təfsiri

B)İmam Sadiq(ə) buyurur: Yəni, «Məhəmməd(s)-in halal etdiyi şeylər qiyamətə qədər «.halal, haram etdiyi şeylər də qiyamətə qədər haramdır

V)Şiə və sünnilərin peyğəmbərdən söylədiyi məşhur hədisdə oxuyuruq: Peyğəmbər Əli(ə)-a buyurmuşdur: «Sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimidir. «.Təkcə bir fərq var ki, məndən sonra peyğəmbər olmayacaq

İslam peyğəmbərinin xatəmiyyəti barədə diqqəti cəlb edən bir neçə sualvardır. Onları .sizin nəzərinizə çatdırırıq

Bəzi insanlar deyirlər ki, əgər peyğəmbər Allah tərəfindən göndərilən lütf, mərhəmət.۱ və feyzdirsə, bəs, nə üçün bizim zəmanənin insanları bu lütf və mərhəmətdən məhrum olmalıdır? Nə üçün indiki əsrin camaatına hidayət etmək üçün peyğəmbər gəlməməlidir? Bu sualı verən şəxslər bir məsələyə diqqət etməmişlər. O da budur ki, bizim əsrin peyğəmbərdən məhrum olmasının səbəbi insanların ona layiq olmamaları deyil. Bizim əsr üçün peyğəmbər göndərilməməsinin səbəbi budur ki, artıq bəşər təfəkkür və bilik cəhətdən o dərəcəyə yetişib ki, İslam peyğəmbərinin qayda – qanununa riayət etməklə öz yollarına davam edə bilərlər və yeni bir peyğəmbərin gəlməsinə ehtiyac yoxdur. Yaxşı olar ki, bu məsələni düzgün anlamaq üçün belə bir misala diqqət edək: Ülul-əzm, yəni, yeni din, yeni şəriət və səmavi kitab sahibi olan ((eləcə də risalətləri ümumdünya risaləti olan

peyğəmbərlər beş nəfər olmuşlar. Nuh(ə), İbrahim(ə), Musa(ə), İsa(ə), və Muhəmməd(s). Bu peyğəmbərlərin hər biri müxtəlif dövrlərdə insanları hidayət etməyə çalışmışlar. Bəşər karvanını bir mərhələdən keçirib digər mərhələyə, o biri ülul-əzm peyğəmbərə çatdırmışlar. Nəhayət, bu karvan son mərhələyə yetişərək öz yolunu tapdı, artıq özü bu yolda hərəkət etmək qüdrətinə malik oldu. Bu karvanın işi eynilə ibtidai, sonra orta, daha sonra isə ali məktəbdə təhsil alan tələbənin işinə bənzəyir. Əvvəl elmlə ibtidai şəkildə tanış olduqdan sonra orta həddə təhsil alaraq elmini başa çatdırır. Əgər bir həkim məktəb və ya universitetə getmirsə, bu, onun ləyaqətinin olmadığı mənasına gəlməz. Əksinə, bunun səbəbi onun əldə etdiyi .məlumatları ilə öz elmi çətinliklərini həll etməyə qadir olmasıdır

Dünya ictimaiyyətinin vəziyyətinin zaman keçdikcə dəyişdiyini nəzərə alsaq, İslamın.٢ ?sabit qanunları insan ehtiyacların necə ödəyə bilər

Bu sualın cavabında deyirik: İslamın iki cür qanunları var; ١. Bir sıra sabit və dəyişilməz qanunlar. Məsələn, tövhid, ədalət, zülm və haqsızlıqla mübarizə və s. ٢.Ümumi və mövzuların dəyişilməsi ilə dəyişən qanunlar. Yəni, zaman dəyişdikcə qanun da zamana uyğun olur. Bu cür qanunlar həmişə insan ehtiyaclarını ödəməyə qadirdilər. Məsələn, İslamda yəni, «əhdlərinizə vəfa edib sadiq qalın» kimi ümumi bir qayda var. Şübhəsiz ki, zaman ötdükcə faydalı olan yeni ictimai, ticari, siyasi əhdlər bağlanır. İnsan yuxarıda deyilən ümumi qaydanı əlində əsas tutaraq bu əhdlərə, müqavilələrə vəfa edib sadiq qala bilər. Yaxud şəriətdə «zərərsiz qayda» adlı ümumi bir qanun var. Bu qanunla insan cəmiyyətin zərərinə olan bütün işlərin qarşısını ala bilər. Görün, İslamın bu ümumi qaydası nə qədər çətinliyi aradan qaldırır! Bu cür qaydalara İslamda çox rast gəlmək .olar

**.Fikirləşin və cavab verin**

?Xatəmiyyət nə deməkdir.١

?Quran ayələrindən xatəmiyyət məsələsini necə anlamaq olar.٢

Nə üçün bizimlə eyni zamanda yaşayan insanlar peyğəmbərlərdən məhrum.٣ ?olmalıdırlar

?İslam qanunları neçə hissəyə bölünür və insan ehtiyaclarını necə ödəyir.۴

## IV FƏSİL İMAM TANIMA HAQQINDA ON DƏRS

### I DƏRS

#### ?İmamət məsələsi nə vaxtdan başlandı

Hamımıza məlum olduğu kimi, peyğəmbərin vəfatından sonra müsəlmanlar iki dəstəyə bölünürlər. Bir dəstə deyirdi ki, peyğəmbər özündən sonra heç bir canişin təyin etməmiş və xilafət məsələsini camaatın öz öhdəsinə qoymuşdur. Camaat kimi .istəyirsə, onu xəlifə etsin. Bu dəstə «sünni» və ya «sünnə» adlanır

İkinci dəstənin etiqadına görə isə, peyğəmbərin canişini onun özü kimi günah və səhvdən məsum, camaata maddi və mənəvi rəhbərlik etmək üçün lazımi dərəcədə elmli olmalı və dini göz bəbəyi kimi qoruyub saxlamalı, dinin irəliləməsində əlindən gələni etməlidir. Bu dəstənin fikrincə bu cür şəxsi təyin etmək yalnız Allahın öhdəsində olan və peyğəmbərin vasitəsi ilə həyata keçən bir şeydir. Peyğəmbər də bu işi Allahın əmri ilə həyata keçirmiş və Əli ibn Əbu Talib (ə)-ı öz canişinlik məqamına təyin .etmişdir. Bu dəstə «İmamiyyə» və ya «şiə» adlanır

Bu bəhsləri irəli sürməkdə məqsədimiz məsələni əqli və tarixi dəlillərlə sübuta yetirmək və ona aid Quran ayələri və peyğəmbərin hədislərini şahid gətirməkdir. Ancaq bu bəhslərə başlamazdan qabaq bir neçə məsələni nəzərinizə çatdırmağı lazım .bilirik

#### ?İmamət məsələsi araya ixtilaf salırmı(۱

Bəzi insanlar var ki, imamət məsələsi barədə söhbət araya gəldikdə deyirlər, bu gün bu məsələnin yeri deyil. İndi müsəlmanları birləşdirib vəhdət (birlik) yaratmaq lazımdır. Peyğəmbərin canişini barədə söz-söhbət araya ixtilaf salır. İxtilaf və təfriqə yaradan .məsələləri kənara qoyub ümumi çətinliklərimizin həlli ilə məşğul olmalıyıq

Bu, tamamilə səhv bir fikirdir. Çünki birincisi, ixtilaf və təfriqə yaradan yalnız məntiqsiz və əsassız söhbətlərdir. Məntiqlə, sübutla, dəlillə deyilən sözlər heç bir ixtilafa səbəb olmur. Əksinə, arada olan ixtilafları azaldır və müştərək cəhətləri qüvvətləndirir. Mən özüm Ərəbistana ziyarətə gedərkən orada olan sünni məzhəbinin alimləri ilə görüşüb bəhslər etmişəm. Həm onlar, həm də mən bu bəhslərin heç bir ixtilafa səbəb olmadığını, eyni zamanda arada yaxınlıq yaratdığını hiss edirik. Bu bəhslər aradakı ixtilafları imkan dairəsində aradan qaldırır, bir-birimizə olan kin-kudrəti səmimiyyətə .çevirirdi

Ən əsası və başlıcası budur ki, bu cür bəhs və müzakirələr iki məzhəb arasındakı müştərək cəhətlərin həddən artıq çox olduğunu aşkar edir. Biz müsəlmanlar (şiə və sünni) bu müştərək cəhətlərlə düşmənlərimizin qarşısında durub onların cavabını verə .bilərik

Sünnilərin özü dörd firqəyə bölünmüşlər: hənəfilər, hənbəlilər, şafeilər və malikilər. Bu dörd firqənin olması heç də onların təfriqələrinə səbəb olmamışdır. Əgər sünnilər şiə məzhəbini bir məzhəb kimi qəbul etsələr, bir çox ixtilaflara son qoyular. Necə ki, son zamanlarda sünni məzhəbinin böyük müftisi, əl-Əzhər universitetinin rektoru Şeyx Şəltun İslamda böyük bir addım atmışvə sünnilər arasında şiə məzhəbini müsəlmanlar üçün rəsmi olaraq beşinci məzhəb elan etimişdir. Onun bu işi iki məzhəb arasında .böyük dostluq və qardaşlığa səbəb olmuşdur

İkincisi, bizim əqidəmizə görə, İslamın qayda-qanunu hər məzhəbində kamildir. Bütün məzhəblərə hörmət etməyimizlə bərabər bu əqidədəyik ki, həqiqi İslamı hansı cəhətdən olursa olsun, yalnız şiə məzhəbi düzgün tanıtdıra bilər. Nəyə görə bu məktəb və məzhəbi məntiq əsasında və qənaətbəxş olan dəlillərlə öz övladlarımıza öyrətməK? .Əgər bu işi görməsək, qətiyyətlə deyə bilərəm ki, övladlarımıza xəyanət etmiş olarıq

Biz yəqin bilirik ki, peyğəmbər(s) özündən sonra camaata başçılıq etmək üçün canişin

təyin edib. Bu məsələni məntiqi sübutlarla araşdırmağın nə eybi var? Ancaq bu .araşdırmalar elə olmalıdır ki, başqalarının məzhəbinə hörmətsizlik olmasın

Üçüncüsü, İslam düşmənləri müsəlmanların vəhdət və birliyini aradan qaldırmaq üçün sünnilərin yanında şiələrə, şiələrin yanında da sünnilərə o qədər töhmətlər, iftiralar yağdırmışlar ki, bəzi ölkələrdə bu, iki məzhəbi bir-birindən uzaq salmış və onları bir-birinə düşmən etmişdir. Əgər biz imamət məsələsini yuxarıda dediyimiz kimi, yəni, məntiqi sübutlarla irəli sürsək, şiə məzhəbinin təkid etdiyi məsələləriQuran və peyğəmbər sünnəsi ilə sübut etsək, məlum olar ki, bu təbliğatın hamısı yalan olmuş və .yalnız arada ixtilaf salmaq üçün bu söhbətləri quraşdırmışlar

Misal üçün, mənim heç vaxt yadımdan çıxmaz ki, Ərəbistana etdiyim səfərlərin birində Səudiyyə Ərəbistanın böyük din alimlərindən biri mənə dedi: «Eşitmişəm, siz (şiələr) bizim Qurandan fərqlənən başqa Quran çap edirsiniz». Mən təəcüblə ona dedim: «Əziz qardaşım! Bu məsələnin doğru olub-olmadığını öyrənmək elə də çətin iş deyil. Mən sizi dəvət edirəm, şəxsən özünüz və ya nümayəndəniz həcc ziyarətindən sonra heç bir yerə xəbər vermədən bizim ölkəyə gedək. Bütün məscidlərdə, evlərdə Quran var. Hansı məscidə, yaxud evə istəsəniz, gedib bir Quran götürüb baxaq. Görün, bizim ölkənin (çap etdiyi) Quranında bir fərq varmı? Onların nöqtəsində belə bir fərq ola .bilməz

.Mənim bu səmimi və sübutla etdiyim söhbət onun səhvini özünə anlatdı

Bunları deməkdə məqsəd imamətə dair bəhslərin (yuxarıda dediyimiz kimi) İslam cəmiyyətini möhkəmlətdiyini, bir çox həqiqətləri kəşf etdiyini və aradakı ixtilafları .azaltdığını bildirməkdir

### ?İmamət nədir(۲

İmam» sözü, adından məlum olduğu kimi, müsəlmanların rəhbər, başçı və liderinə» deyilir. Şiə əqidəsinə görə məsum imam o şəxsə deyilir ki, o, hər cəhətdən Peyğəmbər(s)-in canişinidir. Peyğəmbərlərlə imanın təkcə birfərqi var ki, peyğəmbər yeni şəriət və din gətirmiş, imam isə həmin şəriətin gözətçisidir. Peyğəmbərə vəhy nazil olur, imama isə vəhy nazil olmur. İmam öz təlimatını peyğəmbərdən alır və böyük .elmə malikdir

Şiələrin nəzərincə, məsum imam İslama rəhbərlik etməklə yanaşı, müsəlmanların maddi və mənəvi, zahiri və batini, bir sözlə, bütün cəhətlərdən rəhbəri və başçısıdır. İslam qayda-qanunlarını qoruyub saxlamaq onun borcudur və o, Allahın seçilmiş bəndəsidir. Sünni qardaşlar isə, imaməti bu cür şərh etmirlər. Onların fikrincə imamət təkcə islami hökumətə başçılıq etmək deməkdir. Başqa sözlə desək, xəlifələri (hər hansı xəlifə olursa, olsun) hansı zamanda olursa, olsun, müsəlmanların rəhbəri və .peyğəmbərin canişini bilirlər

Gələn dərslərdə isbat edəcəyik ki, hər zaman yer üzündə məsum bir peyğəmbər və ya imam olmalıdır. Beləliklə də o, dini qoruyaraq haqqı tələb edənlərə başçılıq edəcək. Əgər bir zaman gözlərdən qeyb olsa, bu da Allahın məsləhəti ilədir. Belə bir zamanda .isə din alimləri onun işini öz öhdələrinə götürüb onun ardıcılları olurlar

**:Fikirləşin və cavab verin**

?Bu gün imamət məsələsinin yeri deyil» deyənlərin məntiqi nədir» .١

?Bu məntiqin qarşısında neçə sənədli cavab var.٢

İslam düşmənləri müsəlmanlar arasında necə ixtilaf yaradırlar? Bunların qarşısını.٣ ?necə almaq olar

İslam düşmənlərinin müsəlmanlar arasında yaratdığı ixtilaflardan nümunələr.۴ ?bilirsinizmi

Şiələrin fikrincə imamətin mənası nədir? Onların fikri ilə sünnilərin fikrində nə fərq.۵ ?var

## İmamlığın fəlsəfəsi

Peyğəmbərlərin lazımlığı barədə gətirdiyimiz sübutlar peyğəmbərdən sonra imamın lazımlığını da bizim üçün bir qədər aydınlaşdırıb. Çünki onların (peyğəmbərlərin və .imamların) bəzi işləri eynidir. Lakin yenə də bəzi məsələlərin açıqlanmasını lazım bilirik

### .İlahi rəhbərlərin (imamların) himayəsində mənəvi təkamül (۱

Hər şeydən əvvəl, dünyanın yaraşıq və bəzəyi olan yaranışının hədəfi ardınca gedirik. Bu hədəf Allaha, kamala, mənəvi təkamülə yetişməkdə çox məsafələr, uzun-uzadı yollar qət etmişdir. Şübhəsiz ki, bu yolu məsum bir imamın başçılığı olmadan qət etmək olmaz. Bu məsafəni arxada qoymaq üçün mütləq Allah tərəfindən təyin edilmiş bir .müəllimə ehtiyacı var

Düzdür, Allah insana ağıl, düşüncə, dərrakə, vicdan vermiş, onun üçün səmavi kitablar göndərmişdir. Bununla belə, yenə də ola bilər ki, insan öz yolunu tapmaqda səhv etsin. Məsum bir imamın olması isə bu səhvin qarşısını mümkün qədər alır. Beləliklə də, «imamın vücudu insan yaranışının hədəfini təkmil edir.» Əqidə kitablarında bu ifadəni «lütf qaydası» adlandırılar. Lütf qaydası o deməkdir ki, hikmətli Allah insanı yaranışının hədəfinə yetirmək üçün onun üçün hər cür şərait hazırlamışdır. O cümlədən, insanlar üçün peyğəmbərlər göndərmiş və imamlar təyin etmişdir. Əgər belə olmazsa, Allahın .(hikməti ilə uyğun olmaz. (Diqqət olunsun

### Səmavi şəriətləri qorumaq (۲

Bildiyimiz kimi, ilahi şəriətlər peyğəmbərlərin qəlblərinə nazil olan zaman yağış suyu kimi şəffaf və ruhu yandırandılar. Lakin həmin pak şəriətlər çirkin mühitə, bacarıqsız qəlblərə daxil olan zaman çirklənir və yavaş-yavaş öz paklıqlarını itirirlər. İnsanlar (nahaq insanlar) bu şəriətlərin paklığını yox etmək üçün mövhumat və fanatik fikirləri ona qatırlar. Belə olduqda bu şəriətlərin nə bir cazibəsi olur, nə də tərbiyəsi. Bunun qarşısını almaq üçün

məsum bir rəhbər şəriət və din proqramlarını gözləməlidir. Bu yolla bütün mövhumat, fanatikalar və yalan əqidələrin qarşısı alınır. Əgər bir şəriət bu cür gözətçidən məhrum .olarsa, o tez bir zamanda öz paklığını itirəcək

Məhz bu mənaya işarə edərək Həzrət Əli(ə) Nəchul-bəlağədə buyurur: «Yer üzüistər aşkarda olsun, istər gizlin, heç bir vaxt ilahi bir rəhbərsiz olmayıb (və olmayacaq). Bununla da,Allahın aşkar dəlil və sübutlarının (şəriətinin) aradan çıxmasının qarşısı alınır.» (Nəhcül-bəlağə, qısa sözlər, ١٤٧-ci cümlə). Bu baxımdan imamın qəlbiiçində sənədlər saxlanan etibarlı sandığa bənzəyir. Bu yolla bu sənədlərhəmişə olduğu kimi .qalır.Bu da imamın mövcudluğunun fəlsəfəsindən biridir

### Ümmətəsiyasi–ictimai rəhbərlik (٣

Şübhəsiz ki, heç bir dəstə ictimai nizam- intizam və başda qüdrətli bir rəhbər olmadan öz ehtiyacını ödəyə bilməz. Elə buna görə də, qədim zamanlardan indiyədək bütün millətlər özlərinə rəhbər təyin etmişlər. Bu rəhbərlər bəzən saleh və xeyirxah insanlar, əksər hallardaisə xudbin və ləyaqətsiz şəxslər olmuşlar. Tarixdəfələrlə göstərmişdir ki, Müaviyə, Yezid kimi zalım şəxsiyyətlər camaatın rəhbərə olan ehtiyacından istifadə edərək özlərini güclə camaata rəhbər etmişlər. Bu, işin yalnız bir tərəfidir. Digər tərəfdən, insan özünün mənəvi təkamül hədəfinə nail olmaq üçün bu yolu tək başına yox, camaatla birgə getməlidir. Çünki bir nəfərin fikri, cismi, maddi və mənəvi qüvvəsi camaatın qüvvəsindən dəfələrlə azdır. (Cəsarətlə demək olar ki, bir nəfərin qüvvəsi cəmiyyətin qüvvəsinin yanında heçdir.) Buna görə, cəmiyyətə düzgün nizam-intizam hakim olmalıdır. Bu hakimiyyət haqsızlıqlarla mübarizə, bütün camaatın hüququna riayət, mühitdə bu hədəfə yetişmək üçün cəmiyyəti səfərbər etməli və böyük .hədəflərə nail olmaq üçün proqramlar hazırlamalıdır

### .Höccətin tamamlanmasına olan ehtiyac(٤

İmamın mövcudluğu onun ətrafındakı möminlərin ondan bəhrələnməsi və öz hədəflərinə çatmaları üçün ondan istifadə etmələrindən əlavə, onların əksinə hərəkət edənlərə höccəti tamamlayır. Bu yolla onlara verilən əzab vədləri sübutsuz olmur və bəhanə üçün heç bir yer qalmır. Bir sözlə, imamın mövcudluğu haqq dəlillərini kifayət .qədər bəyan edir, xəbərsizləri xəbərdar edir, xəbərdarlara isə xatircəmlik verir

### İmam Allah lütfünün böyük vasitəçisidir(۵

Alimlərin bir çoxu (hədislərdən istifadə edərək) insanlar arasında peyğəmbər və imamın yerini insan bədənində ürəyin yerinə bənzədirlər. Bildiyimiz kimi, ürək döyündükdə bütün damarlara qan ötürərək bütün hüceyrələri qidalandırır. Məsum imamın insanların başçısı olub Allah lütfünün nazil olmasına səbəb olduğunu, eləcə də hər bir insanın bu vasitəçi ilə əlaqədə olub öz lütfünü mənimsədiyini nəzərə alaraq bu nəticəyə gəlmək olar ki, ürək insan vücuduna lazım olduğu kimi, imam dainsanlara (.lazımdır. (Diqqətli olun

Bunu da bilin ki, peyğəmbər və imamın özünün heç bir şeyi yoxdur ki, camaata versinlər, hər nələri varsa, hamısı Allahındır. Necə ki, qəlb Allah lütfünün bədən üçün vasitəçisidir, eləcə də peyğəmbər və imam insanlar üçün Allah lütfünün .vasitəçisidirlər

### Fikirləşin və cavab verin

?İnsanların mənəvi təkamülə yetişməsində imamın rolu nədən ibarətdir.۱

?Şəriəti qorumaqda imamın rolu varmı.۲

?Höccətin tamamlanması nə deməkdir? İmamın bu işdə nə kimi rolu var.۳

?Lütf vasitəsi nə deməkdir? Bu baxımdan peyğəmbər və imamı nəyə bənzətmək olar.۴

## III DƏRS

### İmamın xüsusi şəraiti və sifətləri

Bu bəhsi başlamazdan qabaq bir məsələni bilməliyik. O məsələ budur: Qurani-Məciddən məlum olur ki, imamət məqamı bir şəxsin çata biləcəyi ən yüksək məqamdır. Hətta nübuvvət məqamından da üstündür. Çünki İbrahim peyğəmbərin əhvalatında deyilir: «İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, Allahın

əmrlərini tamamilə yerinə yetirdi. Belə olduqda Allah ona «səni insanlara imam (dini rəhbər, başçı) təyin edəcəyəm» dedi. İbrahim isə «nəslimdən necə?» deyə soruşdu. Allah (onun cavabında): «(Sənin nəslindən olan) Zalımlar mənim imamlıq rütbəmə nail ola bilməzlər.»buyurdu.» (Bəqərə, ١٢۴). Beləliklə də, İbrahim(ə) nübuvət, peyğəmbərlik məqamına çatdıqdan və Allahın imtahanlarından başı uca çıxdıqdan sonra imamət məqamına nail olur və camaatın zahiri, batini, maddi və mənəvirəhbərçiliyini öhdəsinə .götürür

İslam peyğəmbəri də nübuvvət məqamından əlavə camaatın rəhbərliyini (imaməti) də öhdəsinə götürmüşdü. Digər tərəfdən,bilirik ki, bir məqama nail olmaq üçün lazım olan şərait, sifət və xüsusiyyətlər həmin məqama münasib və uyğun olmalıdır. Yəni, məqam və rütbə nə qədər uca və məsuliyyətlər nə qədər ağır olarsa, lazım olan xüsusiyyətlər də bir o qədər çətin olacaqdır. Məsələn, İslamda məhkəmə işi aparan hakim və ya camaat namazına başçılıq edən şəxs ədalətli olmalıdır. Bir məhkəmə işi aparmaq və ya bir neçə rükət camaat namazı qılmaq üçün ədalət lazımdırsa, görün o böyüklükdə imamət məqamını öhdəsinə götürən şəxshansı xüsusiyyətlərə malik ?olmadıdır

:Bu baxımdan imam olan şəxs aşağıdakı xüsusiyyətlərə malik olmalıdır

### Günah və səhvdən məsum olmaq(١

İmam da peyğəmbər kimi məsum olmalıdır. Əks təqdirdə camaatın etimadını qazana bilməz və onlara rəhbər, örnək, nümunə ola bilməz. İmam camaatın qəlbində rəğbət qazanmalıdır. Dediyi sözləri camaat sorğu-sualsız qəbul etməlidir. Günah işlətmiş şəxs heç vaxt camaatın rəğbətini qazana bilməz. Özünün gündəlik işlərində səhvə yol verən şəxs cəmiyyətin işlərini səhvsiz necə qabağa apara bilər? Camaat onun dediklərini ?sorğu-sualsız necə qəbul edər

Şübhəsiz ki, peyğəmbər məsum olmalıdır və buna heç kimin şəkki yoxdur. İmam da .yuxarıda dediyimizə əsasən məsum olmalıdır

Bu məsələni başqa bir yolla da isbat etmək olar. O da ötən dərslərdə dediyimz «lütf qaydası» dır. Peyğəmbər və imamın varlığı bu qaydaya əsasən olduğu kimi,

məsumluğu da bu qaydaya əsasəndir. Səbəbi də budur ki, peyğəmbər və imamların qarşıya qoyduğu məqsədlər yalnız məsum olmaqla təmin olunur və ötən dərslərdə peyğəmbər və imamların varlığının fəlsəfəsinə dair dediklərimiz məsumluq şərti ilə .kamil olur

### Sonsuz elm(۲

İmam da peyğəmbər kimi camaatın elm mənbəyidir. O, dinin əsas və füruatından (fəri məsələlər), Quranın zahir və batinindən, peyğəmbərin sünnəsindən və dinə aid olan bütün məsələlərdən xəbərdar olmalıdır. O, şəriətin gözətçisi, camaatın rəhbəridir. Çətin məsələlərlə üzləşdikdə başqalarından kömək istəyən, elmləri İslam cəmiyyətinin ehtiyaclarını ödəməyən insanlar imamət məqamını öhdələrinə götürə bilməzlər. (Heç buna ixtiyarları da çatmır.) Bir sözlə, imam dini məsələləri bütün camaatdan yaxşı bilməlidir. Peyğəmbərin vəfatından sonra əmələ gələn boşluğudoldurmalı və həqiqi .İslamı mövhumatdan qoruyub saxlamalıdır

### Şücaət(۳

.İmam cəmiyyətin ən şücaətli şəxsi olmalıdır. Şücaətsiz rəhbərlik etmək mümkün deyil

İmam şücaətlə çətinliklərin, zalımların, daxili və xarici düşmənlərin qarşısında .durmalıdır

### Təqva(۴

Dünya malının aşiqi olanlar tez allanırlar. Onların haqq yoldan dönmə ehtimalı böyükdür. Bu cür insanları bəzən dünya malı ilə şirnikdirmək, bəzəndə qorxutmaq .vasitəsi ilə yoldan çıxarırlar

İmam dünya malının əsiri yox, əmiri (şah) olmalıdır. O, dünya malına aldanmamalı və İslama zidd olan dəvətlərə uymamalıdır. Buna görə də o, gərək,nəfsə tabe olmasın və .dünya malında gözü olmasın

### Əxlaqi cazibə(۵

Quran peyğəmbər(s) barədə buyurur: «(Ya Məhəmməd!) Allahın mərhəməti səbəbinə sən onlarla yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər.» (Ali-İmran, ۱۵۹). Camaatla qaba, sərt ürəkli rəftar etmək onların pərakəndəliyinə səbəb olmaqdan əlavə, peyğəmbər və imam üçün böyük bir .eybdir. Şübhəsiz ki, onlar bu eybdən uzaqdırlar

Bu xüsusiyyətlər böyük alimlərin imamlar üçün qeyd etdikləri əsas şərtlərdir. Əlbəttə, .bu beş xüsusiyyətdən əlavə şərtlər də var. Lakin bu beş şərt onların ən əsaslardır

### Fikirləşin və cavab verin

?Hansı dəlilə əsasən imamət məqamı insan üçün ən yüksək məqamdır.۱

İslam peyğəmbəri və digər ülul-əzm peyğəmbərlər də imamət məqamına nail.۲ ?olmuşlarmı

?İmamın məsum olmadığı təqdirdə hansı müşküllə üzləşəcəyik.۳

?Nə üçün imamın sonsuz elmi olmalıdır.۴

Nə üçün imam insanların ən şücaətlisi, ən təqvalısı və əxlaq cəhətdən ən cazibəlisi.۵ ?olmalıdır

## IV dərs

### ?İmamı təyin etmək kimin öhdəsindədir

Müsəlmanların bir dəstəsi (sünnə əhli) deyirlər ki, peyğəmbər dünyasını dəyişən zaman heç bir canişin təyin etməmişdir. Bu iş (xəlifə seçmək) müsəlmanların öz öhdəsindədir. Şuranın rəhbərliyi altında yığışıb özlərinə xəlifə təyin etməlidirlər. Onlar deyirlər ki, bu iş həyata keçdi- ilk dəfə olaraq birinci xəlifə (Əbu Bəkr) müsəlmanlara rəhbərlik etdi. Dünyasını dəyişən zaman şəxsən özü ikinci xəlifəni təyin etdi. İkinci xəlifə də ondan sonrakı xəlifəni təyin etmək üçün altı nəfərdən ibarət olan bir şuranın qurulmasını vəsiyyət etmişdi. O altı nəfər bunlar idi: Əli(ə), Osman, Əbdürrəhman ibn Ofv, Zübeyr, Təlhə və Səd ibn Əbi Vəqqas. Şurada Osman hamıdan çox, yəni Səd ibn

Əbi Vəqqas, Əbdürrəhman ibn Ofv və Təlhənin ona verdiyi üç rəy ilə müsəlmanların üçüncü xəlifəsi seçildi. (Bunu da xatırladaq ki, ikinci xəlifə Ömər açıq-aşkar demişdi ki, əgər rəylər bərabər olarsa (Osmanın kürəkəni olan) Əbdürrəhman ibn Ofv olan tərəfin rəyini qəbul edin). Osmanın xilafətinin axır çağlarında camaat müxtəlif səbəblər üzündən onun əleyhinə qiyam edib onu qətlə yetirdiklərinə görə, o, özündən sonrakı xəlifəni təyin edə bilməmişdi. Onun ölümündən sonra camaatın hamısı Həzrət Əli(ə)-a tərəf üz çevrilib ona beyət etdi. Bu beyətdən yalnız Müaviyə boyun qaçırdı. O, üçüncü xəlifə tərəfindən Şam şəhərinə vali təyin edilmişdi. Osmanın ölümündən sonra Müaviyə bilirdi ki, yeni xəlifə (Əli) onu bu məqamında saxlamayacaq. Məhz bu səbəbdən Əli(ə)-a müxalif olduğunu elan etdi və onun bu işi minlərlə günahsız .müsəlmanın qanının axıdılması ilə nəticələndi

İndi bu məsələni (camaatın xəlifə seçməsini) elmi və tarixi yollarla araşdırıb bu barədə .olan sualların bir neçəsini oxucuların nəzərinə çatdırırıq

### ?Ümmət peyğəmbərə canişin təyin edə bilərmi.١

Bu sualın cavabı bir o qədər də çətin deyil. Əgər imamət (xilafət) müsəlmanların zahiri rəhbərliyini öhdəyə götürməkdirsə, onda bu işdə camaatın bu rəyi böyük rol oynayır. Yox, əgər imaməti ötən dərslərdə şərh etdiyimiz və Qurandan əldə etdiyimiz mənaya gətirsək, bu təqdirdə imamı, xəlifəni yalnız Allah, ya da peyğəmbər (o da Allahın vəhyi ilə) təyin edə bilər. Çünki imamın bu mənasında sonsuz elmə malik olmaq şərt olunmuşdu. Bu elm səmavi mənbədən nəşələnməlidir, Peyğəmbərin elminə arxalanaraq İslamı qorumalıdır. Yaxud imamın şərtlərindən biri məsumluqdur. Yəni, heç vaxt səhv və günaha yol verməməlidir. O, yalnız məsum olmaqla camaatın zahiri, batini, maddi və mənəvi rəhbərliyini öhdəsinə götürə bilər. Eləcə də məqama nail olmaq üçün təqva, şücaət və s. şərt olunmuşdur. Bu

şərtləri bilmək yalnız Allah və peyğəmbərin əlindədir. Kimin məsum olub-olmadığını .yalnız Allah bilər, kimin sonsuz elmə, təqvəya, şücaətə malik olduğunu yalnız o bilər

İmamət və xilafəti yalnız «zahiri rəhbərlik» mənasında şərh edən şəxslər imamətin Qurandakı mənasını dəyişmiş və onun geniş dairəsini məhdudlaşdırmışlar. İmamın şərait və xüsusiyyətlərini tam şəkildə yalnız Allah tanıya bilər. Bu xüsusiyyətlərdən .xəbərdar olan yalnız odur

Peyğəmbərin Allah tərəfindən seçildiyi və camaatın fikrinin bu işdə heç bir rol oynamadığı kimi, imamın seçilməsi də bu cürdür. Peyğəmbər üçün lazım olan xüsusiyyətləri Allahdan başqa heç kimin bilmədiyi kimi, imamında xüsusiyyətlərini .ondan başqa heç kim bilmir

### ?Məgər peyğəmbər özünə canişin təyin etmədi.۲

İslam dininin ümumdünya və əbədi bir din olduğuna şübhə yoxdur. Quran ayələrinə əsasən, bu dinin xas bir zaman və məkana aid olmadığı anlışılır. Buna da şübhə yoxdur ki, peyğəmbər vəfat edən zaman İslam dini Ərəbistan yarımadasından kənara çıxmamışdı. Digər tərəfdən, peyğəmbərin Məkkədəki ۱۳ il ömrü (peyğəmbər olduqdan sonra) yalnız bütpərəstliklə mübarizə aparmaqla keçmişdi. Ömrünün hicrətdən sonrakı və İslamın təzə-təzə çiçəkləndiyi dövrdəki on ilinin çoxu da müharibələrə sərf olmuşdu. Peyğəmbərin gecə-gündüz İslamı təbliğ etməsinə baxmayaraq, bir çox məsələlərlə yaxından tanış olmağa çox vaxt lazım idi. Buna görə də, bu ağır məsuliyyəti peyğəmbərdən sonra onun özü kimi bir şəxs öz öhdəsinə götürməli idi. Bunlardan əlavə, gələcəyi düşünməkməzhəbin, şəriətin davam etməsi üçün şərait hazırlamaq bütün rəhbərlərin fikrini cəlb edən məsələlərdən idi. Onlar bu məsələləri heç vaxt unutmur və həmişə bu barədə düşünürdülər. Bunlar bir kənara, bəzən peyğəmbər ən sadə işlər üçün də tövsiyələr edir, məsləhətlər verirdi. Onda necə ola bilər ki, özündən sonra bir nəfəri canişin təyin etmək üçün proqram hazırlamasın? Bu üç məsələ açıq-aşkar bildirir ki, peyğəmbər özündən sonra mütləq canişin təyin edib. Gələn dərslərdə (۶-cı dərsdə) bu məsələyə dair İslam hədislərinidə misal gətirəcəyik. Bu hədislər peyğəmbərin ömr boyu bu məsələdən xəbərsiz olmadığını vurğulayaraq bu işi bir az da açıqlayır. Baxmayaraq ki, peyğəmbərin vəfatından sonra bəzi siyasi

qüvvələr camaata peyğəmbərin canişin təyin etmədiyini təlqin edirdilər. Heç inanmaq olarmı ki, bəzi müharibələrdə Mədinə şəhərindən bir neçə günlük kənara çıxmaq istəyən peyğəmbər öz yerində canişin qoyur, lakin ölümündən sonra bir nəfər canişin təyin etmir? Yəni, peyğəmbər(s) camaatı ixtilaflar arasında başsız qoyur, İslamı gələcəkdə tam şəkildə təmin etmək üçün tövsiyələr etmir? Yenicə yaranmış İslam üçün canişin təyin etməmək şübhəsiz ki, onun böyük təhlükələrlə üzləşdirər. Ağıl, düşüncə belə hökm edir ki, İslam peyğəmbəri tərəfindən bu iş (canişin təyin etməmək) qeyri-mümkündür. «Peyğəmbər bu işi camaatın öhdəsinə qoymuşdur» deyənlər heç olmasa, peyğəmbərin dilindən bir sənəd göstəsinlər. Təəsüflər olsun ki, bu şəxslərin .heç bir sənəd, sübutları yoxdur

### İcma və şura.۳

Fərz edək ki, peyğəmbər bu mühüm işi həyata keçirməmiş və özündən sonra canişin təyin etməmişdir. Eyni zamanda, müsəlmanlar özlərinə xəlifə təyin etməlidirlər. Bildiyimiz kimi, «icma» bütün müsəlmanların toplanmasına deyilir. Ancaq birinci xəlifənin seçilməsində bu cür icma toplanmamışdı. Təkcə Mədinə şəhərində olan bir neçə səhabə yığışıb Əbu-Bəkri xəlifə seçmişdilər və digər müsəlman şəhərlərinin, eləcə də Mədinənin özündə Həzrət Əli(ə) və Bəni Haşim qəbiləsinin böyük bir dəstəsi bu icmada iştirak etməmişdilər. Buna əsasən, bu icmanı və onda alınan qərarı qəbul etmək olmaz. Yenə fərz edək ki, bu icma düzgün olub, bəs nə üçün birinci xəlifədən sonra yeni xəlifə təyin etmək üçün icma qurulmadı? Nə üçün birinci xəlifənin özü ikinci xəlifəni təyin etdi? Əgər bu işi bir nəfər görə bilərsə, onda peyğəmbərin səlahiyyəti .hamıdan çoxdur

Bir az irəli getdikdə daha bir müşküllə üzləşirik. O da üçüncü xəlifənin seçilməsidir. Nə üçün ikinci xəlifə camaatın və birinci xəlifənin qoyduğu qanunu pozdu? Yəni, nə icmaya əsaslandı, nə də özü şəxsən üçüncü xəlifəni təyin etdi. O üçüncü xəlifəni təyin etmək üçün altı nəfərdən ibarət şuranın qurulmasını tövsiyə etdi. Əgər bu şura düzgündürsə, bəs nə üçün altı nəfərdən olmalıdır? Nə üçün altı nəfərin arasında üç nəfərin rəyi ?kifayət etməlidir

Bunlar İslam tarixində tədqiqatçılar üçün irələ çıxan suallardır. Onların cavabsız qalması isə imamın, xəlifənin təyin edilməsinin camaatın öhdəsində olmadığına .sübutdur

**.Əli(ə) hamıdan ləyaqətli və səlahiyyətli idi.۴**

Yenə təsəvvür edək ki, peyğəmbər özünə canişin təyin etməmiş və bu iş camaatın ixtiyarında olmuşdur. Bəs xəlifə təyin edən zaman insanların ən elmlisini, təqvalısını, şücaətlisini və bir çox xüsusiyyətləri ilə başqalarından fərqlənən şəxsi kənara qoyub ?ondan aşağı səviyyədə olanı xəlifə təyin etmək düzgündürmü

İslam alimlərinin əksəriyyəti, o cümlədən sünni alimlərinin bir çoxu Həzrət Əli(ə)-ın İslam məsələlərindən hamıdan yaxşı agah olduğunu yazmışlar. Ondan söylənilmiş rəvayət və əsərlər bu iddiaya canlı şahiddirlər. İslam tarixi deyir ki, o, bütün müşkül və çətinliklərdə müsəlmanların arxası olmuşdur. Hətta birinci, ikinci və üçüncü xəlifələr özləri onlardan çətin məsələlər barədə soruşulduqda Həzrət Əli(ə)-a müraciət edərdilər. Onun təqvası, şücaəti, elmi və digər xüsusiyyətlərihamıdan çox idi. Əgər camaat xəlifə seçmək istəyirsə, xilafət məqamına hamıdan çox Əlinin səlahiyyəti var. (Bu bəhslər barədə söhbətlər həddən artıq çoxdur. Onları bu kitaba sığışdırmaq (.mümkün deyil

**.Fikirləşin və cavab verin**

?Nə üçün camaat xəlifə təyin edə bilməz.۱

?Əgər məntiqlə fikirləşsək, peyğəmbər özünə canişin təyin edib ya yox.۲

?İlk üç xəlifə necə təyin olunmuşdur.۳

?Bu üç xəlifənin seçilməsi elmi və İslami qanunlara uyğun olmuşdurmu.۴

?Nəyə görə Əli(ə) hamıdan ləyaqətli və səlahiyyətli idi.۵

## V DƏRS

### Quran və imamət

Quran, bu böyük səmavi kitab hər şeyi aydın şəkildə açıqlamış, hətta imamət .məsələsindən də yan keçməmişdir. Bu məsələni müxtəlif yöndənaraşdırmışdır

#### Quran imaməti Allah tərəfindən hesab edir.۱

Ötən dərslərdə dediyimiz kimi, Quran İbrahim peyğəmbərin imamət məqamına nübuvvət məqamına çatdıqdan və bir sıra çətin sınaqlardan keçdikdən sonra yetişdiyini bildirir. Bu məsələ Bəqərə surəsinin ۱۲۴-cü ayəsində açıqlanmışdır: «İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, Allahın əmrlərini tamamilə yerinə yetirdi. Belə olduqda Allah ona «Səni insanlara imam (dini rəhbər) .təyin edəcəyəm» deyə buyurdu

Müxtəlif Quran və tarix nişanələri göstərir ki, İbrahim(ə) imamət məqamınaBabil bütpərəstləri ilə mübarizədən, Şama hicrət etdikdən, Kəbə məscidini düzəltdikdən və .İsmayılı qurban kəsməyə apardıqdan sonra nail olmuşdur

Əgər nübuvvət məqamının təyini Allahın ixtiyarındadırsa, ondan dəfələrlə üstün olan imamət məqamı da onun ixtiyarında olmalıdır. İmamət məsələsi camaatın rəyi əsasında təyin olunmuş deyil. Bundan əlavə, Quran özü bu cür ifadə ilə buyurur: «Səni insanlara imam təyin edəcəyəm.» (Deməli, bu iş Allahın ixtiyarındadır.) Quranın digər bir ayəsində Allahın böyük peyğəmbərləri İbrahim, Lut, İshaq və Yaqub barədə bu cür deyilmişdir: «Biz onları əmrimizlə (insanları) doğru yola gətirən imamlar etdik.» (Ənbiya, .(۷۳

Quranın bir çox başqa ayələrində də bu işin Allah tərəfindən təyin olunduğu bildirilmişdir. İbrahim peyğəmbərin imamətinə dair olan ayədə görürük ki, İbrahim peyğəmbər bu məqamı onun övladlarına da nəsib olmasını istədikdə mənfi cavab aldı: :«İbrahim

Nəslimdən necə?-deyə soruşdu. Allah onun cavabında «(Sənin nəslindən olan) Zalımlar mənim imamlığıma nail olmazlar» buyurdu. «Zalım» sözünün leksik mənası və Quranın bu barədəki məntiqinə nəzər yetirdikdə məlum olur ki, bu sözün geniş mənası vardır. Bu söz bütün günahlara, zahiri və batini günahlara da aiddir. Bu işi (insanın zahir və batində gördüyü günahları) Allahdan başqa heç kimi bilmədiyinə görə, məlum olur ki, .imam təyin etmək yalnız Allahın ixtiyarındadır

### Təbliğ ayəsi.۲

Maidə surəsinin ۶۷-ci ayəsində gəlmişdir: «Ya peyğəmbər! Rəbbin tərəfindən sənə nazil olanı təbliğ et. Əgər (bunu) etməsən, Allahın risalətini (sənə həvalə etdiyi elçilik, peyğəmbərlik vəzifəsini) yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. «.Allah kafir camaatı düz yola yönəltməz

Bu ayənin ahəngindən başa anlaşılır söhbət peyğəmbərin boynunda olan ağır məsuliyyətdən gedir. Özü də, peyğəmbərə nigarançılıq üz vermişdi. Bu məsuliyyət camaatın bir dəstəsinin qarşı çıxmasına səbəb ola bilərdi. Buna görə də, ayədə bu məsuliyyət və təbliğin camaata çatdırılması təkid olunmuş və peyğəmbərə .nigarançılıqların müqabilində xatircəmlik verilmişdir

Bu mühüm məsələ yəqin ki, tövhidə, yəhudi və münafiqlərlə mübarizə aparmağa aid deyil. Çünki o vaxt (Maidə surəsi nazil olan zaman) bu məsələlərin hamısı həll .olunmuşdu

İslamın sadə ehkamlarını camaata çatdırmaq üçün də bu qədər nigarançılıq lazım deyil. Çünki ayənin zahirindən belə anlaşılır ki, bu məsuliyyət çox ağır və peyğəmbərliyə bərabər olan bir məsuliyyət imiş. Əgər bu iş həyata keçməsəydi, peyğəmbərlik vəzifəsi naqis və natamam qalardı. Bu məsələ peyğəmbərin özündən sonraya canişin təyin etmək məsələsindən başqa bir şey ola bilərdimi? Özü də bu ayə peyğəmbərin ömrünün son çağlarında nazil olmuşdur və peyğəmbərin risalətinin davamı olan canişinlik məsələsi ilə uyğun gəlir. Bundan əlavə, bir çox səhabələrdən rəvayət olunmuş hədislərdə, o cümlədən Zeyd ibn Ərqəm, Əbu-Səid Xidri, İbn Abbas, Cabir ibn Abdullah Ənsari, Əbu-Hüreyrə, Hüzeyfə və İbn Məsuddan söylənilmiş hədislərdə, eləcə də sünni alimlərinin (təfsirçi, tarixçi və hədis deyənlərin) söylədiyi

hədislərdə gəlmişdir ki, bu ayə (Maidə surəsinin ۶۷-ci ayəsi) Həzrət Əli(ə) və Qədir-Xum hadisəsilə əlaqədar nazil olmuşdur. Qədir-Xum hadisəsini, inşaallah, gələn dərsdə açıqlayacağıq. İndi isə qısaca olaraq deyirik: bu ayə açıq-aşkar göstərir ki, peyğəmbərə ömrünün axırlarında son həccindən qayıdan zaman Əli(ə)-ı rəsmi olaraq .öz canişini təyin edib camaata bildirmək əmr olunmuşdu

**Ülul-əmr) «İxtiyar sahiblərinə itaət etmək» ayəsi).۳**

Nisa» surəsinin ۵۹-cu ayəsində oxuyuruq: «Ey iman gətirənlər! Allaha, peyğəmbərə və» «.özünüzdən olan ixtiyar sahiblərinə itaət edin

Bu ayədə ixtiyar sahiblərinə itaət heç bir şərt qeyd olunmadan Allah və peyğəmbərə .itaət etməklə birgə deyilmişdir

İxtiyar sahibləridedikdə hər bir zaman müsəlmanlara başçılıq edən xəlifələrmi anlaşılır? (Necə ki, bəzi sünni alimləri belə deyir.) Bu, heç bir məntiqə uyğun gəlmir. Çünki xəlifələrin bir çoxu hər hansı, zaman azğın, günahkar və zalım şəxslər olmuşlar. Bəlkə ixtiyar sahibləri dedikdə bütün xəlifələr başa düşülməlidir? Bu şərtlə ki, hakimiyyətləri şəriətin əksinə olmasın. Bu ehtimal da ayənin ümumiyyəti ilə uyğunlaşmır. Yoxsa, ixtiyar sahiblərin dedikdə peyğəmbərin bütün səhabələri nəzərdə .tutulur? Bu ehtimal da ayənin hər əsr və zamana aid olan məfhumu ilə uyğun gəlmir

Beləliklə, məlum olur ki, ixtiyar sahiblər dedikdə məqsəd hər zaman həyatda olan məsum rəhbərlərdir. Onlara itaət etmək vacibdir, əmrlərinə isə Allahın və .peyğəmbərin əmrləri kimi tabe olmaq lazımdır

İslami mənbələrdən söylənilmiş və ixtiyar sahibləri dedikdə Həzrət Əli(ə) və digər .məsum imamların nəzərdə tutulduğunu söyləyən hədislər də bu məsələyə şahiddirlər

## Vilayət)rəhbərlik ayəsi).۴

Maidə» surəsinin ۵۵-ci ayəsində gəlmişdir: «Sizin hamınız, rəhbəriniz ancaq Allah, Onun» peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, (Allaha) boyun əyərək namaz qılır və .rüku halında sədəqə( zəkat) verirlər

Vilayət» kəlməsi «vəliyy» sözünün köküdür. Bu sözün verdiyi məna müsəlmanların bir-» biri ilə dostluğu deyil. Çünki bu dostluğun şərtə ehtiyacı yoxdur və bütün müsəlmanlar bir-biri ilə dostdurlar. Hətta rüku halında zəkat verməsələr də, «vəliyy» sözü müsəlmanlara maddi və mənəvi rəhbərlik etmə mənasına gəlir. Xüsusən, bu sözün Allah və peyğəmbərin rəhbərliyi ilə birgə gəlməsi bu məsələni daha da aydınlaşdırır. Bu da məlumdur ki, bu ayədə bəzi xüsusiyyət və nişanələrin qeyd olunması, namaz qılarkən rüku halında sədəqə (zəkat) verən müəyyən bir şəxsə işarə edir. Vacib deyil .ki, insan namazın rükusunda sədəqə versin. Əslində bu bir nişanədir

Bu nişanələrin hamısından belə məlum olur ki, bu ayə Həzrət Əli(ə)-ın əhvalıtına işarədir. O əhvalat bu cür olub: Bir gün Həzrət Əli(ə) məsciddə namaz qılırdı. Bir dilənçi məscidə girib kömək istədi. Lakin ona heç kim əl tutmadı. Bu vaxt namazın rükusunda durmuş Həzrət Əli(ə) sağ əlinin kiçik barmağını dilənçiyə tərəf uzatdı. Dilənçi yaxınlaşıb Həzrət Əli(ə)-ın barmağındakı qiymətli üzüyü çıxartdı. Peyğəmbər(s) gözucu bu hadisəni müşahidə edirdi. Namazdan sonra üzünü göyə tutaraq buyurdu: «İlahi! Musa(ə) səndən köksünün açılıb genişlənməsini, işinin yüngülləşməsini, sözünün yaxşı anlaşılması üçün dilindən düyünün açılmasını və qardaşı Harunun ona vəzir, köməkçi olmasını dilədi. Mən Məhəmməd(s) sənin seçilmiş peyğəmbərinəm. Mənim də köksümü genişlət, işlərimi asan et və ailəmdən olan Əlini mənə vəzir və köməkçi et. «.Onunla məni möhkəm və qüvvətli et

Peyğəmbərin duası qurtarmamış Cəbrail nazil olub həmin ayəni gətirdi. Təəccüblü budur ki, böyük sünni təfsirçilərinin əksəriyyəti, eləcə də tarixçi və hədis deyənləri bu ayənin Həzrət Əli(ə) barədə nazil olduğunu yazmışlar. Peyğəmbərin səhabələrinin on nəfərdən çoxu da bu ayənin Əli(ə) barədə nazil olduğunu şəxsən peyğəmbərin öz .dilindən söyləmişlər

.Rəhbərlik, imamət barədə ayə çoxdur. Biz isə təkcə bu dördə ayə ilə kifayətlənirik

**Fikirləşin və cavab verin**

?Quran baxımından imam, xəlifə təyin etmək kimin öhdəsindədir.١

?Təbliğ» ayəsi hansı şəraitdə nazil olmuş və nəyi əhatə edir» .٢

?Heç bir şərt qeyd olunmadan kimlərə itaət etmək düzgündür.٣

?Hansı dəlilə əsasən «innəma vəliyyukumullahu və...» ayəsi imamətə aiddir.۴

?Quranın imamət barəsindəki ayələrindən hansı məsələləri istifadə etmək olar.۵

## VI dərs

### Peyğəmbər sünnəsində imamət

İnsan hədis kitablarını, xüsusən sünni alimlərin yazdığı kitabları mütaliə etdikdə İslam peyğəmbərindən söylənilmiş və Həzrət Əli(ə)-ın imamətini sübut edən bir çox hədislərlə rastlaşır. İnsan təəccüb edir ki, bu qədər hədislər olan yerdə daha nə şübhə yeri olmalıdır? Bu hədisləri oxuduqdan sonra Əhli-Beyt yolundan başqa yol seçməyin ?nə mənası var

Bu hədislərin bəzilərinin sənədi yüzə, bəziləri isə ona çatdığı bir halda və bu hədislərin onlarla məşhur dini kitablarda yazıldığı bir halda əgər onun-bunun dedi-qodularını, fanatikaları kənara qoysaq, məsələ elə aşkar olacaq ki, daha başqa dəlil və sübuta .ehtiyac olmayacaq

Biz bu hədislərin məşhurlarından bir neçəsini nümunə gətirir və bu barədə geniş .məlumat istəyənlər üçün bəzi mənbələri qeyd edirik

#### Qədir–Xum hədisi.١

Tarixçilərin əksəriyyəti yazırlar ki, peyğəmbər(s) ömrünün son ilində həcc mərasimini yerinə yetirmək üçün Məkkəyə getmişdi. Həcc mərasimi başa çatdıqdan sonra peyğəmbər

öz yeni və keçmiş səhabələri ilə birgə Məkkədən qayıdarkən Məkkə ilə Mədinə arasında olan Cüfrə və sonra isti və quru yer olan Qədir-Xum çölünə yetişdilər. Bura dörd yol ayrıcı olduğuna görə, müsəlmanlar bir-birindən ayrılmalı idilər. Onlar bir-birindən ayrılmamış peyğəmbər bütün müsəlmanların dayanmasını əmr etdi. İrəlidə gedənlər geriyə qayıtdı, arxada qalanlar isə gəlib yetişdilər. Hava həddən artıq isti idi, heç bir kölgəlik gözə dəymirdi. Müsəlmanlar günorta namazını peyğəmbərlə birgə qılıb, hərə öz çadırına dincəlməyə getmək istədikdə peyğəmbər onlara əmr etdi ki, .dayansınlar. Görünür, çox mühüm bir xəbər var imiş və hamı bu xəbəri dinləməli imiş

Peyğəmbər üçün dəvələrin kəcavəsindən bir minbər hazırlandı. Peyğəmbər minbərə çıxıb Allaha həmd-səna etdikdən sonra üzünü camaata tutub dedi: «Mən tezliklə sizin aranızdan gedəcəyəm. Mən də məsuliyyət daşıyıram, siz də. Siz mənim barəmdə necə şəhadət verirsiniz? (Məni necə tanıyırsınız)» Camaat uca səslə dedi: «Biz şəhadət veririk ki, sən öz peyğəmbərlik vəzifəni lazımınca yerinə yetirdin. Bizlərə yalnız xeyirli nəsihətlər etdin və bizim düz yola gəlməyimiz üçün əlindən gələni əsirgəmədin. Allah sənə xeyir versin.» Peyğəmbər buyurdu: «Siz Allahın təkliyinə, mənim peyğəmbər olmağıma, qiyamət gününə və o gün ölülərin diriləcəyinə şəhadət verirsinizmi? (Bunları qəbul edirsinizmi)» Müsəlmanlar hamısı bir ağızdan «Bəli, şəhadət veririk» dedilər. Peyğəmbər buyurdu: «İlahi! Şahid ol (ki, bunlar şəhadət verdilər). Sonra «?peyğəmbər buyurdu: «Ey camaat! Mənim səsimi eşidirsinizmi

«.Camaat dedi: «Bəli

Səhranı sükut bürümüşdü. Səhranın isti küləyindən başqa heç nə eşidilmirdi. Peyğəmbər sözünə davam edib dedi: «Deyin, görüm, məndən sonra sizin aranızda əmanət qoyduğum bu iki şeylə necə rəftar edəcəksiniz?» Bir nəfər yerdən uca səslə qışqırıb dedi: «Ey Allahın rəsulu! Hansı iki şeyi deyirsən?» Peyğəmbər buyurdu: «Biri Quran, ikincisi isə Əhli-Beytimdir. Bunlardan əl çəkməyin. Allah mənə xəbər vermişdi ki, bu iki şey Behiştdə mənimlə birləşənə qədər heç vaxt bir-birindən ayrılmaz. Bu iki şeydən qabağa keçməyin, geri qalmayın, yoxsa həlak olarsınız.» Bu zaman peyğəmbər(s) öz ətrafına göz gəzdirirdi. Elə bil, kimisə axtarırdı. Gözü Əli(ə)-a sataşdıqda əyilib onun əlini tutub o qədər qaldırdı ki, hər ikisinin qoltuğunun altı göründü. Camaat hamısı Əli(ə)-ı görüb tanıdı. Peyğəmbər səsini ucaldıb dedi: «Ey

camaat! Sizə özünüzdən də yaxın və mehriban kimdir?» Camaat «Allah və onun Rəsulu daha yaxşı bilər» deyə cavab verdi. Peyğəmbər(s) buyurdu: «Allah mənim mövla və rəhbərim, mən də sizin mövla və rəhbərinizəm. Sizə özünüzdən də yaxın və mehribanam.» Daha sonra əlavə edərək dedi: «Mən hər kimin rəhbəriyəmsə, Əli(ə)-da «.onun rəhbəridir

Peyğəmbər bu cümləni üç dəfə təkrar etdi. Bəzilərinin dediyinə görə isə, cümlə dörd .dəfə təkrar edilmişdir

Peyğəmbər(s) bu cümləni dedikdən sonra üzünü göyə tutub dua etdi: «İlahi! Onunla dostluq edənlərlə sən də dostluq et, onunla düşmən olanlara sən də düşmən ol. Onu sevənləri sən də sev, onunla kin saxlayanları məhv et. Dostlarına kömək et, düşmənlərini isə köməyindən məhrum et. Haqqı həmişə onunla, onu da həmişə haqqla «.birgə et

Sonra Peyğəmbər orada olanların bu xəbəri orada olmayanlara çatdırmasını istədi. Toplanmış insanların sırası dağılmamış Cəbrail nazil olub peyğəmbərə bu ayəni gətirdi: «Bu gün dininizi tamalayıb mükəmməl etdim, sizə olan nemətimi başa çatdırdım və bir din kimi sizin üçün İslamı bəyənib seçdim.» (Maidə, ٣) Bu zaman peyğəmbər camaata dedi: «Allahu əkbər, Allahu əkbər. Allah bu gün dinimizi kamil edib öz nemətlərini bizə tamam etdi, mənim risalətimdən və Əlinin məndən sonra imam və rəhbər olacağına «.öz razılığını bildirdi

Peyğəmbərin söhbəti başa çatdıqdan sonra camaat arasında səs-küy başladı. Orada olanların hamısı Əli(ə)-ı bu məqama nail olması münasibətilə təbrik edir, ürək sözlərini

deyirdilər. O cümlədən, Əbu Bəkr və Ömər camaatın içərisindən irəli çıxıb Əli(ə)-a dedilər: «Eşq olsun sənə, eşq olsun sənə, ey Əbu-Talibin oğlu! Bu gündən mənim və «.digər mömin kişi və qadınların rəhbəri oldun

Bu hədisi bir çox İslam alimləri müxtəlif ifadələrlə öz kitablarında qeyd etmişlər. Bu hədisin peyğəmbərdən söylənilməsin heç kimin şəkk-şübhəsi yoxdur. Bu hədisi mühəqqiq Əllamə Əmini Əl-Qədir kitabında ١١٠ səhabədən və ٣۶٠ kitab və İslam alimlərindən nəql etmişdir. Sünni alimlərinin tarix, təfsir, hədis kitablarında da bu hədis söylənilmişdir. Hətta bəzi alimlər bu hədis haqqında ayrıca kitab yazmışlar. O cümlədən, Əllamə Əmini Qədir-Xum hədisi barədə ayrıca bir kitab yazmış və həmin .kitabda İslam alimlərinin adları çəkilmişdir

Bu hədisin doğruluğunu inkar edə bilməyən bəzi şəxslər onu imamət məsələsindən başqa məsələyə aid etməyə cəhd göstərmişlər. Buna görə də, hədisdə olan «mövla» sözünü rəhbər mənasına yox, dost mənasında tərcümə və təfsir etmişlər. Lakin hədisin məzmununa nəzər saldıqda, eləcə də hədisin söylənildiyi zaman və məkan şəraitinə diqqət yetirdikdə məlum olur ki, «mövla» sözü imam və rəhbərdən başqa bir :şey deyildir. Bunun üçün bir neçə sübut da gətirmək olar

A)Keçən dərsdə oxuduğumuz «Təbliğ» ayəsi bu hadisədən qabaq nazil olmuşdur və söhbətin adi dostluqdan getmədiyinə şahiddir. Çünki bunun üçün narahatlıq lazım deyil. (Peyğəmbər isə çox narahat idi. Deməli, söhbət dostluqdan getmir.) Digər tərəfdən də «Əlyəvmə əkməltu ləkum dinəkum və...» ayəsinin bu hadisədən sonra nazil olması bir daha sübut edir ki, məsələ dostluq məsələsi yox, imamət kimi çox mühüm .bir məsələ imiş

B)Hədisdən qabaq olan hazırlıqlar, qızmar günəş altında isti səhrada camaatı saxlayıb geniş bir xütbə oxumaq, camaatdan iqrar və etiraf almaq hamısı bizim iddianı isbat .edir

V)Müxtəlif dəstələr və şəxslərdən Əli(ə)-ın ünvanına söylənən təbriklər, yazılan şerlər .isbat edir ki, Əli(ə) imamət məqamına nail olmuşdur

**.Fikirləşin və cavab verin**

.Qədir-Xum hadisəsini izah edin-۱

Nəyə görə Qədir-Xum hədisindəki «mövla» sözü dost mənasında yox, rəhbər və-۳ ?imam mənasındadır

?Peyğəmbər bu hədisi dedikdən sonra Əli(ə) barədə nə dua etdi-۴

?Qədir və Cüfrə haradadır-۵

## VII DƏRS

### Mənzilət hədisi

Mənzilət hədisi

Böyük şiə və sünni təfsirçilərinin bir çoxu «Mənzilət» hədisini «Əraf» surəsinin ۱۴۲-ci ayəsində söhbət olunan «Musanın ۴۰ günlük Allah hüzuruna getməsi və qardaşı .Harunun onun yerində canişin olması» hadisəsinin əsnasında bəyan etmişlər

Mənzilət» hədisi belədir: «Peyğəmbər(s) Təbuk meydanına tərəf getmək istəyirdi.» Peyğəmbərə xəbər çatmışdı ki, Roma imperiyası Hicaz, Məkkə və Mədinəni tutmaq üçün böyük bir qoşun hazırlayıb. Peyğəmbər(s) böyük bir qoşun hazırlayıb Təbuk məntəqəsinə tərəf hərəkət etdi. Hərəkət etməzdən qabaq Əli(ə)-ı öz yerində canişin təyin edib Mədinədə saxladı. Əli(ə) peyğəmbərə buyurdu:-Ya Rəsulallah! Məni burada uşaqlar və qadınların yanında saxlayırsan? (İcazə vermirsən mən də sizinlə bu cihadda iştirak edib bu böyük şərəfə nail olam?) Peyğəmbər buyurdu: «Sən razı deyilsənmi ki, sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimi olsun? Təkcə bir fərqi var (ki, məndən sonra peyğəmbər olmayacaq.»(۱



---

Mənzilət sözünün mənası nisbət, əlaqə, yövmuddar sözünün mənası isə evə [۱] -۱ .dəvət günü deməkdir

Bu hədis sünnilərin ən məşhur və tanınmış kitablarında yəni Müslim və Buxarinin səhihlərində gəlmişdir. Eləcə də, sünnilərin bir çox hədis kitablarında, o cümlədən İbn Macənin sünəni, Tirmizinin sünəni, Əhmədin müsnədi və s. kitablarda bu hədis söylənilmişdir. Hədisi söyləyən səhabələrin sayı isə iyirmi nəfərdən artıqdır. Cabir ibn Abdullah Ənsari, Əbu Səid Xidri, Abdullah ibn Məsud və Müaviyəni bunlara nümunə .gətirmək olar

Bağdadın tarixi» kitabının müəllifi Əbu Bəkr Bağdadi öz kitabında Ömər ibn Xəttabdan» :belə rəvayət edir: «(Ömərin dilindən:)» Gördüm, bir kişi Əlini söyür. Ona dedim

Məncə, sən münafiqsən. Çünki mən peyğəmbərin Əliyə «sənin mənə nisbətin-Harunun Musaya olan nisbəti kimidir. Təkcə bir fərq var ki, məndən sonra peyğəmbər .olmayacaq» dediyini eşitmişəm

Diqqəti cəlb edən budur ki, mötəbər hədis mənbələrində Peyğəmbərin bu sözü (hədisi) təkcə Təbuk döyüşünə gedərkən demədiyi təsdiq olunur. O, bu hədisi yeddi müxtəlif :yerdə buyurmuşdur

Məkkədə təzəcə iman gətirmiş müsəlmanlarla qardaşlıq siğəsi oxuduğu zaman Əlini(١ .özünə qardaş etmiş və bu hədisi demişdir

Mədinədə mühacir və ənsar arasında qardaşlıq əhd-peyman bağladığı zaman(٢ .peyğəmbər Əlini(ə) özünə qardaş etmiş və bu hədisi söyləmişdir

Peyğəmbər məscidinə açılmış qapıların bağlanması əmrini verdikdə Əli(ə)-ın qapısını(٣ .istisna etmiş və bu hədisi buyurmuşdur

Təbuk döyüşünə gedərkən bu hədisi söyləmişdir. Bu, daha üç yerdə də sünni(۴ .kitablarında gəlmişdir

Deməli, hədisin sənədi cəhətdən şübhə yeri qalmır və onun mənasının ümumiyyəti də .öz yerindədir

### Mənzilət» hədisinin əhatə dairəsi»

Əgər bu hədisi heç bir məzhəbi nəzərə almadan, tərəfkeşlik etmədən araşdırsaq,

məlum olacaq ki, Əli(ə) Bəni-İsrail içində Harunun Musaya olan nisbətinin, məqamının və xüsusiyyətlərinin hamısına malikdir. Çünki hədisdə heç bir qeyd, şərt yoxdur. Buna :əsasən, bu hədisdən aşağıdakı nəticələri çıxarmaq olar

Əli(ə) peyğəmbərdən sonra ümmətin ən fəzilətli şəxsiyyətidir. (Çünki Harun da bu(١ (.xüsusiyyətə malik idi

Əli(ə) peyğəmbərin vəziri, xüsusi müavini və rəhbərlik işlərində şərikidir. Çünki bu(٢ xüsusiyyətlərin hamısı Harun üçün Quranda (Ta-Ha surəsinin ٢٩-cu ayəsindən ٣٢-ci .ayəsinə qədər) qeyd olunmuşdur. Deməli, Əli(ə)-da bu xüsusiyyətlərə malikdir

Əli peyğəmbərin canişini olmuşdur. O olan yerdə daha başqa bir şəxs xəlifə ola(٣ bilməz. Necə ki, Harun Musanın canişini olmuş və o sağ olan müddətdə başqa bir şəxs .Musanın yerinə xəlifə olmamışdır

**Yəumud-dar» hədisi»**

İslam tarixində deyilənə əsasən, peyğəmbər(s) bisətin üçüncü ilində o vaxtadək həyata keçirdiyi gizli dəvətləri aşkar etdi. Bu, «Şüəra» surəsinin ٢١۴-cü ayəsində bəyan olunmuşdur. «Və ən yaxın qohumlarını qorxut! (İlk növbədə ən yaxın qohumların olan Haşim və Müttəlib oğullarını yalnız Allaha ibadət etməyə çağır və əks təqdirdə müdhiş «(.bir əzaba düçar olacaqlarını xatırlat

Peyğəmbər ən yaxın qohumlarını əmisi Əbu Talibin evinə dəvət etdi. Nahar yedikdən sonra peyğəmbər qohumlarına xitab etdi: «Ey Mütəllibin oğulları! Mən ərəblər arasında bir nəfərin öz qövmü, tayfası üçün, mənim sizin üçün gətirdiyim şeydən yaxşı şey gətirdiyini

görməmişəm. Mən sizin üçün dünya və axirət xeyrini gətirmişəm. Allah mənə sizi bu müqəddəs dinə dəvət etməmi əmr edib. Sizlərdən hansınız bu işdə mənə kömək edib mənim qardaşım və canişinim olarsınız?» Heç kəsdən səs çıxmadı. Elə bil, məclisdəkilərin hamısı ölmüşdü. Bu zaman hamıdan kiçik olan Əli(ə) ayağa qalxıb dedi: «Ey Allahın Rəsulu! Mən bu işdə sənə kömək edərəm.» Peyğəmbər(s) əlini Əlinin çiyninə qoyaraq buyurdu: «Bu, sizin aranızda mənim qardaş və canişinimdir. Ona qulaq asın və ona tabe olun.» Peyğəmbərin qohumları isə bununla razılaşmamaqla kifayətlənməyib, üstəlik ona qarşı çıxmağa başladılar. Yəumud-dar (evə dəvət günü) adı ilə məşhur olmuş bu hədis hər şeyi açıb söyləyir. Sənəd cəhətdən bir çox sünni alimləri, o cümlədən, İbn Əbi Cərir, İbn Əbi Hatəm, İbn Murdəviyə, Əbu Nəim, Bəyhəqi, Sələbi, .Təbəri, İbn Əsir, Əbulfida və bir çoxları bu hədisi qeyd etmişlər

Bu hədisi qəsdi-qərəzsiz nəzərdən keçirdiyiniz zaman, Əli(ə)-ın imamət və xilafəti .bizim üçün aşkar olur. Çünki bu hədis hər şeyi açıq-aşkar bəyan etmişdir

### Fikirləşin və cavab verin

?Mənzilət» hədisi hansıdır? Peyğəmbər(s) bu hədisi neçə dəfə söyləmişdir«-١

?Mənzilət» hədisinin əhatə dairəsi hansı məqamları Əli(ə) üçün isbat edir«-٢

?Quran ayələrinə əsasən Harun Musaya nisbətdə hansı mövqeləri tuturdu-٣

?Mənzilət» hədisini hansı alimlər rəvayət etmişlər«-۴

Yəumud-dar» hədisini, onun əhatə dairəsini, sənədini və ondan alınan nəticəni izah«-۵ .edin

## VIII dərs

### Səqələyn» və «Nuhun gəmisi» hədisləri«

Səqələyn» hədisinin sənədi«

Şiə və sünni alimlərinin məşhur hesab etdikləri hədislərdən biri də «Səqələyn» (iki böyük əmanət) hədisidir. Bu hədisi səhabələrin bir dəstəsi bilavasitə peyğəmbərin özündən

rəvayət etmişdir. Bəzi alimlərin dediyinə görə, bu hədisi otuz nəfər ravi nəql etmişdir. Bir çox təfsirçi, tarixçi və hədis yazanlar bu hədisi öz kitablarında qeyd etmişlər. Buna görə də, bu hədisin məşhurluğuna heç kimin şübhəsi yoxdur. Böyük alim Seyyid Haşim Bəhrani «Qayətül-məram» kitabında bu hədisi otuz doqquz sünni və səksən şiə alimindən söyləmişdir. Başqa bir alim Mir Hamid Hüseyn Hindi isə bir az da çox təhqiqat aparmış və bu hədisi iki yüzsünni alimindən rəvayət etmişdir. O, bu hədis barədə təhqiqatı altı cildli kitabda toplamışdır. Bu hədisi söyləmiş məşhur şəxsiyyət və səhabələrdən Əbu Səid Xidri, Əbuzər Qəffari, Zeyd ibn Ərqəm, Zeyd ibn Sabit, Əbu Rafi, Cübeyr ibn Mütim, Xüdeyfə, Zümrə Əsləmi, Cabir ibn Abdullah Ənsari və Ümmü .Sələmə (Peyğəmbərin həyat yoldaşlarından biri) kimilərini nümunə göstərmək olar

Əbuzər Qəffarinin dediyinə əsasən, hədis belədir: Əbuzər Kəbənin qapısından yapışıb üzünü camaata tutaraq xitab etdi: Mən Peyğəmbərin bu cür dediyini eşitdim: «Mən sizin aranızda iki böyük əmanət və yadigarımı qoyub gedirəm. Biri Quran, digəri isə Əhli-beytimdir. Bu iki şey Cənnətdə Kövsər bulağının başında mənə qovuşmayınca bir-(?birindən ayrılmayacaqlar.» (Görüm, mənim əmanətimlə necə rəftar edəcəksiniz

Bu hədis sünnilərin ən məşhur kitablarında da rəvayət olunmuşdur. Məsələn, .Tirmizinin sünəni, Nisainin sünəni, Əhmədin müsnədi, Kənzul-ummal və s

Bu hədisi qeyd etmiş kitabların əksəriyyətində «səqələyn», yəni, «iki dəyərli şey» sözündən istifadə olunub. Bəzi kitablar da var ki, «səqələyn» sözünü «xəlifətəyn», yəni, «iki xəlifə» sözü ilə əvəz edir. Əlbəttə, bu iki sözün arasında məna cəhətdən heç bir fərq .yoxdur

Təəccüblü budur ki, bu hədisi peyğəmbər bir neçə yerdə söyləmişdir. Cabir ibn Abdullah Ənsarinin dediyindən məlum olur ki, peyğəmbər bu hədisi Həcc ziyarətində olarkən Ərəfə günü۵ söyləmişdir. Abdullah ibn Həntəbin dediyindən məlum olur ki, bu hədis Cühfə məntəqəsində deyilmişdir. Ümmü Sələmənin rəvayətindən məlum olur ki, peyğəmbər

bu hədisi Qədir-Xumda bəyan etmişdir. Bəzi rəvayətlərdə peyğəmbərin bu hədisi Mədinədə minbərdə olarkən bəyan etdiyi söylənilir. Sünni məzhəbinin görkəmli alimlərindən olan İbn Həcər «Səvaiqul-muhriqəh» kitabında yazır ki, peyğəmbər bu hədisi deyib qurtardıqdan sonra Əli(ə)-ın əlini tutub göyə qaldıraraq buyurdu: «Bu Əli həmişə Quranla, Quran da həmişə onunladır. Kövsər bulağının başında (Cənnətdə) «.mənə qovuşmayınca bir-birindən ayrılmazlar١

Beləliklə də məlum olur ki, Peyğəmbər(s) bu məsələni bir əsas və əsl hesab edərək həmişə ona toxunurdu. Fürsət düşən kimi, bu məsələni ortaya atır və bununla da onu .yaddan çıxarmağa qoymurdu

### Səqələyn» hədisinin əhatə dairəsi»

:Burada bir neçə məsələ diqqəti cəlb edir

Quran və Əhli-beytin iki xəlifə və yaxud iki bahalı şey adlandırılmasından məlum olur(١ ki, müsəlmanlar heç vaxt bu iki şeydən əl çəkməməlidirlər. Xüsusən, bəzi rəvayətlərdə gəlmiş «bu iki şeydən əl çəkməsəniz, heç vaxt yolunuzdan azmazsınız» kimi ifadələr bu .həqiqəti bir az da qabardır

Quranın Əhli-beytlə və Əhli-beytin də Quranla birgə deyilməsi isbat edir ki, Quran(٢ .səhvdən uzaq olub məsum olduğu kimi, Əhli-beyt də səhvsiz və məsumdur

Bəzi rəvayətlərdə peyğəmbərin camaata «mən qiyamət günü bu iki şey haqqında(٣ .sizdən sual edəcəyəm, görüm, onlarla necə rəftar etmisiniz» dediyi söylənilir

Əhli-beyti necə təfsir ediriksə, edək, Əli(ə) onun ən aşkar bir nümunəsi olacaq. Bəzi(۴ .rəvayətlərə görə o heç vaxtQurandan, Quran da ondan ayrılmadı

Bundan əlavə, bir çox rəvayətlərdə gəlmişdir ki, peyğəmbər «Mübahilə»١ ayəsi nazil olduqda Əli, Fatimə, Həsən və Hüseyni yanına alıb «bunlar mənim Əhli-beytimdir» deyə .buyurmuşdur

Qiyamətin bir çox məsələlərinin bu dünyada bizlər üçün məlum olmasına(۵ baxmayaraq, bir çox hədislərdən məlumdur ki, Cənnətdə olan Kövsər bulağı doğru

.möminlərlə, Peyğəmbər və Əhli-beytə məxsusdur

Dediklərimizdən məlum olur ki, müsəlmanların Peyğəmbərdən sonrakı rəhbəri Əli(ə), .ondan sonra isə Əhli-Beytdən olan digər on bir imamdır

Nuhun gəmisi» hədisi»

Nuhun gəmisi» ləqəbi ilə məşhur olan hədis peyğəmbərin şiə və sünni kitablarında» .gəlmiş gözəl ifadələrindən biridir

Əbuzər Qəffari deyir: «Peyğəmbər buyurdu: «Mənim sizin aranızda olan Əhli-beytim Nuh peyğəmbərin gəmisinəbənzəyir. Hər kəs o gəmiyə minərsə, nicat tapar, kim də ona minməzsə, boğular.» (Yəni, kim Əhli-Beytimin yolunu getsə, səadətə, kim (.getməsə, azğınlığa yetişər

Nuhun gəmisi tufan baş verən zaman tək pənah yeri olduğu kimi, peyğəmbərdən .sonra baş verən (mənəvi) tufanlardan pənah aparılan yer də yalnız onun Əhli-beytidir

### Fikirləşin və cavab verin

?Səqələyn» hədisinin əhatə dairəsi nədir».١

Bu hədis Əhli-beyt üçün hansı üstünlükləri isbat edir? «Səqələyn» sözünün mənası ?nədir

?Səqələyn» hədisini kimlər rəvayət etmişlər».٢

Səqələyn» sözünün mənası nədir? Başqa hədislərdə bu sözün yerinə digər ifadədən» .٣ ?istifadə olunubmu

?Peyğəmbər(s) bu hədisi haralarda söyləmişdir.۴

.Nuhun gəmisi» hədisinin sənəd və əhatə dairəsini bəyan edin«.۵

## IX dərs

### On iki imam

## On iki imam haqqında hədislər

Əmirəl-möminin Həzrət Əli(ə)-ın peyğəmbərin birinci canişin və xəlifəsi olduğunu isbat .etdikdən sonra növbə digər on bir imamın imamətinə yetişdi

Şiə və sünni kitablarında on iki imamın xilafətini sübut edən bir çox hədislər gəlmişdir. Bu hədislər sünnilərin Müslim, Buxari, Tirmizi, İbna Davudun səhihləri, Əhmədin müsnədi kimi məşhur kitablarında da yazılmışdır. «Müntəxəbul-asar» kitabında bu barədə ٢٧١ hədis qeyd olunmuşdur. Bu hədislərin bir çoxu sünnilərdən, qalanı isə şiələrdən rəvayət olunmuşdur. Misal üçün, sünnilərin ən məşhur kitabı olan Buxarinin səhihində deyilir: «Cabir ibn Sümrə deyir, Peyğəmbər buyurdu: «Məndən sonra ١٢ xəlifə olacaq (Sonra bir cümlə dedi, lakin mən onu eşitmədim.(١) Atam dedi ki, Peyğəmbər belə buyurdu:). Onların hamısı Qüreyşdən olacaq.» Müslimin səhihində isə bu hədis bu cür söylənilmişdir: «Cabir ibn Sümrə deyir: «Peyğəmbər buyurmuşdur: Yəni, «İslam on iki imam imamlıq edənədək əziz olacaqdır. (Sonra bir cümlə buyurdu, lakin mən onu başa düşmədim. Atamdan Peyğəmbərin nə dediyini soruşduqda cavab verdi:- «.Peyğəmbər buyurdu ki,) onların hamısı Qüreyşdəndir

Əhmədin müsnədində Abdullah ibn Məsuddan belə rəvayət olunur ki, Peyğəmbərdən ondan sonrakı xəlifələr barədə sual olunduqda «Onlar da (xəlifələr də) Bəni-İsrailin .başçıları kimi on iki nəfər olacaqlar» buyurmuşdur

### Bu hədislərin əhatə dairəsi

Bəzilərində «İslamın izzəti»nin on iki xəlifənin olması və bəzilərində də din və şəriətin qiyamətədək bu xəlifələrin olması ilə qorunub saxlanılacağını, özü də bu xəlifələrin yalnız Qüreyş və Bəni Haşimdən olacağını qeyd edən hədislər İslam məzhəbləri arasında şiə məzhəbindən başqa heç bir məzhəblə uyğun gəlmir. Çünki şiələr bu hədisi həqiqətən də, onlara başçılıq etmiş və indi də başçılıq edən on iki imam mənasında .təfsir etmişlər. Sünnilər isə bu hədislərin təfsirində müşküllə üzləşmişlər

Hədislərdə gəlmiş on iki xəlifə dedikdə Raşidi, Bəni-Ümməyə xəlifələri, yoxsa Abbasi xəlifələri anlaşılmalıdır? Bu xəlifələrin heç birinin sayı on iki olmamışdır. On iki ədədi bu xəlifələrin heç biri ilə uyğun gəlmir. Bundan əlavə, Bəni-Ümməyə xəlifələri arasında

Yezid, Bəni-Abbas xəlifələri arasında da Mənsur Dəvəniqi, Harun ər-Rəşid kimi zülm və sitəmdə məşhur xəlifələr heç vaxt peyğəmbərin canişini olmağa layiq ola bilməzlər. Onların zülmkar olduqlarına heç kimin şübhəsi yoxdur. Bu cür şəxslər İslama rəhbərlik edə bilməzlər. Xilafətin şərtlərini nə qədər asanlaşdırsaq da, yenə də onlar xəlifə ola bilməzlər. Bundan əlavə, nəzər saldıqda on iki ədədinin şiə xəlifələri və imamlardan başqa xəlifələrlə uyğun olmadığını görürük. Yaxşı olar ki, bu barədə sözü sünnilərin məşhur və görkəmli alimlərinin birinin dilindən eşidək. Süleyman ibn İbrahim Qunduzi Hənəfi «Yənabiul-məvəddət» kitabında deyir: «Təhqiqatçıların bəziləri deyirlər: Bir çox sənədlərlə Peyğəmbərdən rəvayət olunan və Peyğəmbərdən sonrakı xəlifələrin sayının on iki olduğunu bildirən hədislərin mənası zaman ötdükcə məlum olur. Zaman ötdükcə məlum olur ki, on iki xəlifə dedikdə Peyğəmbər onun Əhli-Beytindən olan on iki imamı nəzərdə tutmuşdur. Çünki bu rəqəm digər xəlifələrdən nə Raşidi xəlifələri ilə, nə Bəni- Üməyyə xəlifələri ilə, nə də Abbasi xəlifələri ilə uyğun gəlmir. Raşidi xəlifələri yalnız dörd nəfər olmuşlar. Bəni-Üməyyə xəlifələri on dörd olmuşlar. Bundan əlavə, onlar Bəni-Haşimdən olmamışlar. Peyğəmbər(s) isə onların hamısının Bəni-Haşimdən olduğunu qeyd etmişdir. Peyğəmbərin «onların hamısı Bəni- Haşimdəndir» cümləsini yavaş deməsi də bunu sübut edir. Çünki bəziləri Bəni Haşimin rəhbərlik etməsindən .razı deyildi

Bəni Abbas xəlifələri isə iyirmi beş nəfər olmuşlar. Bundan əlavə, onlar «Mən sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində qohumluq məhəbbətindən başqa bir şey



---

.Buxarinin səhihi. C-۹, S-۱۰۰ [۲] -۱

istəmirəm» (Şura, ۲۳) ayəsinə, «Kisa»۱ hədisinə əməl etməyib Peyğəmbərin .qohumlarına (Əhli-beytə) əllərindən gələn zülmü etmişlər

Deməli, bu hədis yalnız Əhli-Beytdən olan on iki imama uyğun gəlir. Onlar elm cəhətdən hamıdan bilikli, təqva cəhətdən hamıdan təqvalı, əsl-nəcabət cəhətdən hamıdan üstündürlər. Onlar peyğəmbərin elminin varisi olan şəxsiyyətlərdir. Peyğəmbərdən rəvayət edilən «Səqələyn» və digər hədislər bu nəzəriyyəni təsdiq edir.» (.(Yənabiul məvəddət. S, ۴۴۶

Təəccüblüsü budur ki, bəzi sünni alimləri bu hədisi gülünc mənada şərh edirlər. Onlar deyirlər: «Ola bilsin, Peyğəmbər on iki xəlifə deyərkən İslamın ilk dörd xəlifəsini və gələcəkdə olacaq, hələ ortaya çıxmamış bəzi xəlifələri nəzərdə tutmuşdur.» Bu sözlə .peyğəmbərin hədisindəki xəlifələr arasında əlaqə və bağlılıq aradan qalxır

Biz isə deyirik: Nəyə görə bu hədisi Əhli-beytdən olan on iki imam mənasına təfsir etməməklə özümüzü çətinliklərlə üzləşdirək? Ola bilsin, sonda heç bir nəticəyə də gələ .bilməyək

### İmamların adları ilə təyin olunması

Diqqəti cəlb edən budur ki, sünni kitablarında Peyğəmbərdən söylənilmiş bəzi .hədislərdə on iki imamın adı və atasının adı açıq-aşkar çəkilmişdir

Sünnilərin görkəmli alimlərindən olan Şeyx Süleyman Qunduzi «Yənabiul- məvəddət» kitabında yazır: «Nəsəl adlı yəhudi bir kişi peyğəmbərin hüzuruna gəlib ona bir neçə sual verdi. Sualların əsnasında Peyğəmbərin özündən sonrakı xəlifələr barədə sual etdikdə, Peyğəmbər ona belə cavab verdi: «İnnə vəsiyyi Əliyyubnu Əbi Talib və bədəhu «.sibyətil Həsəni vəl Husəyn təluhu tisətu əimmətin min sülbil Husəyn

«.Qalə ya Muhəmməd fəsəmmihim li»

Qalə iza məzəl Husəyn fəbnuhu Muhəmməd, fəiza məza Muhəmmədun fəbnuhu» Cəfər, fəiza məza Cəfərun fəbnuhu Musa, fəiza məza Musa fəbnuhu Əliyy, fəiza məza Əliyyun fəbnuhu Muhəmməd, fəiza məza Muhəmmədun fəbnuhu Əliyy, fəiza məza Əliyyun fəbnuhul Həsən, fəiza məzəl Həsənu fəbnuhul Huccətu Muhəmmədunil

Məhdiyyi(s) fəhaulai isna əşər.» «Mənim canişinim Əli(ə), ondan sonra iki oğlum Həsən «.və Hüseyn və Hüseyndən sonra onun nəslindən olan digər doqquz övladım olacaqdır

.Yəhudi kişi peyğəmbərdən onların adlarını çəkməsini istədi

Peyğəmbər buyurdu: «Hüseyn dünyadan getdikdən sonra oğlu Əli (Zeynül Abidin), o dünyadan getdikdən sonra oğlu Məhəmməd (Baqir), o dünyadan getdikdən sonra oğlu Cəfər (Sadiq), o dünyadan getdikdən sonra oğlu Musa(Kazim), o dünyadan getdikdən sonra oğlu Əli(Rza), ondan sonra onun oğlu Mühəmməd(Təqi), ondan sonra onun oğlu Əli (Nəqi), ondan sonra onun oğlu Həsən(Əsgəri), ondan sonra onun oğlu Hüccət Məhəmməd əl-Mehdi canişin olacaqdır. Bunlar on iki imamdır.» (Yənabiul- məvəddət. (S, ۴۴۱

Yenə də həmin kitabda on iki imamın adları, ləqəbləri verilmiş və Həzrət Mehdinin qeyb olmasından sonra zühur edib yer üzündə ədaləti bərpa edəcəyindən xəbər .vermiş hədis qeyd olunmuşdur

Bu barədə şiə kitablarında da çoxlu hədislər gəlmişdir. Onları burada qeyd etməyə .ehtiyac duyulmur

**...Ölərkən imamını tanınmayan şəxs**

Peyğəmbərin sünnilərin hədis kitablarında gəlmiş hədisində oxuyuruq: «Kim ölən zaman imamı olmadan dünyadan getsə, onun ölümü cahiliyyət dövrünün ölümü kimidir.» Bu hədis şiə kitablarında kiçik bir fərqlə qeyd olunmuşdur: «Kim ölən zaman öz «.imamını tanımasa, onun ölümü cahiliyyət dövrünün ölümü kimidir

Bu hədisdən belə nəticə çıxır ki, yer üzündə hər zaman məsum bir imam vardır. Bütün insanlar onu tanımalıdırlar. Onu tanımamaq insanı küfrlə İslam arasında təhlükəyə .salır

İmam deyərkən hökumət başında olan şəxslərmi nəzərdə tutulur? Şübhəsiz ki, bu suala mənfi cavab veriləcək. Çünki onlar məsum şəxslər deyillər. Onda, bu imam məsum bi şəxsdir və mütləq onu axtarıb tapmaq lazımdır (Ona əqidə bağlamaq .lazımdır). Onun rəhbərliyini qəbul etmək bütün müsəlmanların vəzifəsidir

İmamların hər birinin imamətini sübut etmək üçün yuxarıdakı hədisdən başqa bir yol .da vardır. O da budur ki, bir imam özündən sonrakı imamı tanıtdırır

.Möcüzə yolu ilə də onların imaməti sübut olunur

### Fikirləşin və cavab verin

?On iki imam barədə hədislər hansı kitablarda gəlmişdir-١

?Bu hədislərin əhatə dairəsi nədir-٢

?Bu hədisləri hansı mənalarda təfsir etmişlər-٣

?Sünni kitablarında yazılmış hədislərdə on iki imamın adı çəkilibmi-۴

?On iki imamın imamətini isbat etmək üçün hansı yollar var-۵

## X DƏRS

### (On ikinci imam və dünyanın böyük islahedicisi Həzrət Mehdi (ə.c

Zülmət gecənin sonu

Dünyanın hal-hazırki vəziyyətini nəzərə aldıqda, cinayətləri, ölümləri, müharibələri, nahaq axıdılan qanları, beynəlxalq ixtilafları, əxlaqi fəsadları müşahidə etdikdə insan bu vəziyyətin nə vaxtadək davam edəcəyini düşünür. Bu cinayətlərin qarşısı alınmayacaqmı? Əxlaqi fəsadlar üfunətli bataqlıq kimi daima insanları özünəmi çəkəcək? Yoxsa, nicat və İslam üçün bir ümid yeri var? Bu mühüm sualın qarşısında iki cavab durur. Birinci cavabı materialistlər verib deyirlər: «Dünyanın gələcəyi zülmətə .«doğru gedir. Hər bir an gözlənilən təhlükələr yarana bilər

Lakin səmavi şəriətlərə inanan şəxslər, xüsusən müsəlmanlar, xüsusən də şiələr bu

suala başqa cür cavab verirlər. Onlar deyirlər ki, bu zülmət gecənin bir sonu var. Vaxt gələcək bu ölüm buludları başımızın üstündən çəkilib gedəcək, parlaq günəş bütün səmanı əhatə edəcək. Bu çətinliklər həmişə bizimlə olmayacaq.Yaxında nicat sahili gözə görünür. Aləm böyük bir islahedici intizarındadır. O, gələrək yer üzünü ədalətlə .dolduracaq

.Bütün məzhəblərə xidmət edən adamlar bu islahedicini bir adla tanıyırlar

#### Fitrət və böyük islahedicinin zühuru

Bəzən ağıldan da üstün olan batini ilhamlar, təkcə Allahı tanıma bölməsində yox, əksinə, bütün əqidə məsələlərində bizə rəhbərlik edə bilər. Bu ilhamlar bu məsələdə də bizə rəhbərlik edir. Bunun nişanələri: Ən əvvəl, bütün insanlar ümumi ədalətin bərqərar edilməsiniistəyirlər. Çünki insanların hamısı ədalət aşiqidirlər. Hamı dünyada .sülhün, ədalətin bərqərar olunmasını istəyir və bunun üçün əllərindən gələni edirlər

Böyük bir islahedicinin zühurunun fitri olduğuna bundan yaxşı dəlil ola bilməz. Çünki bir şeyin, bir istəyin ümumiliyi, onun fitri olduğunu bildirir (Diqqətli olun). Hər fitri eşq bir məşuqun olduğunu bildirir. Necə ola bilər ki, Allah bu eşqi insanın vücudunda yaratsın, lakin bu eşqi təmin etmək üçün bir məşuq yaratmasın? Buna görə də deyirik ki, insanların ədalət tələb edən fitrəti nəhayət dünyanın ədalətlə dolacağını iddia edir. Zülm itib aradan gedərək. Bəşəriyyət vahid bir dövlət kimi bir bayraq altında birləşib .yaşayacaq

İkincisi, bütün din və məzhəblərin böyük bir islahedicinin zühuruna olan intizarıdır. Bütün dinlərdə bu məsələ xüsusi yer tutur. Böyük bir islahedicinin zühuruna inam təkcə müsəlmanlar arasında deyil. Əldə olan sübutlar göstərir ki, bu əqidə bütün məzhəb və dinlər arasında, şərq və qərbdə, bütün millətlər arasında nüfuz tapmış bir .əqidədir. İslam dini kamil bir din olduğu üçün bu məsələdə daha çox təkid edir

Zərdüştilərin tanınmış kitabı olan «Zənd»də deyilir: «Qələbə, zəfər saleh insanlarla olacaq. Pislərin kökü isə kəsiləcək. Aləm öz həqiqi səadətinə yetişəcək, Bəni- Adəm xoşbəxlik taxtına əyləşəcək.» «Camasibnamə» kitabı Zərdüştün۱ dilindən deyir: «Ərəblərdən

başı yekə, iri bədənli, iri topuqlu bir kişi çıxıb camaatı öz cəddinin dininə dəvət edəcək. O, əzəmətli bir qoşunla yer üzünü ədalətlə dolduracaq.» Hindlilərin «Veşn Cuk» kitabında yazılmışdır: «Nəhayət, dünya Allahı sevən və onun xas bəndələrindən olan bir nəfərə nəsib olacaq.» Hindlilərin «Bask» kitabında deyilir: «Dünya adil bir rəhbərin başçılığı ilə sona yetəcək. Bu adil rəhbər mələklər, insanlar və pərilərin rəhbəri olacaq. Haqq onunla olacaqdır. Dağ, yer və dənizdə gizli olan şeylərin hamısı onun ixtiyarında olacaq. O, yer və göydən xəbər verəcək. Ondan böyük bir şəxsiyyət dünyaya gəlməyəcək.» Davudun «Məzamir» kitabında deyilir: «Pis insanların kökü kəsiləcək. Allaha arxalananlar isə yer üzünün sahibi olacaqlar. Düz danışanlar yer kürəsinin sahibi olub həmişə ona rəhbərlik edəcəklər.» Buna bənzər bir cümlə Tövratın «Əşiyanın kitabı» bölməsində də vardır. Mattanın İncilinin ۲۴-cü fəslində deyilir: «Günəşin məşriqdən çıxıb məğribə qədər parladığı kimi insanlar da parlayacaqlar.» Lukanın İncilinin ۱۲-ci fəslində deyilir: «Kəmərlərinizi bağlı, çıraqlarınızı yanıq saxlayın. Öz ağalarının intizarını çəkənlər kimi olun. Ağaları nə vaxt gəlib qapını döysə, onlar dərhal .«qapını açmağa hazırdırlar

Əlaimuz-zühur» (Zühurun nişanələri) kitabında yazılmışdır: «Çinlilərin qədim» kitablarında, hindlilərin məzhəbində, skandinaviyalı və meksikalı kimiinsanlar arasında «.da böyük bir islahedicinin zühuruna inam vardır

**Əqli dəlillər**

A).Dünyada olan nizam-intizam bizlərə öyrədir ki, nəhayət, bəşər ədalətə və ədalətli bir rəhbərə tabe olmalıdır. Bu dünya, bildiyimiz kimi, nizam-intizamdan ibarət bir topludur. Bu dünyadakı qayda-qanun, nizam-intizam, onun bir olduğuna və rabitəsinə sübutdur. Nizam, qanun, proqram, hesab və bu kimi işlər dünyanın əsas məsələlərindən biridir. Böyük kəhkəşanlardan tutmuş, iynə ucu boyda olan yerdə milyonlarla sığışa bilən atoma qədər hər şey bu nizam-intizama tabedir. İnsanın bədən üzvlərinin hər biri, kiçik bakteriyalardan tutmuş, bədənin əsas üzvlərindən olan beyin və qəlbi hərəkətə gətirən damarlara qədər hamısı proqram və nizam üzrə işləyirlər. Bəzi alimlərin dediyinə görə, insanın bədən üzvlərinin hər biri çox düzgün işləyən saat kimi bədəndə hərəkətdədirlər. Ən diqqətli və son markalı kompyüterləri də bədən üzvlərinə tay etmək olmaz. Bu cür proqram, nizam-intizama malik olan

dünyada nizam-intizamsız yaşamaq olarmı? Ədalətsizliyin əsas amillərindən bir olan ?ictimai və əxlaqi fəsadlar daima bəşəriyyətə hakim ola bilərmi

B)Cəmiyyətin təkamülə irəliləməsi, bəşəriyyətin gələcəyinin parlaq olmasına daha bir sübutdur. Biz bəşərin özünü tanıdıqdan sonra bir an belə olduğu mərhələdə .qalmadığını və daim irəliləməyə cəhd göstərdiyini inkar edə bilmərik

Madiyyat nöqteyi-nəzərindən, (ev, geyim, yemək, nəqliyyat) insan daim irəliləmək istəyindədir. Əvvəl sadə bir evdə yaşayırdı, bir müddət keçdikdən sonra gözəl bir evdə yaşayır. Yenə də irəliləməyə can atır. Bu hərəkət beləcə də davam edir. Elm və mədəniyyət cəhətdən də təkamülə doğru irəliləyirik. Yeni kəşflər, icadlar buna açıq-aşkar sübutdur. Nəhayət, təkamül mənəvi və əxlaqi cəhətlərdə də öz işini görür. Bəşəriyyəti ədalətli bir qanuna, sülhə, əxlaqi və mənəvi dəyərlərə dəvət edir. Əgər əxlaqi fəsadların çoxaldığını müşahidə ediriksə, bunun özü də təkamülə tərəf irəliləyişə səbəb olur. (Əxlaqi fəsadların çoxaldığını gördükdə məcbur olub bəzi işlərin qarşısını alırıq.) Bu, əxlaqi pozğunluqları çoxaltmaq lazım olduğu anlamına gəlməz. Bu o deməkdir ki, əxlaqi pozğunluqlar çoxalarsa, insan onun qarşısını almağa məcbur olur. İnsanlar bu pozğunluqlar nəticəsində çıxılmaz vəziyyətə düşdükdə məcbur olub .öz işlərindən əl çəkməli olacaqlar. Bunun özü də bir növ təkamüldür

**Quran və Mehdinin(ə.c.) zühuru**

səh:۷۲

Quranda Mehdinin(ə.c.) zühuruna aid bir çox ayələr var. Biz bu ayələrin yalnız birini qeyd etməklə kifayətlənirik: «Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini vəd buyurmuşdur.» (Nur,٥٥) Bu ayə yer üzünün aqibətinin möminlərin əlində olacağını və onların dünyaya hakim olub onu idarə edəcəklərini bildirir. Həmin ayənin ardınca Allah daha üç vəd verir: «Möminlər üçün onların Allahın özü bəyəndiyi dinini (İslamı)möhkəmləndirəcəyini (hər tərəfə yayacağını), onların qorxusunu sonra əmin-amanlıqla, arxayınçılıqla əvəz «.edəcəyini və yer üzündən küfr və nifaqın aradan qalxacağını vəd etmişdir

İmam Zeynül Abidin(ə) bu ayənin təfsirində buyurur: «Allaha and olsun ki, ayədə vəd olunan şəxslər bizim şiələrdir. Allah bu vədi bizim nəsildən olan bir kişinin vasitəsilə həyata keçirəcək. O kişi bu ümmətin Mehdisidir.»١

### Mehdi(ə.c.) hədis mənbələrində

Peyğəmbərin ailəsindən Mehdi(ə.c) adlı bir şəxsin dünyaya sülh və ədalət əsasında hakimlik edəcəyi barədə şiə və sünni mənbələrində o qədər hədis var ki, bu işə heç kimin şübhəsi qalmamışdır. Şiə mənbələrində bu şəxsin on ikinci imam olduğu, imam Hüseynin(ə) nəsl şəcərisindən doqquzuncu övladı və imam Həsən Əskərinin(ə) oğlu .olduğu haqda da çoxlu hədislər vardır

Mehdinin(ə.c.) zühuru barədə sünni mənbələrindən bunu demək yetər ki, bütün sünni alimləri öz kitablarında onu açıq-aşkar qeyd etmişlər. Hətta son zamanlarda Hicazın böyük elmi mərkəzlərinin birində çap olunmuş «İslam aləminin əlaqəsi» kitabında yazılmışdır ki: «O, (Mehdi) Peyğəmbərin hədislərdə xəbər verdiyi Raşidi xəlifələrinin on ikincisidir. Mehdiyə aid olan hədisləri səhabələrin bir çoxu Peyğəmbərdən rəvayət etmişlər.» Bu səhabələrdən iyirmisinin adını çəkdikdən sonra belə yazır: «Onlardan başqaları da bu hədisləri rəvayət etmişlər. Bəzi sünni alimləri Mehdi(ə.c.) haqqında ayrıca kitablar yazmışlar. O cümlədən, Əbu Nəim İsfahani, İbn Həcər Heysəmi, Şövkani, İdris Mərakeşi, Əbül Abbas ibn Əbdül Mömin.» Daha sonra yazır: «Keçmiş böyük alimlərin bir qismi və hal-hazırda sünni alimlərin bir qismi Məhdi(ə.c.) haqqındakı hədislərin həddən artıq çox olduğunu bildirmişlər.» Bu alimlərdən bəzilərinin adını çəkdikdən sonra sözünü beləcə başa çatdırır: «Hədis söyləyənlərdən bəziləri

Məhdi(ə.c.) haqqındakı hədislərin həm düzgün, həm də bəyənilmiş hədislər olduğunu bildirmişlər. Mehdinin qiyam və zühuruna inanmaq vacibdir. Bu əqidə sünni və şiələrin qəti əqidələrindən biridir. Mehdinin zühurunu cahil və bidətçi şəxslərdən başqa heç «.kim inkar etmir

**Şiələrin Mehdi(ə.c.) barədəki hədisləri haqqında**

Bilmək kifayət edər ki, bu barədə peyğəmbər(s) və imamlardan yüzlərlə hədis müxtəlif rəvayət söyləyənlər tərəfindən söylənilmişdir. Bu məsələ şiələrin əqidə məsələlərindən birinə çevrilmişdir. Şiələrin arasında olub onların Mehdiyə olan etiqadından, onun xüsusiyyətləri və zühurunun əlamətlərindən xəbəri olmayan şəxs yoxdur. Şiə alimləri lap qədim zamanlardan bu barədə kitablar yazmış və Mehdi(ə.c.) haqqındakı hədisləri yığıb toplamışlar. Nümunə üçün bu hədislərin bir neçəsini sizin nəzərinizə çatdırırıq. İslamın əziz peyğəmbəri Həzrət Mühəmməd(s) buyurmuşdur: «Əgər dünyanın sonuna bir gün də qalmış olsa, Allah o günümənim Əhli-beytimdən olan bir kişinin gəlib dünyanı zülm və fəsadla dolduğu kimiədalətlə dolduracağı günə qədər uzadar.۱» İmam Sadiq(ə)-dan olan başqa bir hədisdə oxuyuruq: «Mehdi(ə.c.)qiyam etdikdə hökuməti ədalət əsasında quracaqdır. Onun dövründə zülm, zorakılıq itib aradan gedəcək, yollarda onun sayəsində əmin-amanlıq olacaq, yer öz bərəkətlərini aşkar edəcək, bütün haqlar öz sahiblərinə qaytarılacaq. O, camaat arasında Davud peyğəmbər və Məhəmməd peyğəmbər kimi hakimlik edəcək. Yerdə olan bütün xəzinələr, bərəkətlər üzə çıxacaq. Heç kim sədəqə vermək üçün kasıb «tapmayacaq. Çünki bütün möminlər ehtiyacsız olacaqlar.۱

Bir daha xatırladaq ki, Mehdi(ə)-nin qeyb olduğunu dövrdə müsəlmanların rəhbərliyini .ümumi naibləri, yəni, din alimləri öhdələrinə götürürlər

### :Fikirləşin və cavab verin

Dünyanın gələcəyi haqqında materialistlərlə Allaha ibadət edənlərin nəzəriyyələri.۱ ?arasında nə fərq var

?Fitrət vasitəsilə Mehdi(ə.c.)-nin zühuruna inanmaq olarmı? Necə.۲

?Mehdi(ə.c.)-nın zühuruna dair əqli dəlil varmı? O hansı dəlildir.۳

?Quran bu barədə nə deyir.۴

?Mehdi(ə.c.)-nin zühuru hədis mənbələrində hansı mövqeyi tutur.۵

# V FƏSİL: MƏAD TANIMA HAQQINDA ON DƏRS

## I DƏRS

### ?Mühüm bir sual: Ölüm sondur, yoxsa başlanğıc

?Nə üçün insanların çoxu ölümdən qorxur

Ölüm insanların gözünə həmişə vəhşətli bir şey kimi görünür. Ölüm haqqında düşünmək həyatın şirin şərbətinin dadını aparır. İnsanlar təkcə ölümün adından qorxmur, hətta qəbirstanlıq sözündən də çəkinirlər, qəbirləri zinətləndirməklə onun əsl mahiyyətini yox etmək istəyirlər. Ölümdən bu cür qorxu dünyanın müxtəlif ədəbiyyatlarında da gözə çarpır və ölüm «ölüm nəhəngi», «ölüm caynaqları», «əcəl zəngi» və bu kimi ifadələrlə adlanır. Bir ölünün adını çəkmək istədikdə «bizdən iraq», «ömrün uzun olsun», «Allah göstərməsin» və bu kimi ifadələrlə dinləyən şəxsin fikrini ölümdən .yayındırmaq istəyirlər

Gəlin müəyyən edək, görək, insanlar ölümdən nə üçün (hətta ölümün adından) qorxurlar? Nəyə görə ölümdən qorxan insanlardan fərqli olaraq başqa bir qism ölümü ?qarşılayır, ölüm adı gəldikdə qoxmur, əksinə xoşhal olurlar

Tarixdə oxuyuruq ki, bəzi insanlar «dirilik suyu», «cavanlıq suyu» kimi ömrü uzadan şeylərin ardınca getmiş, bəziləri isə şərəfli cihad meydanlarına qədəm basmış və ölümlə üz-üzə gəlmişlər. Bəzən insanlar ömrləri uzun olduğundan, Allah hüzuruna gedən günlərini (ölümü) arzulayırlar. İndiki zamanda da haqq ilə batilin vuruş meydanlarında bu cür insanlar çoxdur. (Din, vətən, namus uğrundaayağa qalxıb şəhadətə nail olan insanlar indi də az deyil. Azərbaycanın ayrılmaz hissəsi olan doğma .(Qarabağda şəhid olan igidlərimiz buna bir nümunədirlər (mütərcimdən

**Bu qorxunun səbəbi**

Araşdırma və tədqiqatlardan belə məlum olur ki, bu qorxunun əsas səbəbi

.iki şeydir

Ölümü fəna və puçluq mənasında təfsir etmək.۱

İnsan həmişə yoxluqlardan uzaq olmağa çalışır. Xəstəlikdən uzaq olmaq istəyir, çünki xəstəlik sağlamlığın olmamasıdır. Qaranlıqdan, zülmətdən uzaq gəzir, çünki o, nur və işığın yoxluğudur. Hətta boş bir evdən, boş səhradan qaçmağa çalışır, çünki orada heç bir insan yoxdur. Təəccüblü budur ki, insan gecəni ölü ilə bir otaqda qalmağa da hazır deyil. Halbuki, həmin ölünün sağlığında ondan qorxmur və gecələri onunla bir yerdə .keçirirdi

İndi görək, insanın yoxluqdan kənar gəzməsinin səbəbi nədir? Cavab məlumdur. Çünki varlıq varlıqla tanışdır. Varlıq yoxluqla heç zaman tanış olmamışdır. Deməli, insanların yoxluqdan qaçması təbii bir işdir. Əgər ölümü hər şeyin sonu hesab etsək, ölümdən qorxmağa haqqımız var. Hətta onun adından qorxmağa da haqqımız olar. Çünki ölüm hər şeyi bizim əlimizdən alır və bizi puçluğa aparır. Yox, əgər ölümü yeni bir həyatın başlancığı

bilsək, onda nəinki ölümdən qorxmamalıyıq, əksinə, şərəfli ölümə doğru addım .atanları alqışlamalıyıq

Nameyi-əməlin(۱) çirkinliyi.۲

Bəzi insanlar ölümü fəna hesab etməmələrinə baxmayaraq, yenə də ölümdən qorxurlar. Səbəbi də budur ki, onların əməl dəftərləri çirklənib qaralmışdır. Onlar günahlarının nəticəsində düçar olacaqları acınacaqlı əzablardan qorxurlar. Onlar ölümdən qorxmaqda haqlıdırlar. Bu cür şəxslər zindandan kənara çıxarılan təhlükəli canilərə bənzəyirlər. Bu canilər bilirlər ki, nə vaxt onları zindandan qırağa çıxartsalar, dar ağacına aparacaqlar. Belə vəziyyətdə onlar zindanın dəmir qapılarından yapışıb qırağa çıxmaq istəmirlər. Onlar azadlıqdan yox, aqibəti edamla nəticələnəcək azadlıqdan qorxurlar. Ölümü fəna bilməyən, lakin ondan qorxanlar da bu cürdürlər. Onlar ruhlarının dar qəfəsdən azad olmasından qorxmurlar, sonradan başları çəkəcək əzabladan qorxurlar. Ancaq onu fəna bilməyən və çirkin əməl dəftərinə malik olmayan şəxslərin ölümdən qorxmağının nə mənası var? (Şübhəsiz ki, bu cür şəxslər ölümdən qorxmurlar.) Bu cür insanlar dünya həyatından bəhrələnir və yeni həyatları üçün hazırlıq görürlər. Bu dünyadakı həyatlarından gələcək həyatları üçün çoxlu ehtiyat götürmək məqsədi ilə Allahın razı olduğu yolda ölümün qarşısına çıxır və onu .qarşılayırlar

### İki müxtəlif nəzəriyyə

Bir az bundan əvvəl qeyd etdik ki, ölümdən qorxanlar insanlar arasında çoxluq təşkil edirlər. Lakin başqa bir qism də var ki, onlar müqəddəs hədəf uğrunda ölməkdən qorxmur, hətta bu cür ölümü özləri qarşılayırlar. Yaxud ölümləri sadə və adi ölüm olarsa, ömürlərinin sonunda heç bir narahatçılıq hissi keçirmirlər. Bunun (bəzilərinin ölümdən qorxmasının, bəzilərinin isə qorxmamasının) səbəbi arada iki müxtəlif .nəzəriyənin olmasıdır

Birinci qismdə olan insanlar (ölümdən qorxanlar) ölümdən sonrakı aləmə inanmırlar,(۱ inansalar da, qəlblərində bəzi şübhələr qalmışdır. Buna görə də, ölüm anını əlin hər şeydən üzüldüyü an bilirlər. Əlin hər şeydən üzülməsi yəqin ki, çıxılmaz bir vəziyyətdir. İşıqlı dünyadan qaranlıq dünyaya qədəm qoymaq, əlbəttə ki, çətindir. Həmçinin, bir

.cani üçün zindandan çıxıb məhkəməyə getmək, yəqin ki, çox çətindir

Lakin ikinci qism insanlar (ölümdən qorxmayanlar) ölümü yeni bir təvəllüd sayırlar.(٢ Onların fikrincə, ölüm darısqal, məhdud və zülmət bir yerdən geniş, həddi-hududu olmayan və işıqlı olan bir dünyaya köç deməkdir. Ölüm sanki, ruhun kiçik bir qəfəsdən azad olub geniş göylərdə pərvaz etməsi, zülm, ədalətsizlik, haqsızlıq içindən çıxıb, bunlardan pak olan bir mühitə daxil olması deməkdir. Təbiidir ki, bu cür şəxslər artıq ölümdən qorxmayacaqlar. Bu məktəbin lideri olan Həzrət Əli(ə)-ın dili ilə desək: «Əbu Talibin oğlunun (Əlinin) ölümə münasibəti südəmər uşağın anasının döşünə olan «.münasibətindən də artıqdır

İslam tarixində bəzi insanların ölümə olan münasibətini gördükdə insan heyrətə gəlir. İmam Hüseyn(ə) və Kərbəlanın digər şəhidlərinin üzlərində şəhadət zamanı yaxınlaşdıqda sevinc, təbəssüm nişanələrinin görünməsi heç də təsadüfi deyil. .Məhbubun görüşünə gedəcəklərindən, onların sevinclərinin həddi-hududu yox idi

Yenə də təsadüfi deyil ki, dünyanın ən böyük cinayətkarı, insaniyyət aynasını ləkələyən Əbdürrəhman ibn Mülcəm Həzrət Əlinin başına qılınc endirərkən o Həzrət fəryad edərək deyir: «And olsun Kəbənin Rəbbinə ki, mən səadətə qovuşdum.» Bu insanın özünü təhlükəyə salmalı olduğu və böyük nemət olan həyatda yüksək nailiyyətlər əldə etmək üçün çalışmalı olmadığı mənasına gəlməz. Bu sözün mənası budur ki, insan həyatından düzgün istifadə etməlidir. Ömür sona yaxınlaşdıqda - xüsusən, ali məqsədlər uğrunda- qorxuya düşməməlidir. Xüsusən, yüksək hədəflər .yolunda



---

Nameyi- əmələməllərin qeyd olunduğu kitaba deyilir. Bu kitab qiyamət günü [٣] -١ .insanın özünə təqdim olunacaq

### Fikirləşin və cavab verin

?Nə üçün insanlar ölümdən qorxurlar? Bunun səbəbi nədir.١

Nəyə görə bəzi insanlar ölüm qarşısında xoşhal olur və Allah yolunda şəhid olmağa.٢
?can atırlar

Ölüm anını nəyə bənzətmək olar? Ölüm zamanı imanlı və imansız şəxslər hansı.٣
?hissləri keçirirlər

?Ölümdən qorxmayan şəxslər görmüsünüzmü? Onlardan hansı xatirəyadınızdadır.۴

?Ölüm qarşısında Əli(ə)-ın məntiqi nə olmuşdur.۵

## II DƏRS

### Həyata məna verən məaddır

Əgər bu dünya həyatını başqa bir dünya olmadan təsəvvür etsək, bu həyat puç və mənasız olar. Bu, ana bətnindəki dövranı bu dünyasız təsəvvür etməyə bənzəyər. Əgər aylarla ana bətnində əsir olan körpənin düşüncəsi olsa, orada keçirdiyi günlər barədə fikirləşib təəccüb edər və özündən bu sualları soruşar: Mən bu qaranlıq
?zindanda nə üçün əsirəm

Nəyə görə qan və su arasında əl-qol atmalıyam? Mənim sonum necə olacaq? Mən haradan və nəyə görə gəlmişəm? Ancaq ona desələr ki, bu sənin keçirdiyin başlanğıc və hazırlıq dövrüdür, sənin bədən üzvlərinin burada möhkəmlənəcək, böyük bir dünyaya qədəm qoymağa hazırlaşacaqsan, doqquz aydan sonra sənin bu zindandan azad olma qərarın çıxacaq, artıq geniş bir dünyaya daxil olacaqsan, orada parlaq günəş, ay, yaşıl ağaclar, axar sular, və s. görəcəksən, onda körpə rahat bir nəfəs alıb «indi bildim ki, mən nəyə görə buradayam» deyəcək. Bu, bir müqəddimə dövrüdür. Ali məktəbə qəbul olmaq üçün oxunan sinifdir. Əgər ana bətnindəki dövrün bu dünya ilə əlaqəsi kəsilsə, hər şey puç olar. Ana bətni yalnız bir zindan olar. Bu dünya ilə axirət
.aləminin əlaqəsi də bu cürdür

il, bir az çox ya az bu dünyada çətinliklərlə mübarizə aparmağın nə mənası var? Bir ٧٠

müddət təcrübəsiz və naşı oluruq. Yenicə təcrübə toplamış oluruq ki, ömr sona yetir. İllərlə elm ardınca gedir, təhsil ocaqlarında can qoyuruq. Bir az məlumat topladıqdan .sonra saçımıza dən düşür

Ümumiyyətlə, nəyə görə yaşayırıq? Yemək, paltar geymək, yatmaq və bu proqramı illərlə təkrar etməkdən ötrümü yaşayırıq? Bu geniş asiman, geniş yer, bu qədər hazırlıq, təhsil almaq, təcrübə toplamaq- hamısı yeyib, geyib, yatmaq üçündürmü? Bu suallarla üzləşdikdə məadı inkar edənlər üçün həyatın puçluğu aşkar olur. Onlar nə ölümdən sonrakı həyata inanırlar, nə də bu kiçik işləri yaşamağın mənasını bilirlər. Məhz bu səbəbdən, onlardan bəziləri puç və mənasız həyatdan yaxa qurtarmaq üçün intihara əl atırlar. Ancaq bu dünyanı başqa bir dünya üçün hazırlıq kimi qəbul etsək, buranı əkin yeri, axirəti isə məhsul götürülən yer kimi tanısaq, onda bu dünya heç də puç və mənasız olmayacaq. Bu dünya özümüzə təcrübə toplamalı və əbədi bir dünyada yaşamağa hazırlaşmalı olduğumuz bir məktəbdir. Həyata məna verən, .insana nigarançılıqlardan nicat verən məaddır

### Məada inam tərbiyənin əsas amilidir

Məada, axirət gününün böyük məhkəməsinə etiqad bəsləməyin insanların həyatında .böyük təsiri var

Təsəvvür edin, bir ölkədə elan olunub ki, filan tarixdə, filan gündə kim hansı cinayəti istəsə, törədə bilər. O gün törədilən cinayətlərə görə heç kim yaxalanmayacaq. İndi fikirləşin, görün, o gün cəmiyyət də nələr baş verəcək? (Cürətlə demək olar ki, o gün (.ölkədə tərbiyə son həddə enəcəklər

Qiyamətə, məada inanmaq axirətin məhkəməsinə inanmaq deməkdir. Axirət aləminin məhkəməsi bu dünyanın məhkəmələrindən tamamilə fərqlənir. Qiyamət məhkəməsi :aşağıdakı xüsusiyyətlərə malikdir

O məhkəmədə nə bir xahiş qəbul edilir, nə dostluq keçir, nə də yalançı sənədlərlə(۱
.hakimlərin fikrini dəyişmək olur

O məhkəmənin bu məhkəmələr kimi hazırlığa ehtiyacı yoxdur. Buna görə də, çox(۲
.uzun çəkməz. Tez bir zamanda sənədlər araşdırılaraq hökm veriləcək

O məhkəmədə müttəhim haqqında sənədlər müttəhimin öz əməlləri olacaq. Yəni,(۳
insanın bu dünyada gördüyü əməllər orada hazır olaraq öz sahiblərini tapacaqlar.
.Daha heç bir inkar yeri qalmayacaq

O məhkəmədəki şahidlər müttəhimin öz bədən üzvləri olacaqdır. Hətta yer, daş,(۴
divar, qapı, pəncərə də görülən günahlar haqqında şəhadət verəcəkdir. Bu
.şəhadətlərdən sonra inkar yeri qalmayacaq

.O məhkəmənin hakimi Allahdır- hər şeyi görən, hər şeydən xəbədar olan Allah(۵

Bunlardan əlavə, o məhkəmənin mükafat və ya cəzaları müqavilə əsasında deyildir.(۶
.İnsanları mükafatlandıran, yaxud cəzalandıran onların öz əməlləri olacaqdır

Bu cür məhkəməyə inam insanı tərbiyələndirir,onu yüksək və mənəvi məqamlara çatdırır. Əli(ə) bu məhkəmə barədə buyurur: «And olsun Allaha ki, gecələri yumşaq yataq əvəzinə tikanlar üzərində keçirmək, gündüzləri əl-qolu zəncirli küçə-bazarda gəzdirilmək Allah bəndələrinin birinə zülm etmiş, yaxud birinin haqqını qəsb etmiş halda Allah məhkəməsində hazır olmaqdan daha asandır.» (Nəhcül-bəlağə. ۲۲۴-cü xütbə.) Bu məhkəməyə inam insanı məcbur edir ki, beytül-maldan haqqından əlavə istəyən qardaşının əlinə qızdırılmış dəmir parçası bassın, qardaşı «bu nə işdir görürsən?» dedikdə ona nəsihət edərək desin: «Sən kiçik bir oddan bu cür qorxduğun haldaqardaşını Cəhənnəm oduna dəvət edirsən?» Belə imanı olan şəxsi aldatmaq olarmı? Rüşvətlə onu dilə gətirib vicdanını ələ almaq mümkündürmü? Onu
?şirnikləndirmək və ya təhdid etməklə haqq yoldan döndərmək olarmı

Quran qiyamət məhkəməsi barədə buyurur: «(Günahkarlar deyəcəklər: Vay halımıza!)
Bu əməl dəftəri niyə heç bir kiçik və böyük günahımızı nəzərdən qaçırmadan hamısını
(sayıb qeydə almışdır?» (Kəhv, ۴۹).(۱)

Məada, qiyamət gününün hesab-kitabına olan inamın sayəsində insan bütün işlərin qarşısında öz daxilində məsuliyyət hiss edir. Bu məsuliyyət insanı ədalətsizlik, zülm və .təcavüzdən qoruyub saxlayır

**Fikirləşin və cavab verin**

?Əgər bu dünyanın ardınca başqa bir dünya olmasaydı, nə olardı.١

?Nəyə görə məadı inkar edənlərin bəziləri intihara əl atırlar.٢

?Qiyamət gününün məhkəməsi ilə dünya məhkəmələri arasında nə fərq var.٣

?Məada inam insanın əməllərinə nə kimi təsir edir.۴

Əli(ə) qardaşı Əqillə hansı hərəkəti etdi? Əqil ondan nə istəyirdi və Əli(ə) ona nə.۵ ?cavab verdi

## III DƏRS

### İnsanların batini Qiyamət məhkəməsindən bir nümunədir

Ölümdən sonrakı həyat və qiyamət gününün məhkəməsi bu məhdud dünyada yaşayan insan üçün yeni bir məsələdir. Allah qiyamət gününün kiçik bir nümunəsini elə bu dünyada, insanların içində yaratmışdır. Bu məhkəmə «vicdan məhkəməsi» adlanır. .Bir daha xatırladırıq ki, bu məhkəmə qiyamət məhkəməsinin çox kiçik bir nümunəsidir

Gəlin, bu barədə bir az ətraflı danışaq

İnsan gördüyü əməllər haqqında (istər pis əməl olsun, istər yaxşı) bir neçə .məhkəmədə sorğu-suala çəkilir



---

Nəhcül-bəlağə. ٢٢۴-cü xütbə. Bu hadisə Həzrət Əli(ə)-ın qardaşı Əqilə göstərdiyi [۴] -١ .münasibətdir

Birincisi, bu dünyada olan məhkəmələr. Bu məhkəmələrin bəzi çatışmaz nöqsanları(١ olur. Belə məhkəmələr cinayətlərin qarşısını almaqda böyük rol oynayır. Lakin bu məhkəmələrdə bəzi çətinliklərə görə ədalətə tam riayət olunmur. Səbəbi də budur ki, ya hakimlər düzgün hökm vermirlər, məsələn, rüşvət vasitəsilə müttəhimin lehinə, iddiaçının əleyhinə hökm çıxarırlar, ya da cani və müttəhimlər bəzi yollarla hakimləri aldadırlar. Bu təqdirdə hakimin heç bir günahı olmur, lakin buna baxmayaraq, həqiqi ədalətə riayət olunmur. ٢)İkinci məhkəmə birincidən bir pillə yüksəkdə durur. Bu .məhkəmə «görülən əməllərin cəzası» məhkəməsidir

Bəzən insanın gördüyü əməllər o yerə çatır ki, onların cəzasını gec, ya tez insan özü çəkməli olur. Bu məhkəmə bütün insanlara aid olmasa da, çoxuna aiddir. Bəzi insanlar olub ki, camaata zülm, haqsızlıq və pisliklər etmiş, nəhayət qazdıqları quyuya özləri düşmüş və əməllərinin cəzasını çəkməli olmuşlar. Ölüb getdikdən sonra da camaat tərəfindən onlara yalnız lənət yağdırılmışdır. Bu məhkəmədən çox az insanlar yaxa qurtara bilmişlər. (Şübhəsiz ki, onlar da qiyamətdə əməllərinin cəzasını çəkəcəklər.) Bu .məhkəmənin tək çatışmazlığı odur ki, bütün insanları yox, bəzi insanları cəzalandırır

Üçüncü məhkəmə ikincidən də üstündür. O da «vicdan» məhkəməsidir. Qətiyyətlə(٣ .demək olar ki, qiyamət məhkəməsinin kiçik bir nümunə bizim öz batinimizdədir

İnsanın batinində bir qüvvə vardır. Filosoflar (İslam fəlsəfəsində) bu qüvvəni «əməli əql» (icraedici ağıl) adlandırmışlar. Quran bu qüvvəni «nəfsi ləvvamə» (yəni, insanı danlayan nəfs) adlandırmışdır, indi isə bu qüvvəyə «vicdan» deyirlər. İnsan bir iş görən kimi (pis, ya yaxşı), dərhal bu məhkəmə qurulur. Bu məhkəmədə heç bir səs-küy olmur, lakin həddən artıq diqqətli və ciddi keçirilir. Məhkəmənin nəticəsi isə psixoloji cəzalandırma, əzab-əziyyət, ya da psixoloji təşviq olur. Bəzən bu məhkəmə caniləri elə cəzalandırır ki, ruhən əziyyət çəkməli olurlar, nəticədə ölməyi qalmaqdan üstün tutub intihara əl atırlar. Onlar vəsiyyətnamələrində qeyd edirlər ki, mən narahatçılıq və .vicdan əzabından yaxa qurtarmaq üçün özümə qəsd edirəm

Bəzən də vicdan insanı yaxşı əməllərinə görə elə təşviq edir ki, insanın sevincinin həddi-hüdudu olmur. Bu təqdirdə insan içində rahat, xoş bir hiss keçirir ki, o hissi dil ilə .ifadə etmək mümkün deyil

Bu məhkəmənin hakimi, şahidi, tamaşaçısı–hamısı birdir. Vicdan həm hökm verib(١ .qərar çıxarır, həm şəhadət verir, həm də nəzarət edir, nəhayət, hökmünü icra edir

Adi məhkəmələrdən fərqli olraq, bu məhkəmə tez bir zamanda qurulur və öz(٢ hökmünü verir. Adi məhkəmələr bir caninin işinə baxmaq üçün, ola bilər ki, bir neçə il vaxt sərf etsin. Lakin bu məhkəmədə vaxta ehtiyac yoxdur. Ola bilsin, həqiqətin üstü açılanədək bu məhkəmə bir az təxirə salınsın. Lakin həqiqətin üstü açıldıqdan sonra .o,dərhal öz hökmünü verir

Bu məhkəmə təkcə bir mərhələdən təşkil olunmuşdur. Burada istintaqa, ali(٣ .məhkəməyə və sairəyəehtiyac yoxdur

Bu məhkəmənin işi adi məhkəmələr kimi təkcə cəzalandırmaq deyil. Yəni, bu(۴ .məhkəmədə pislər cəzalarını alır, yaxşılar da mükafatlandırılırlar

Bu məhkəmənin cəzası adi məhkəmə cəzaları kimi deyil. Burada nə zindana, nə də(۵ edama məhkum olunma yoxdur. Lakin onun cəzası bəzən elə şiddətli olur ki,geniş dünya insana dar olur. Bir sözlə, bu məhkəmə dünya məhkəmələri kimi deyil. Vicdan məhkəməsi qiyamət məhkəməsinin bir nümunəsidir. Bu məhkəmənin əzəməti o qədər böyükdür ki, Allah onu qiyamət məhkəməsi ilə birgə qeyd edib, ona and içərək deyir: «And içirəm qiyamət gününə! And içirəm (günah etdiyi üçün, yaxud yaxşı əməlin azdır deyə) özünü qınayan nəfsə! (Siz öləndən sonra mütləq diriləcəksiniz.) Məgər insan elə ,güman edir ki

qiyamət günü) onun sümüklərini bir yerə yığa bilməyəcəyik? Bəli, biz onun) (.barmaqlarını da (dünyada olduğu kimi) düzəltməyə qadirik!» (Qiyamət-١-۴-cü ayələr

Əlbəttə bu vicdan məhkəməsi dünyəvi məhkəmə olduğu üçün, qiyamət məhkəməsinə :olan ehtiyacı ödəmir. Bunun bir neçə səbəbi var

Vicdan məhkəməsi hər şeyi əhatə edə bilmir. O, yalnız fikir və düşüncə ilə münasib(١ .olan şeyləri əhatə edir

.Bəzənmahir, hiyləgər bir cinayətkar öz vicdanını aldada bilər(٢

.Bəzi günahlarda vicdan o qədər təsirsiz olur ki, ona heç bir məhəl qoymurlar(٣

Belə bir vəziyyətdə dördüncü məhkəməyə, qiyamət məhkəməsinə olan ehtiyac aşkar .olur

### Fikirləşin və cavab verin

?İnsan (həqiqətdə) neçə məhkəmə ilə qarşılaşır.١

?Birinci məhkəmə hansıdır və bu məhkəmə hansı xüsusiyyətlərə malikdir.٢

?İkinci məhkəmənin xüsusiyyətləri nədir.٣

?Üçüncü məhkəmə hansı xüsusiyyətlərə malikdir.۴

.Vicdan məhkəməsinin üstünlük və nöqsanlarını sayın.۵

## IV DƏRS

### Məad fitrət təcəllisində

Deyirlər, Allahı tanıma insanın fitrətindədir. Əgər insanın batininə nəzər yetirsək, onda təbiətin fövqündə olan bir varlığa (Allaha) iman əqidəsini görə bilərik. Bu əqidə dünyanın elm, hədəf və proqramı əsasında əmələ gəlmişdir. Lakin bu məsələ, təkcə tövhid və Allahı tanıma bəhsinə aid deyil. Dinin bütün üsul və füruatı fitrət əsasında olmalıdır. Əks təqdirdə, təşri aləmi ilə təkvin aləmi arasında uyğunluq olmaz (Diqqət edin). Əgər qəlb və ruhumuzun dərinliklərindən gələn səsə qulaq assaq, «həyat ölümlə

sona yetmir, əksinə, ölüm əbədi dünya və həyata açılmış bir pəncərədir» ifadəsini .eşidərik. Bunu anlamaq üçün aşağıdakı məsələlərə diqqət etməliyik

**İnsanın bəqaya olan eşqi.۱**

Əgər insan fani və heç olub getmək üçün yaranmışdırsa, onda gərək, fənanın aşiqi olsun, ömrünün sonunda onu yaxalayan ölümdən ləzzət alsın. Lakin görürük ki, (heç olmaq mənasına olan) ölümdən insanın nəinki xoşu gəlmir, hətta bacardığı qədər ondan qaçır. Onun dirilik suyu və ömrü uzadan digər şeylərin ardınca getməsi buna bir sübutdur. İnsanın bəqaya olan eşqindən məlum olur ki, biz bəqa üçün yaranmışıq. Əgər fəna üçün yaradılsaydıq, onda bəqaya olan bu eşq mənasız olardı.(۱) İnsanda olan eşqlər onun vücudunu tamamlayır. Bəqaya olan eşq də vücudu tamamlayan .eşqlərdən biridir

**Keçmiş nəsillərin qiyamətə olan etiqad.۲**

Tarix göstərir ki, keçmiş nəsillərin hamısının özünəməxsus məzhəbi olmuşdur. Eləcə də sübutlar göstərir ki, insanlar arasında məad və qiyamətə etiqad lap qədim zamanlardan olmuşdur. Keçmiş nəsillərdən qalan əsərlər, xüsusən, onların ölüləri dəfn etməsi, qəbirləri düzəltməsi və bu kimi işləri onların ölümdən sonrakı həyata olan etiqadlarından xəbər verir. Bəşər arasında ilk günlərdən meydana çıxmış bu əqidəni .sadə, adi və fanatik bir şey hesab etmək olmaz



---

.Bunlar islami terminlərdir [۵] -۱

Əgər bir əqidə bütün insanlar arasında vardırsa, onun fitri olduğunu qəbul etməliyik. Çünki təkcə fitrət zaman və ictimai dəyişikliklərə sinə gərib olduğu kimi qala bilər. Adət, ənənə və fanatikalar zaman keçdikcə qüvvədən düşür, mahiyyətini itirirlər. Məsələn, bir cür paltar geyinmək bir zaman adət və dəbdirsə, bir müddət keçdikdən sonra qüvvədən düşür. Lakin ananın balasına olan məhəbbəti fitri bir işdir. Nə qədər zaman keçsə də, yenə bu məhəbbət olduğu kimi qalacaq və heç bir ana öz balasına qarşı .laqeydlik etməyəcək. Bu cür olan hər bir əlaqə özünün fitri olduğunu göstərir

Alimlərin dəqiq araşdırmalarından məlum olur ki, bəşəriyyətin ilkin tayfalarının da« məzhəbi olmuşdur. Çünki onlar ölülərini məxsus şəkildə dəfn edir, ölünün iş alətlərini onun yanında qoymaqla ölümdən sonrakı aləmə olan əqidələrini ifadə edirlər.» ifadəsi bizə bildirir ki, keçmiş nəsillər arasında da ölümdən sonrakı həyata inam olmuşdur. Düzdür, onların sonrakı aləmi elə bu aləm kimi təsəvvür etmələri səhvdir, lakin yenə .də, onlarölümdən sonrakı həyata inanırdılar

### Batinimizdə olan vicdan məhkəməsi.٣

Batinimizdə olan vicdan məhkəməsi məadın fitri olduğuna daha bir sübutdur.٣

Keçən dərsdə dediyimiz kimi, bizim batinimizdə əməllərimizə nəzarət edən bir məhkəmə vardır. Bu məhkəmə yaxşı əməllər qarşısında insanı təşviq edərək onu elə rahat edir ki, bunu dildə bəyan etmək mümkün deyil. Eləcə də, pis işlər, xüsusən böyük .günahlar qarşısında insanı elə tənqid edib cəzalandırır ki, yaşamaq insana acı gəlir

Dəfələrlə müşahidə edilmişdir ki, cinayət törədib qaçan şəxslər nəhayət gəlib özlərini .məhkəməyə təslim etmişlər. Bunu vicdan əzabından xilas olmaq üçün etmişlər

İnsan batinində belə bir məhkəməni müşahidə etdikdən sonra özünə sual verir:necə ola bilər, mən kiçilikdə bir varlıqda belə bir məhkəmə olsun, lakin bu böyüklükdə ?aləmdə bu cür bir məhkəmə olmasın

Beləliklə də məad və ölümdən sonrakı həyatın fitri olması üç yolla sübuta yetir: Bəqaya olan eşq yolu ilə, keçmiş nəsillər arasında qiyamətə etiqadın olması və onun kiçik bir .nümunəsinin öz batinimizdə olması yolu ilə

### Fikirləşin və cavab verin

?Fitri olan və fitri olmayan işləri bir-birindən necə ayırmaq olar.١

Hansı sübuta əsasən insanın bəqaya eşqi var və bəqaya olan eşq məadın fitri.٢ ?olduğuna necə sübut ola bilər

?Keçmiş nəsillərin məada inamları olubmu.٣

Vicdan məhkəməsi insanı cəzalandırıb təşviqləndirirmi? Bunun səbəbi nədir? Bir neçə.۴ .misal gətirin

?Vicdan məhkəməsi ilə qiyamət məhkəməsi arasında nə kimi əlaqə var.۵

## V DƏRS

### Qiyamət ədalət tərəzisində

Bu dünyaya bir az diqqət yetirdikdə görürük ki, hər tərəfdə qanun hakimlik edir və hər şey öz işini qanuna əsasən görür. Ədalət əsasında tənzimlənmiş bu proqram insan bədənində o qədər incəliklə icra olunur ki, onda bir azdəyişikliklərinolması insanın ölümü, ən azı xəstələnməsi ilə nəticələnir. Göz, qəlb, beyin və digər bədən üzvlərinin quruluşu buna açıq-aşkar bir sübutdur. Bu proqram təkcə insan bədənində yox, bütün aləmdə icra olunur. Hədisdə deyilmişdir: «Yer və göylər ədalət əsasında qurulmuşdur.» Bir atom zərrəciyi o qədər kiçikdir ki, milyonlala atomu iynə ucu qədər yerdə yerləşdirmək olar. Fikirləşin, görün, onun quruluşu necə dəqiq olmalıdır. Bununla belə, milyon illərdir ki, atom öz mövcudluğunu qoruyub saxlamışdır. Bunların hamısı elektron və protonların quruluşundakıfövqəladə proqramın sayəsində əmələ gəlmişdir. Dünyada olan bütün şeylər bu elektron və protonlardan təşkil olunmuşdur. Məgər insan istisna olunmuş bir varlıqdır? Bu dünyada

azad olmalı və hansı ədalətsizliyi, zülmü istəsə, etməlidir? Yoxsa, burada bir incəlik ?gizlənmişdir

### İradənin azadlıq və ixtiyarı

İnsan bir şeydə başqa məxluqlardan fərqlənir. O da onun iradə və istəyinin azad və ixtiyar sahibi olmasıdır. Nəyə görə Allah insanı azad buraxmış və ürəyi istəyən hər şeyi etməyə icazə vermişdir? Cavabında deyirik ki, əgər insan azad olmasaydı, təkamülə yetişə bilməzdi. Bu xüsusiyyət (insanın azadlığı) onun mənəvi və əxlaqi təkamül rəmzidir. Məsələn, varlıları güclə imkansızlara yardım etməyə məcbur etsələr, bu iş həyata keçəcək və imkansızlara kömək olunacaq, lakin bu varlılar üçün təkamülə səbəb olmayacaq. Ancaq həmin yardımın bir zərrəsi varlıların öz istək və iradəsi ilə edilsə, bu onların mənəvi təkamülünə səbəb olacaq.Deməli, əxlaqi və mənəvi təkamülün birinci şərti azadlıqdır. Yəni, bəşəriyyət bu mərhələyə məcburiyyətlə yox, öz iradə və istəyi ilə yüksəlməlidir. Allahın insanları azad buraxmasının səbəbi də məhz .budur

Böyük azadlıq neməti bir gülə bənzəyir. Bu gülün yan-yörəsində bəzi tikanlar bitir. O tikanlar da bəzi insanların bu azadlıqdan pis niyyətlə istifadə edib günah, zülm, fəsada .düçar olmalarıdır

Allah azadlıqlardan fəsad, zülm və günahlar yolunda istifadə edən şəxsləri elə bəlalara düçar edərdi ki, onlar bir daha gördükləri işləri təkrar etməzdilər. Belə olan halda daha heç kim azadlıqdan pis niyyətlə istifadə etməzdi. Lakin bu təqdirdə insan məcbur olub pisliklərdən əl çəkər və bunun insan üçün heç bir dəyəri olmazdı. İnsan gərək, azad olsun və Allahın imtahanları qarşısında sınaqlardan keçsin. Bu yolla insan öz .dəyərlərini nümayiş etdirə bilər

Burada daha bir məsələ var. O da budur ki, əgər vəziyyət beləcə davam edərsə- hər kəs istədiyi yolla gedib ürəyi istəyəni edərsə, bu təqdirdə Allahın dünyada qoyduğu ədalət qanunu öz səlahiyyətini itirər və qüvvədən düşər. Buraya çatdıqda məlum olur ki, insanlar üçün bir məhkəmə təyin olunmuşdur. İnsanlar istisnasız olaraq bir nəfər kimi bu məhkəmədə hazır olmalı, öz əməllərinin cəza və ya mükafatını almalıdırlar. Nəmrud, Firon, Yezid kimi şəxsiyyətlərin dünyada törətmədikləri cinayət qalmamışdır.

Heç mümkündürmü ki, günahkarlarla olan haqq-hesab çəkilməsin? Allahın ədalət tərəzisində möminlərlə kafirlər, günahkarlarla günah etməyənlər bərabər ola bilərmi? Quranın dili ilə desək: «Məgər biz, müsəlmanları kafirlərlə eynimi tutacağıq? (Ey kafirlər! Siz dünyada yoxsul möminlərdən mal-dövlətcə üstün olduğunuz kimi, axirətdə də onlardan üstün olacağınızı iddia edirsiniz?) Sizə nə olub, necə mühakimə yürüdürsünüz?» «(Nun, ۳۵,۳۶). Yaxud başqa bir ayədə oxuyuruq: «Yoxsa, biz Allahdan .(qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik?» (Sad, ۲۸

Düzdür, bəzən zalım və günahkarlar öz əməllərinin cəzasını çəkir, vicdan məhkəməsi öz mühakiməsini yürüdür, başqalarına quyu qazanlar özləri quyuya düşürlər. Lakin bunlar ümumi deyil. Yəni, bütün zalımlar elə bu dünyadaca öz cəzalarını çəkmirlər, yaxud başqalarına quyu qazanların hamısı özləriquyuya düşmürlər. Çox zalım, günahkar və pis insanlar var ki, bu dünyada heç bir dəfə də əziyyət çəkmirlər. Bu cür insanları cəzalandırmaq və bütün insanların əməllərinə baxmaq üçün ədalətli bir məhkəmə lazımdır. O məhkəmədə iynə ucu qədər əməl də yoxlanılmalı, cəza və ya mükafatını almalıdır. Əks təqdirdə, ədalət tam şəkildə təmin olunmaz. Buna əsasən Allahın varlığını və onun ədalətini qəbul etməklə ölümdən sonrakı həyatı, məadı qəbul etmək bərabərdir. (Yəni, bir nəfər Allahı, onun ədalətini qəbul edirsə, qiyaməti də qəbul etməlidir. Əgər qiyamət və məadı qəbul etmirsə, Allah və onun ədalətini də .qəbul etmir.) Bu iki şey heç vaxt bir-birindən ayrılmaz

### Fikirləşin və cavab verin

?Yer və göylər ədalət əsasında qurulmuşdur» nə deməkdir» .۱

?Nəyə görə Allah insanı azad buraxmışdır.۲

Əgər Allah azadlıqlarından pis yollarda istifadə edən insanları acınacaqlı əzablara.۳ ?düçar etsəydi, nə olardı

Nə üçün vicdan məhkəməsivə əməllərin cəzasına çatması insanın qiyamət.۴ ?məhkəməsinə olan ehtiyacını ödəyə bilmir

?Allahın ədaləti ilə məad arasında nə əlaqə var .۵

## VI DƏRS

### Qiyaməti bu dünyada dəfələrlə görmüşük

Quran ayələrindən asanlıqla məlum olur ki, bütpərəstlər və digər kafirlər təkcə peyğəmbərin dövründə yox, eləcə də başqa zamanlarda məad- öldükdən sonra dirilmə məsələsinə təəccüblə yanaşırdılar. Hətta bu məsələni onu irəli sürən şəxsin dəliliyinəsübut gətirərək bir-birlərinə nə deyirdilər: «Sizə siz parça-parça olub dağılandan (çürüyüb torpağa qarışandan) sonra yenidən yaradılacağınızı (diriləcəyinizi) xəbər verən bir adam göstərəkmi?» (Səba, ۷). (Məlumdur ki, bu söz istehza mənasında deyilmişdir). Həqiqətən, o zaman elmin olmaması və düşüncələrin aşağı səviyyədə olması nəticəsində ölümdən sonrakı həyata inam bəsləmək bir növ dəlilik və Allaha töhmət kimi hesab olunurdu. Ölmüş şəxsin yenidən diriləcəyini iddia edən şəxs dəli kimi qələmə verilirdi. Maraqlı burasıdır ki, Quran bu fikirlərə qarşı müxtəlif cavablar vermiş, sübutlar irəli sürmüşdür. Bu sübutlardan hər kəs öz düşüncəsi qədər istifadə edə bilər. Quranın bu cavablarını açıqlamaq üçün geniş bir :kitab yazılmalıdır. Lakin bunların bir hissəsini oxucuların nəzərinə çatdırırıq

Quran bəzən onların qiyaməti, öldükdən sonra dirilməni bu dünyada dəfələrlə.۱ :müşahidə etdiklərini bildirərək onlara cavab verir

Buludları hərəkətə gətirən, küləkləri göndərən Allahdır. Biz o buludları quru (ölü) bir» məmləkətə tərəf qovub onunla öldükdən sonra torpağı diriltdirik. Ölüləri diriltmək də .(belədir.» (Fatir, ۹

Qış fəslində təbiətə nəzər saldıqda hər tərəfdən ölü iyi gəlir. Ağaclarda nə yarpaq olur, nə gül, nə də meyvə. Quru budaqlar hərəkətsiz şəkildə yerlərində donub qalmışlar. Nə bir ağac tumurcuqlayır, nə bir budaq çiçək açır. Dağlarda, meşələrdə heç bir oyanış gözə dəymir. Bahar yetişdikdə isə, hava yavaş-yavaş ılıqlaşır. Bərəkət yağışları yağmağa başlayır. Birdən-birə təbiətdə yenilik əmələ gələrək hər tərəf oyanır. Otlar bitir, ağaclar yarpaq açır, çiçəklər, tumurcuqlar gözə dəyirlər. Quşlar ağaclarda özlərinə yuva qurmağa başlayırlar. Sanki, qiyamət baş verir. Əgər ölümdən sonrakı həyatın mənası olmasaydı, biz bu səhnəni hər il öz gözümüzlə müşahidə etməzdik. Ölümdən sonra dirilmək iddiası dəlilik nişanəsi olsaydı, bu səhnə hər il təkrar olunmazdı. Torpağın, təbiətin ölümdən sonra dirilməsi, yaxud insanın ölümdən sonra ?dirilməsi arasında nə fərq var

Bəzən kafirləri, yaranışlarının əvvəlinə qaytararaq ilk vaxtlarını yadlarına salır. Müşrik.۲ bir ərəb çöldən bir parça çürümüş sümük tapıb belə güman etdi ki, bunun vasitəsi ilə gedib Məhəmmədin, ölülərin diriləcəyi barəsində dediklərini batil edəcək. Peyğəmbərin huzuruna gələrək: «De, görüm, bu cür çürümüş sümükləri kim dirildə bilər»-deyərək fəryad etdi. Peyğəmbər aşağıdakı ayə ilə onun cavabını verdi: «Onları ilk dəfə yoxdan yaradan dirildəcəkdir» (Yasin, ۷۹). İnsanın ilk dəfə yaranması ilə yenidən ?dirilməsi arasında nə fərq var

Bu məsələ digər ayələrdə çox kiçik, lakin mənalı bir ifadə ilə açıqlanmışdır: «(Qiyamət günü insanları) ilk dəfə (yoxdan) yaratdığımız kimi dirildib əvvəlki halına salarıq.» .((Ənbiya, ۱۰۴

Bəzən Allahın yer və göyün yaradılışındakı böyük əzəmətini yada salaraq buyurur:.۳ «Məgər göyləri və yeri yaradan (bir daha) onlar kimisini yaratmağa qadir deyilmi? Əlbəttə qadirdir. (Hərşeyi)yaradan və (hər şeyi) bilən odur! Bir şeyi (yaratmaq) istədiyi zaman

Allahın buyruğu ona ancaq: «Ol!»deməkdir. O da dərhal olar.» (Yasin, ٨١, ٨٢). Buna şəkk-şübhə edənlər fikir və düşüncələri aşağı səviyyədə olan insanlar olmuşlar.

٤. Bəzən də enerjilərin qiyamət və qayıdışını insanların yadına salaraq məad məsələsini onlara xatırladır: «O yaradan ki, sizin üçün yaşıl ağacdan od gətirdi və siz indi həmin oddan istifadə edirsiniz, o, ölüləri diriltməyə qadirdir.» (Yasin, ٨٠). Quranın bu ifadəsinə bir az diqqət yetirdikdə və müasir elmlərdən kömək istədikdə elm bizə anladır ki, ağac parçasını yandırdıqda və həmin budaqdan od əmələ gəldikdə istiliyi də olacaqdır. Bu istilik ağacın neçə illərlə yığıb saxladığı günəşin istilik və enerjisidir. (Bunu da xatırladaq ki,(١) yalnız yaşıl ağaclar günəş hərarətini özündə saxlayıb bir müddətdən sonra xaric edə bilir). Biz belə güman edirdik ki, günəşin enerjisi itib aradan gedir, lakin indi məlum olur ki, həmin enerji yenidən canlanır və yeni libas geyir.

Günəşin istilik və enerjisini ağacın tərkibində neçə illərlə saxlamağa, sonra onu birdən-birə xaricə çıxarmağa qadir olan Allahın ölüləri diriltməyə qüdrəti çatmazdı?

Görün, Quran məad məsələsinə şəkk-şübhə edənlərə necə qəti cavablar vermişdir. Biz bu cavab və sübutların yalnız bir hissəsini qələmə aldıq. Beləliklə də, Quran məadın mütləq baş verəcəyini bildirir.

### Fikirləşin və cavab verin

١. Nəyə görə müşriklər məad məsələsinə təəccüblə yanaşırdılar?

٢. Təbiətdə məad səhnəsini hər il necə müşahidə edirik?

٣. Quran bir sıra ayələrdə ana bətnində keçən dövrü məaddan bir nümunə kimi qeyd etmişdir. Bunu necə əlaqələndirmək olar?

٤. Enerjilərin qiyaməti necə olur?

٥. Nəyə görə Quran (Yasin surəsinin ٨٠-cı ayəsində) «yaşıl ağac» ifadəsindən istifadə etmişdir?

## VII DƏRS

### Məad və yaranışın fəlsəfəsi

İnsanların bir çoxu sual edirlər: Allah bizi nəyə görə yaratmışdır? Bəziləri bir addım da irəli atıb deyirlər ki, ümumiyyətlə, bu böyüklükdə dünyanın yaranışının fəlsəfəsi nədir? Bəlkə, Allahın bəzi çatışmazlıqları var və dünyanı yaratmaqla o çatışmazlıqları aradan qaldırmaq istəyir? Belə olan təqdirdə Allahın ehtiyac məsələsi irəli çıxır. Ehtiyac isə Allahın məqamı ilə uyğun gəlmir. Bu sualın cavabı barədə çox danışmaq olar. Lakin biz .bir neçə cümlə ilə qısa olaraq onu oxucuların nəzərinə çatdırırıq

Bizim (insanların) bu barədə bir səhvimiz var. O da budur ki, biz Allahın sifət və xüsusiyyətlərini özümüzlə müqayisə edirik. İnsan çox məhdud bir varlıqdır. Hər nə iş görürsə, ehtiyaclarını ödəmək və çatışmazlıqlarını aradan qaldırmaq üçün görür. Məsələn, savadsızlığını aradan qaldırmaq üçün dərs oxuyur, maddi imkanını düzəltməkdən ötrü işləyib maaş alır və s. Ancaq heç bir çatışmazlığı olmayan və hər cəhətdən kamil olan Allah barədə belə mühakimə etmək düzgün deyil. O, dünyanı özü faydalansın deyə yaratmayıb. Əksinə, onun dünyanı yaratmaqda məqsədi yaradılmışlara fayda verməkdir. Allah həddən artıq parlaq və sonu olmayan bir günəşdir. O, öz nuruna heç bir ehtiyacı olmadan nur saçır və o nurdan bütün varlıqlar bəhrələnir. Ümumiyyətlə, Allah məxluqatı təkamülə yetirmək üçün onlara kömək etməyi lazım bilir. İnsanların yoxdan yaranmasının özü bir növ təkamülə tərəf atılmış addımdır. Bundan əlavə, bəşər üçün peyğəmbərlər, səmavi kitablar göndərmək də təkamülə yetişməkdə böyük rol oynayır. Həzrət Əli(ə)-ın dili ilə desək, dünya bir məktəb, insanlar isə bu məktəbin şagirdləridir. Bu dünya bir əkin sahəsi, insanlar isə bu sahədə məşğul olan əkinçilərdir. Bu dünya böyük bir ticarət mərkəzi, insanlar isə orada alver edən tacirlərdir. Bir halda ki, ətrafımıza diqqətlə nəzər salarkən hər şeyin bir məqsəd üçün



---

Bu barədə ətraflı məlumatı «Yasin surəsinin tərcümə və təfsiri kitabından oxuya [۶] -۱ .bilərsiniz

yaradıldığını görə bilirik, o halda bu dünyanın yaranışını necə qayəsiz hesab edə bilərik? Məsələn, insanın bədənində hər nə varsa, hamısı bir məqsəd əsasındadır. Hətta ayağın altındakı çökəklik və kipriklər də. Necə ola bilər, bədən üzvlərinin ayrı-?ayrılıqda hər birinin bir məqsədi olsun, lakin insanın bütövlükdə bir məqsədi olmasın

Bədənimizdən xaricdə da vəziyyət eyni ilə bu cürdür. Təbiətdəki quruluşların hər birinin öz qayəsi vardır. Günəşin saçmasının, yağışın yağmasının, havanın müəyyən bir ?şəkildə keçməsinin hərəsinin özünə məxsus bir məqsədi yoxdurmu

Həqiqət budur ki, bu dünyanın batinində böyük bir tablo asılmışdır. Bəzən həqiqət o qədər aydın olur ki, insan ilk baxışda onu görə bilmir. Ancaq bir az diqqət yetirdikdən sonra hər şey öz qaydasına düşür. Bu tablonun üzərində dünyanın, bəşəriyyətin (yaranmasının əsas hədəfi, «tərbiyə» və «təkamül» yazılmışdır.(۱)

İndi ki yaradılışımızın bir məqsədi olduğunu bildik, görək, bu məqsəd nədən ibarətdir? Bu dünya onda olan saysız-hesabsız müşkülləri ilə birgə insan yaranışı üçün məqsəd ola bilərmi? Məsələn, bir nəfər altmış il yaşayır. Hər gün səhər işə gedir, axşam olduqda yorğunhalda evinə qayıdır. İşinin müqabilində müəyyən miqdarda maaş alır, həmin maaşla da ailəsinin təlabatını ödəyir. Bu proqram ömrünün axırınadək davam edir. Ömrü sona çatdıqda dünya ilə vidalaşıb axirət mənzilinə yollanır. Fikirləşin, görün, bu yaşayış insan yaranışı üçün hədəf ola bilərmi? Yəni, insanın yaranışında məqsəd ?yalnız yuxarıda deyilən proqramları təkrarlamaqdırmı

Əgər bir mühəndis açıq səhrada böyük bir bina tikibonun inşasına illərlə vaxt sərf etsə də və binanı tikib qurtardıqdan sonra ondan soruşsalar ki, bu binanı nə üçün tikmisən, o da cavab versə ki, binanı tikməkdə məqsədim buradan keçənlərin onun kölgəsində bir az dincəlməsidir, bu cavabdan təəccüblənmərikmi?Yoldan keçən bir şəxsin bir saat .dincəlməsi üçün bu qədər əzab-əziyyətə dəyməz

Məad və ölümdən sonrakı həyatı qəbul etməyənlərin, bu dünyanı puç və mənasız bilmələrinin səbəbi də məhz budur. «Bu dünyanın yaşayışı məqsədsizdir» kimi ifadələr materialistlərin sözlərində tez-tezgözə çarpır. Hətta onların bəziləri bu həyatdan və eyni proqramın illərlə təkrar olmasından yaxa qurtarmaq üçün intihara əl atırlar. Lakin bu dünyaya məna verən onu başqa bir dünya üçün müqqədimə və hazırlıq bilməkdir.

Bu dünyadan sonra əbədi həyat sürmək üçün buradakı çətinliklərlə mübarizə aparırıq. Yaxşı olardı ki, ötən dərslərdə çəkdiyimiz misalı bir daha xatırladaq: əgər ana bətnində olan körpənin tam ağlı, düşüncəsi olsaydı və ona desəydilər, buradan (ana bətnindən) başqa bir yoxdur, körpə dərhal etiraz edib deyəcəkdi: «Onda mənim bu zindanda qalmağımın nə mənası var? Nəyə görə burada qanın, suyun içərisində qalıb həlak olmayıb? Allah məni buna görəmi yaratmışdır? Bunun nə mənası var?». Ancaq əgər körpəyə desələr ki, bura geniş bir dünyaya qədəm basmaq üçün keçid mərhələsidir və burada bir müddət qaldıqdan sonra açıq həyata qayıdacaqsan, onda körpə razı qalıb deyəcək: «Bu təqdirdə burada qalmağıma dəyər. Çünki bura hazırlıqdır və bir neçə aydan sonra buradan xilas olacağam.» Qurani- Kərim bu barədə belə buyurur: «And olsun ki, siz ilk yaradılışı (dünyaya necə gəldiyinizi) bilirsiniz. Elə isə (sizi yenidən .(diriltməyə qadir olduğumuz barədə) heç düşünmürsünüz?» (Vaqiəh, ۶۲

Bir sözlə, bu dünyanın özü bildirir ki, ondan sonra başqa bir dünya var. Əks təqdirdə bu dünya puç, hədəfsiz və mənasız olar. Yaxşı olar ki, bunu Quranın öz dilindən eşidəsiniz: «Yoxsa, sizi əbəs yerə yaratdığımızı və (qiyamət günü dirilib haqq-hesab üçün) .(hüzurumuza qaytarılmayacağınızı güman edirsiniz?» (Muminun, ۱۱۵

Ayə bildirir ki, əgər məad (Allahın hüzuruna qayıdış) olmasa, insan yaranışı puç və .mənasız olardı



---

.Nəhcül bəlağə-Qısa sözlər bölməsi[۷] -۱

.Belə nəticəyə gəlirik ki, bu dünyadan sonra mütləq başqa bir dünya olmalıdır

### Fikirləşin və cavab verin

Nəyə görə Allahın sifət və xüsusiyyətlərini insanların xüsusiyyətləri ilə müqayisə.١ ?etmək olmaz

?Bizim yaranışımızda məqsəd nədir.٢

?Bu dünyanın yaşayışı insan yaranışının hədəfi ola bilərmi.٣

?Ana bətnindəki dövr ilə bu dünyanı müqayisə etdikdə nə öyrənirik.۴

?Quran bu dünyanın yaranışından axirətin mövcudluğuna necə sübut gətirir.۵

## VIII DƏRS

### Ruhun qalması qiyamət nişanəsidir

İnsanın nə vaxtdan ruh haqqında maraqlandığını hələ heç kim bilmir. Onu demək olar ki, insan yaranışının ilk günlərindən özü ilə digər varlıqlar arasında fərq hiss edir. O bilir ki, onunla daşın, taxtanın, hətta heyvanın fərqi var. İnsan yuxu və ölüm vəziyyətini görmüşdür. O, hiss edir ki, yuxu və ölüm zamanı cisim və maddəsində heç bir dəyişiklik olmadan bəzi dəyişikliklər əmələ gəlir. Buradan başa düşmüşdür ki, onun ixtiyarında .(bu cisimdən başqa bir gövhər də vardır. (Bu gövhər də yalnız onun ruhudur

İnsan heyvanlarla özü arasında fərq hiss edir və görür ki, o, heyvanlardan fərqli olaraq .öz iradəsində azadır. Heyvanlar isə iradələrində məcburdurlar

İnsanın ruha qarşı marağının artmasında yuxu səhnələrinin böyük rolu var. Bədənin bir tərəfdə düşüb qaldığı halda başqa bir qüvvənin yuxu görməsi insanı belə bir .nəticəyə gətirib çıxarır ki, onun bədənində «ruh» adlı bir qüvvə vardır

Filosoflar fəlsəfə elmini ortaya çıxardığı zaman «ruh» özünə digər fəlsəfi məsələlərin yanında yer eləmiş və fəlsəfənin mühüm bəhslərindən birinə çevrilmişdir. Sonralar bütün filosoflar ruh haqqında nəzəriyyələr irəli sürmüşlər. Bu barədə söz həddən artıq çoxdur, lakin ən əsasıaşağıdakı sualın cavabını bilməkdir: ruh maddidir, yoxsa qeyri-

maddi? Başqa sözlə, ruh müstəqildir, yoxsa beyin və sinir sistemlərinin fiziki və kimyəvi xüsusiyyətlərindəndir? Materialist filosofların bəziləri israr edirlər ki, ruh maddidir və beyin sisteminin xüsusiyyətlərindəndir. İnsan öldükdə ruh da sıradan çıxır. Necə ki, işləyən bir saatı sındırsaq onun işləməyi də dayanacaq. Bu firqəyə qarşılıq olaraq isə İslam filosofları və bir sıra materialist filosoflar deyirlər ki, insan öldükdə ruh ölmür və öz həyatını davam etdirir. Bunu sübut etmək üçün bir sıra dəlillər gətirmişlər. İndi biz .həmin dəlillərin bir neçəsini sadə ifadələrlə əziz oxucuların nəzərinə çatdırırıq

### Böyük bir dünyanı kiçik bir mühitdə yerləşdirmək olmaz.١

Təsəvvür edin, böyük bir dənizin kənarında əyləşmisiniz. Dənizin kənarında başı göylərə ucalmış dağlar da vardır. Ləpələ gəlib sahildəki qayalara çırpılıb qəzəbli halda geri qayıdırlar. Dağın üstündəki səma gecə olduqda örtüyünü dağ və dənizin üstünə salıb öz əzəmətini göstərir. Bu səhnəni müşahidə etdikdən sonra bir anlığa gözümüzü bağlayırıq. Müşahidə etdiyimiz mənzərə bütün əzəməti ilə birgə zehnimizdə canlanır. Sanki, gözümüz açıqdır deyə, göyə baxırıq. Zehnimizdə canlanmış bu səhnə şübhəsiz ki, beynimizə sığışa bilməz və onun üçün böyük bir yer lazımdır. Əks təqdirdə, böyük bir səhnə kiçik bir nöqtə kimi zehnimizdə canlanmalıdır. Buradan məlum olur ki, insanda maddi beyindən başqa bir cövhər də vardır və bu cövhər hər hansı bir mənzərəni olduğu kimi, eyni həcmdə özündə cilvələndirir. Şübhəsiz ki, bu cövhər .maddi deyil. Çünki maddi aləmdə bu vaxta qədər belə bir şey görülməmişdir

### Ruhun xarici özündə əks etdirmə xasiyyəti.٢

İnsan bədənində bir sıra fiziki və kimyəvi xüsusiyyətlər vardır. Məsələn, ürək və mədənin hərəkətləri fiziki, yemək tikələrinin üzərinə daman öd damcıları isə kimyəvi xüsusiyyətlərə malikdirlər. Bu cür xüsusiyyətlər insan bədənində çoxdur. Əgər ruh, fikir və

düşüncə və maddidirsə, bəs, onda nə üçün onlarla başqa cismani xüsusiyyətlər arasında böyük fərq var? Ruh, düşüncə və fikir insanı xarici mühitlə əlaqədə saxlayır və bizdən kənarda baş verən hadisələrdən bizi xəbərdar edir. Lakin bədənin fiziki və kimyəvi xüsusiyyətləri belə deyildir. Başqa sözlə, biz asanlıqla hiss edirik ki, vücudumuzdan kənardakı aləmlə əlaqədəyik. Onda baş verən hadisələrdən xəbərdarıq. Məgər bizdən kənardakı aləm bizim içimizəmi girir və biz bu yollamı ondan xəbərdar oluruq? Yəqin ki, «xeyr» cavab verəcəksiniz. Bəs, bunun sirri nədir? Bizdən xaricdəki aləmin surəti bizimzehnimizdə canlanır və biz də ruhun «xarici özündə əks etdirmə» xüsusiyyəti vasitəsi ilə xariclə əlaqədə oluruq. Bu xüsusiyyətə bədənin kimyəvi və fiziki xüsusiyyət və qüvvələrinin heç biri malik deyil (Diqqət edin.) Yenə başqa sözlə desək, xarici varlıqlardan xəbərdar olmaq üçün onları əhatə etmək lazımdır. Bu əhatə üçün beyin sistemidigər bədən üzvləri kimi xaricdən yalnız təsir ala .bilər

İnsanın bədənindəki xüsusiyyətlərin bu fərqindən məlum olur ki, bədənin fiziki və kimyəvi xüsusiyyətlərdən əlavə başqa bir xüsusiyyəti də vardır. Bu xüsusiyyət insanı xariclə əlaqədə saxlayır. Bu xüsusiyyət ruhdan başqa heç bir şey deyildir. Elə bir ruh ki, .maddi aləmdən kənardır

### Ruhun müstəqilliyinin praktiki sübutları.٣

Xoşbəxtlikdən, bu gün alimlər ruhun müstəqil və maddi aləmindən kənar olduğunu müxtəlif elmi yollarla sübut etmiş və ruhun maddi aləmindən kənar olmadığını iddia .edənlərə qəti cavab vermişlər. Bu sübutları aşağıdakı tərtibdə qeyd edirik

A)Bu sübutlardan biri insanı gipnoz vasitəsilə yatırtmaqdır. Bunu bir çoxları görmüşdür. .Ancaq bu işdən xəbərdar olmayanları bu barədə qısaca məlumatla tanış edirik

Bəzi insanlar müxtəlif elmi yollarla başqalarını yatırda bilirlər. Təlqin və diqqətin cəlb edilməsi yolu ilə insan yuxuya qərq edilir. Lakin bu yuxu başqa yuxulardan fərqlənir. Bu yuxuda yatırdan şəxs yatan şəxslə söhbət edə bilir. Gipnoz edən yatmış şəxsin ruhunu həmin vaxt müxtəlif yerlərə göndərə bilir və bəzən ruh yeni məsələlərlə tanışlıq tapır, adi vaxtlar bilmədiyini yatmış halda öyrənə bilir. Hətta həmin halda bilmədiyi və ömründə danışmadığı bir dildə söhbət edir, həddən artıq çətin olan riyazi məsələləri

.həll etməyə çalışır

Bir sıra yalançı və ruhlarla əlaqədən heç bir xəbəri olmayan, lakin camaatı aldadaraq ruhlarla əlaqədə olduqlarını bildirən insanların bu yoldan mənfi istifadə etmələrinə baxmayaraq, bu həqiqəti danmaq olmaz. Yalançı şəxslərin bu yoldan pis niyyətlə istifadə etmələri, bizi bu həqiqəti danmağa məcbur etməməlidir. Təhqiqatçılar belə bir .işin baş verdiyini etiraf edirlər. Deməli, ruhlarla əlaqədə olmaq mümkün bir işdir

Bunlar göstərir ki, ruh müstəqildir və insan öldükdən sonra o, itib batmır. Əksinə, ruh .məad və ölümdən sonrakı həyata tərəf atılmış bir addımdır

V).Ruhun müstəqil olması haqqındakı praktiki və təcrübi sübutlardan biri də yatan zamangördüyümüz yuxulardır. Yatdığımız zaman gördüyümüz yuxular, bəzi gizli və agah olmadığımız işlərin yuxuda üstünün açılması, gələcək hadisələri yuxuda görmə .(yuxunun çin çıxması) və bu kimi işlər sübut edir ki, ruh müstəqildir

Şübhəsiz ki, yuxunun çin çıxdığını siz də təcrübə görmüsünüz. Yuxuda gördüyünüz bir iş müəyyən müddət sonra (tez və ya gec) eynilə gördüyünüz kimi həyata keçir. Buradan məlum olur ki, ruh maddi deyil və insan beyninin fiziki və kimyəvi xüsusiyyətlərindən

kənardadır. Ruh təbiətin fövqündə olan və öldükdən sonra itib batmayan bir varlıqdır. .Bu mövzu məad və ölümdən sonrakı aləmi isbat etmək üçün bir yoldur

### Fikirləşin və cavab verin

Ruh haqqında İslam filosofları ilə bir sıra materialist filosofların nəzəriyyələri.۱ ?arasında nə fərq var

Ruhun müstəqilliyi haqqında gətirilmiş sübutlardan biri olan böyüyün kiçiyə uyğun.۲ gəlməməsindən (böyük bir dünyanın kiçik bir mühitdə yerləşə bilməməsindən) nə .anlaşılır

?Gipnoz haqqında nə bilirsiniz.۳

?Ruhlarla əlaqədə olmaq dedikdə nə nəzərdə tutulur.۴

?Yuxunun çin çıxması ruhun müstəqil və qeyri-maddi olduğuna sübut ola bilərmi.۵

## IX dərs

### Cismani və ruhani məad

Məad haqqında verilən mühüm suallardan biri də məadın təkcə ruhani, yoxsa, həm ruhani, həm də cismani olub-olmamasıdır. Yəni, qiyamətdə insanın təkcə ruhu qayıdacaq, yoxsa ruhla bərabər cismi də qayıdacaq? Bu fərqlə ki, cisim daha da .kamilləşəcək və öz əbədi həyatını davam etdirəcək

Keçmiş filosofların bir qismi məadın təkcə ruha aid olduğunu iddia etmiş və demişlər ki, cisim yalnız bu dünyada insanladır. İnsan öldükdən sonra artıq onun cismə ehtiyacı olmur, cismdən ayrılaraq ruhlar aləminə tələsir. Ancaq İslamın böyük alimlərinin, eləcə də, filosofların bir qisminin əqidəsinə görə, məad hər ikisinə, həm ruha, həm də cismə aiddir. Düzdür, öldükdən sonra bədən çürüyür və torpağa qarışır, torpaq da parçalanıb dağılır. Lakin hər şeyi bilən və hər işə qadir olan Allah qiyamətdə onların hamısını bir yerə toplayacaq, onların hamısına yeni həyat libası geyindirəcək və hər bədən öz sahibini tapacaq. Bu, «cismani məad» adlanır. Ruhun qayıdacağına heç kimin şübhəsi olmadığı üçün, heç kim ondan bəhs etmir və yalnız cismani məad haqqında

.müzakirələr irəli sürülür

Quranda məad haqqında olan ayələr də (bu ayələr həddən artıq çoxdur) cismani .məada işarə edir

### Quranın cismani məada dair sübutları

Ötən dərslərdə bir ərəbin bir parça sümüyü gətirib peyğəmbərə göstərərək «kim bunları dirildə bilər?» deyə istehza etdiyini və peyğəmbərin Allahın əmri ilə ona «onları ilk dəfə yoxdan yaradan, yeri-göyü xəlq edən və sizin üçün yaşıl ağacdan od əmələ gətirən Allah bunları dirildəcəkdir» cavabını oxuduq. Bu haqda «Yasin» surəsinin son beş ayəsində danışılır. (Bu ayələr məadın cismani olacağına aydın bir sübutdur.) Başqa bir ayədə oxuyuruq: «Qiyamət günü qəbirlərdən qalxacaqsınız.» (Yasin, ٥١; Qəmər, ٧). Bildiyimiz kimi, qəbirlər ruhun yox, çürümüş bədənin yeridir (Deməli, məad cismani olacaqdır). Ümumiyyətlə, məadı inkar edənlərin١ bütün təəccübləri bu idi: «Məgər biz torpağa qarışıb yox olandan sonra yenidənmi yaradılacağıq?» (Səcdə, ١٠). Allah isə onlara cavab verərək buyurur: «Məgər onlar Allahın məxluqatı əvvəlcə (yoxdan) necə yaratdığını, sonra da onu (qiyamət günü) yenidən dirildəcəyini bilmirlərmi? Həqiqətən, bu, Allah üçün asandır.» (Ənkəbut, ١٩). Başqa bir ayədə oxuyuruq: «Cahil bir ərəb deyirdi: «O, sizə ölüb torpaq və sür-sümük olduqdan sonra (qəbirlərinizdən dirilib) .(çıxacağımızımı vəd edir?» (Muminun, ٣٥

Quranın bu və bu kimi digər ayələrindən məlum olur ki, İslam peyğəmbəri hara çatırdısa, cismani məadhaqqınnda söhbət edirdi. Müşriklər də məhz bu məsələyə təəccüb edirdilər. Yuxarıda qeyd olunan ayələrdə gördük ki, Allah cismani məada aid .məsələləri bəyan etmiş və ona ilk yaranışı və öz qüdrətini sübut gətirmişdir

Buna görə də, Qurandan az da olsa xəbəri olduğu bir nəfər müsəlmanın halda cismani məadı inkar etməsi mümkün deyil. Quran baxımından cismani məadı inkar etmək əsl .məadı (həm ruhani, həm də cismani) inkar etməyə bərabərdir

### Əqli sübutlar

Yuxarıda qeyd etdiyimiz sübutlardan əlavə, ağıl, düşüncə də deyir ki, ruh və bədən bir-birindən ayrılmaz iki varlıqdırlar. Hər ikisinin müstəqil olmasına baxmayaraq, eyni zamanda bir-biri ilə əlaqələri vardır. Onlar ikisi bir yerdə tərbiyə alır, birgə təkamülə doğru irəlləyirlər. Şübhəsiz ki, bu iki həqiqətin əbədi həyat sürmək üçün də bir-birinə .ehtiyacı vardır

Ruhla bədənin bir müddət Bərzəx aləmində bir-birindən ayrı qalmalarına baxmayaraq bu ayrılıq həmişəlik ola bilməz. Necə ki, ruhsuz bədən naqisdir, eləcə də bədənsiz ruh naqisdir. Ruh əmr edən, bədən isə icraçıdır. Heç bir əmr edən icraçıdan ayrı olmaz. Qiyamətdə ruh kamil bir şəkildə gələcəyi üçün, lazımdır ki, bədən, cisim də ona uyğun olaraq təkmiiləşsin. Elə belə də olacaqdır. Yəni, qiyamətdə insan bədəni dünyadakı bütün eyib, nöqsan və çatışmazlıqlardan uzaq olacaq. Bir sözlə, ruh və cisim (bədən) ikisi birgə kamildirlər. Məad bunların ikisindən yalnız birinə aid ola bilməz. Başqa sözlə, ruh və cismin yaranma və bu iki həqiqətin bir-biri ilə əlaqə yaratması tarixini mütaliə etməklə məlum olur ki, məad bunların ikisinə də aiddir. Digər tərəfdən, dünyaya hökmranlıq edən ədalət qanunu deyir ki, məad həm ruha, həm də bədənə aid olmalıdır. Çünki insan bir günah, yaxud savab iş gördükdə bu işə onun həm ruhu, həm də bədəni şərikdir. Buna görə də, həmin günahın, yaxud savabın cəzasına və ya mükafatına (əcrinə) həm ruh həm də bədən çatmalıdır. Əks təqdirdə (məadın ikisindən .birinə aid olmadığı təqdirdə), ədalət qanunu pozulmuş olur

### Cismani məad haqqında suallar

Alimlər cismani məad haqqında bir sıra suallarirəli sürmüşlər. (Əlbəttə, bu suallar heç də cavabsız qalmamışdır.) İndiisə biz mövzumuzutəkmilləşdirmək üçün həmin .sualların əsaslarını oxucuların nəzərinə çatdırırıq

Təbiətşünasların tədqiqat və araşdırmaları nəticəsində məlum olub ki, insanın.(١ bədəni ömründə birneçə dəfə dəyişir. (Məsələn, əlli yaşındakı insanın bədəni onun otuz yaşındakı bədəni deyildir. Zaman ötdükcə onun bədəni dəyişmiş, əlli yaşına çatdıqda otuz yaşındakı bədənindən artıq heç bir şey qalmamışdır.) Bu, (bədənin dəyişməsi) təxminən, yeddi ildən artıq bir baş verir. Burada yaranan sual bu

bədənlərdənqiyamətdə hansı bədənin qayıdacağı sualıdır. Cavabında isə deyirik: Qiyamətdə qayıdan sonuncu bədən olacaqdır. Yuxarıda qeyd olunmuş ayələrdə də oxuduq ki, Allah insanların çürümüş sümüklərinə yeni həyat libası geyindirəcək. Buradan da anlaşılır ki, qiyamətdə sonuncu bədən qayıdacaq. Həmçinin, bir çox ayələrdə gəlmiş «qəbirlərinizdən qalxacaqsınız» kimi ifadələrdən də sonuncu bədənin .qayıdacağı başa düşülür

Maraqlı budur ki, sonuncu bədən ömür boyu dəyişilən bədənlərin bütün xüsusiyyətlərini əhatə edəcəkdir. Başqa sözlə, bədənlərin hamısı dəyişilən zaman bütün xüsusiyyətlərini sonrakı bədənə təhvil verirlər. Buna görə, sonuncu bədən bütün bədənlərin varisi olur və onların xüsusiyyətlərini əldə edir. Deməli, ədalət qanuna əsasən, sonuncu bədən günahların cəzasını çəkə, eləcə də savabların əcrinə yetişə .bilər

Bəziləri deyirlər ki, biz ölüb torpağa qarışdıqdan sonra bədənimizin hissəcikləri ot və.(٢ ya meyvələrin tərkibinə daxil olur. (Yəni, dəfn olunduğumuz yerdə ağac əkilir, həmin ağac isə bizim dəfn olunduğumuz torpaqdan qidalanır, nəticədə meyvə əmələ gəlir. Bu meyvənin tərkibində bizim bədənimizin hissəciklərindən də ola bilər.) Həmin meyvəni başqa bir şəxs yeyərsə, onda necə olacaq? Qiyamətdə meyvənin tərkibindəki bədən hissəcikləri kiminlə olacaqdır? Birinci şəxslə, yoxsa meyvəni yeyən ikinci şəxslə? Cavabda deyirik: Ölüb torpağa qarışmış və sonradan ot, ağac və ya meyvənin tərkibinə daxil olmuş bədən hissəcikləri şübhəsiz ki, öz sahibinə qayıdacaq. (Ötən ayələrdən də bunu istifadə etmək olar.) Yeganə çətinlik odur ki, onda, həmin meyvədən yemiş ikinci şəxsin bədəni naqis olacaq. Bunun da cavabında deyirik ki, xeyr, ikinci şəxsin bədəni heç də naqis olmayacaq və yalnız bir az kiçiləcəkdir. Çünki birinci şəxsin bədəninin tərkibindəki hissəciyi

ikinci şəxsin bütün bədəninə yayılmışdır və həmin hissəcik ondan ayrılanda ikinci şəxsin bədəni o hissəciyin ölçüsü qədər kiçiləcək. Deməli, nə birinci bədən, nə də ikinci bədən sıradan çıxmır. Sadəcə olaraq, ikinci bədən bir az kiçiləcəkdir. Bu da heç bir çətinlik doğurmur. Çünki bildiyimiz kimi, Allah qiyamətdə insanların bədənlərini təkmilləşdirib onlarda olan bütün çatışmazlıqlarıaradan qaldıracaq. Deməli, ikinci şəxsin bədəninin naqisliyi də həll olunur. Beləliklə də, heç bir müşkül qalmır və hər şey .qaydasına düşür

## X dərs

### Cənnət, Cəhənnəm və əməllərin hazır olması

Bir çoxları soruşurlar ki, ölümdən sonrakı həyat da bu dünya kimidir, yoxsa bu dünya ilə fərqi var? Cavabda deyilir: Əldə olan əsaslardan məlum olur ki, o dünya ilə bu dünya arasında həddən artıq fərq var. Bu dünyada qiyamət haqqındakı məlumatımız uzaqdan görünən qaraltı kimidir. Yaxşı olar ki, yenə də uşağın ana bətnindəki dövrünü misal gətirək. Ana bətni ilə bu dünya arasında fərq var. Bəlkə ikincinin fərqi birincidən də çoxdur. Əgər ana bətnindəki körpənin, ağılı, düşüncəsi olsaydı və bu dünya barədə fikirləşib onda olanları təsəvvürünə gətirmək istəsəydi, şübhəsiz ki, buna imkan və qüdrəti çatmazdı. Gördüyü yer yalnız ana bətni olan körpə üçün dünyanı, günəşi, ulduzları təsəvvür etmək, əlbəttə, mümkün deyil. Axirətlə bu dünyanın fərqi də bu qədər, hətta bundan da artıqdır. Buna görə də,biz Cənnət nemətlərini və eləcə də Cəhənnəm əzablarını olduğu kimi təsəvvür edə bilmərik. Gəlin, bu yerdə axirət aləmini təsəvvür etmiş bir hədisə müraciət edək: «Cənnətdə elə nemətlər var ki, onları nə bir göz görmüş, bu barədə nə bir qulaq eşitmiş, nə də onlar heç kimin ağlına belə gəlməmişdir.» Quran da bu barədə öz sözünü demişdir: «Etdikləri əməllərin mükafatı olaraq (Allah dərgahında) möminlər üçün göz oxşayan (onları sevindirəcək) nə cür .(nemətlər gizlənib saxlandığını heç kəs bilməz.» (Səcdə, ١٧

O dünyada olan qayda-qanun da bu dünyadakılardan fərqlənir. Nümunə olaraq bunu demək olar ki, qiyamət məhkəməsindəki şahidlər insanın öz bədən üzvləri, hətta günah, yaxud savab işlətdiyi yer olacaqdır. Quran ayəsini buna sübut gətirmək olar: «Bu gün onların ağızlarını möhürləyərik. Etdikləri əməllər barəsində onların əlləri

Bizimlə danışar, ayaqları isə şəhadət verər.» (Yasin, ۶۵). Başqa bir ayədə deyilir: «Onlar öz dərilərinə«nə üçün əleyhimizə şəhadət verirsiniz?»-deyəcəklər. Dəriləri də belə «.cavab verəcəkdir: Hər şeyi dilə gətirən Allah bizi danışdırdı

Düzdür, axirət aləminin nemətləri, eləcə də əzabları barədə geniş, ətraflı məlumatımız olmasa da, bilirik ki, oranın nemət və əzabları insanın həm cisminə, həm də ruhuna aiddir. Çünki məadın iki cəhəti var: ruhani və cismani cəhət. Buna görə, nemət və əzablar da iki cəhətli olmalıdırlar. Quran, nemətlərin cismə aid olması barədə buyurur: «İman gətirən və yaxşı işlər görən şəxslərə müjdə ver: onlar üçün (ağacları) altından çaylar axan cənnətlər (bağlar) vardır. Onlar üçün orada hər cəhətdən pak olan zövcələr də var. Onlar orada əbədi olaraq yaşayacaqlar.» (Bəqərə, ۲۵). Mənəvi və ruhani olan nemətlər barədə isə deyilir: «Allahdan olan bir razılıqisə (cismə aid olan nemətlərin hamısından) daha böyükdür.» (Tövbə, ۷۲). Bəli, Cənnətdəkilər Allahın onlardan razı qaldığını hiss etdikdə elə xoşhal olacaqlar ki, bunu heç bir nemətlə müqayisə etmək olmaz. Cəhənnəm əhlinin də cismani əzablarından əlavə, Allahın onlardan narazılığı hər əzabdan artıq olacaq. Şübhəsiz ki, bu da onların ruhunu həddən .artıq əziyyətə salacaq

### (Əməllərin təcəssümü (Əməllərin qayıdışı

Maraq doğuran və diqqəti cəlb edən məsələlərdən biri də qiyamətdə insanın gördüyü əməllərin dirilməsi, qayıtmasıdır. Bunu Quranın bir çox ayələrindən görürük. İnsanların mükafatlanması və günahlarının cəzasına çatmasında əməllərin hazır olması böyük rol oynayacaq. Məsələn, bunların bir neçəsini nümunə olaraq göstəririk. Zülm və ədalətsizlik qara bulud şəklində insanlarının başının üzərini alacaq. Hədisdə deyildiyi kimi «Zülm qiyamət günü zülmət şəklində hazır olacaq.» «Həqiqətən, yetimlərin mallarını haqsızlıqla

yeyənlərin yedikləri qarınlarında oda çevriləcək.» (Nisa, ١٠) «(Ya peyğəmbər!) Qiyamət günü mömin kişi və qadınların iman nurunuonların önlərindən və sağ tərəflərindən axıb şölə saçdığını görəcəksən.» (Hədid, ١٢) «Sələm yeyənlər qəbirlərindən ancaq cin vurmuş (dəli) kimi qalxarlar.» (Bəqərə, ٢٧٥) «Allah tərəfindən bəxş olunmuş mal-dövləti sərf etməyə xəsislik edənlər heç də bunu özləri üçün xeyirli hesab etməsinlər. Xeyr, bu, onlar üçün zərərlidir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına (dolanacaqdır. (Belə ki, heç hərəkət etmək iqtidarında olmayacaqlar.)» (Ali-İmran, ١٨٠

.Digər yaxşı və pis əməllər də hərəsi özünə münasib şəkildə aşkar olacaq

Bilirik ki, bu gün elm bizə dünyada heç bir şeyin yox olmadığını sadəcə olaraq öz surətini dəyişdiyini deyir. Maddə və enerji daimadəyişir. Bu iki şeydən xaric olmayan insanın əməlləri bu sübuta əsasən dəyişməsinə baxmayaraq, əbədi olaraq qalır. Quran bu məsələni kiçik, lakin mənalı bir ifadə ilə açıqlayır: «İnsanlar (dünyada) etdikləri bütün əməllərin hazır durduğunu görəcəklər.» (Kəhf, ٤٩). İnsanlar qiyamətdə öz əməllərinin nəticəsini görəcəklər və heç kəsə əməlindən artıq (və ya əskik) zülm edilməyəcək. Necə ki, Quran buyurur: «Rəbin heç kəsə haqsızlıq etməz.» (Kəhf, ٤٩). Başqa bir ayədə əməllərin qiyamətdəki hüzuru barədə deyilir: «O gün (qiyamət günü) insanlar əməllərinin özlərinə göstərilməsi üçün (qəbirlərindən) dəstə-dəstə çıxacaqlar. Kim (dünyada) zərrə qədər yaxşı iş görmüşdürsə, onun xeyrini görəcəkdir (mükafatını alacaqdır). Kim zərrə qədər pis iş görmüşdürsə, onun zərərini görəcəkdir (cəzasını (çəkəcəkdir)» (Zilzal ٦, ٨

Bu ayələrdən məlum olur ki, insanın yaxşı və ya pis olmasından asılı olmayaraq, böyüklü-kiçikli bütün əməlləri qeydə alınır. Qiyamətdə hamısı öz sahiblərinə təqdim olunacaq. Buna görə də, pis əməllərdən uzaq, yaxşə əməllərin isə tərəfdarı olmaq .lazımdır

Təəccüblü budur ki, bu günkü dövrdə texnikanın inkişafı ilə əlaqədər olaraq bu işlərin bir qismini (keçmiş əməlləri qoruyub saxlamağı) elə bu dünyada əks etdirən aparatlar düzəldilmişdir. Alimlərdən biri deyir: «Bu günkü dövrdə iki min bundan qabaqkı Misir dulusçularının səslərini özündə əks etdirən aparatlar düzəlmişdir. Misir muzeylərində iki il bundan qabaq düzəldilmiş kuzələr indi də qorunub saxlanır. Bu kuzələrin

düzəldilməsində xüsusi çarxlardan istifadə olunmuşdur. Çarxların və ustaların səsi kuzələrə düşmüşdür və indi təzəcə kəşf olmuş aparatların köməyi ilə həmin səsləri «.eşitmək olur. İnsan bu səsləri asanlıqla eşidə bilər

Əməllərin hazır oluşunu nəzərə almaqla məad, günahkarların cəzalandırılması və möminlərin mükafatla təltif olunması barədə meydana çıxan suallara cavab vermək .olar

### Fikirləşin və cavab verin

?Qiyamətdə insanın yaşayışı bütün cəhətlərdən bu dünyanın yaşayışı kimi olacaq.١

?Qiyamətin əzab, yaxud mükafatlarını olduğu kimi bu dünyada anlaya bilərikmi.٢

?Cənnət nemətləri, eləcə də Cəhənnəm əzabları təkcə insanın cisminəmi aiddir.٣

Əməllərin mücəssəm olması (hazır olması) dedikdə nə anlaşılır Quran bu məsələyə.۴ ?necə dəlalət edir

Əməllərin mücəssəm olmasına əqidə bağlamaq, məad mövzüsuna aid olan hansı.۵ ?çətinliyi aradan qaldırır

### Kitabın tərcüməsində istifadə olunmuş kitablar

(Quranın tərcüməsi (Professor V.Məmmədəliyev.١

.Möcəmul- mufəhris liəlfazil -Quran.٢

.(Lüğət (ərəb-fars.٣

### Kitabın içindəkilər

səh:۹۲

Təbuk Ərəbistan yarımadasının şimalında yerləşən və o vaxtın Şərqi Roma imperiyası ilə həmsərhəd olan bir məntəqə idi. Musa(ə)-da Tur dağına ۴۰ günlük Allahla görüşə (gedəndə qardaşı Harunuöz canişini təyin etmişdi. Hədis buna işarədir. (Mütərcimdən

.Bəqa həmişə yaşamaq, sağ qalmaq mənasınadır

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

İsfəhan Qaimiyyə kompüter araşdırmalar mərkəzi



Qaimiyyə




Başqa kitabxanaya sahiblənmək üçün gördüyünüz sayt mərkəzinə müraciət etməniz lazımdı:

**www.Ghaemiyeh.com**

www.Ghaemiyeh.net

www.Ghaemiyeh.org

www.Ghaemiyeh.ir

Və sifariş üçün bizimlə əlaqə saxlayın:

**(0098) 0913 2000 109**

